Eldar ismayıl

# ERMƏNİSTAN TÜRKLƏRİNİN 1988-ci il SOYQIRIMI

*Yenidən işlənmiş ikinci nəşri*

Bakı - 2014

*Kitab Akif Musa oğlu Nəbiyevin xeyriyyəçiliyi ilə işıq üzü görüb.*

**Redaktor:** Arif Məmmədli
*Azərbaycan Jurnalistlər Birliyinin üzvü*
**Ədəbi redaktor:** Mənsur
*Azərbaycan Jurnalistlər Birliyinin üzvü*

**Eldar İSMAYIL** ERMƏNİSTAN TÜRKLƏRİNİN 1988-ci il SOYQIRIMI
***Yenidən işlənmiş ikinci nəşri***
**Bakı, "Bəxtiyar-4" İKŞ , 2014. - 253 səh.**

Kitab 1988-ci ildə Ermənistanda yaşayan Azərbaycan türklərinin silah gücünə öz ata-baba yurdlarından çıxarılmasından, erməni faşistləri tərəfindən vəhşicəsinə öldürülən, evləri dağıdılan, var-dövlətləri talan olunan insanların acı taleyindən bəhs edir.

---

# Azərbaycanlıların əzəli torpaqlarından sonuncu – 1988-1989-cu illər deportasiyası

*Tarixdə artıq bir dəfə Azərbaycanın əzəli torpaqlarında erməni dövləti yaradılmışdır, o da bugünkü Ermənistandır. O torpaqlar bizim doğma, ata-baba torpaqlarımızdır. İrəvan xanlığı, Zəngəzur mahalı - bütün o adlar Azərbaycan toponimləridir.*

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının prezidenti**

Əziz dostum, tanınmış şair-publisist, vaxtilə Azərbaycan Qaçqınlar Cəmiyyətində iş yoldaşım olmuş Eldar İsmayıl bu kitabına ön söz yazmaq üçün mənə göndərəndən sonra onu diqqətlə oxudum, həmin 1988-1999-cu illərin ağrılı-acılı günlərini sanki bir daha yaşadım. Gözlərimin önündə cərəyan edən hadisələri yenidən xəyalımda canlandırdım. Dədə-baba ocaqlarımızın bir neçə ayın içərisində necə boşaldığını göz önünə gətirdim. Ermənilərin əvvəllər bircə dəfə olsun görmədikləri, adını belə eşitmədikləri kəndlərimizə necə doluşduqlarını xatırladım. O günlərə yenidən qayıdıb yaddaşımı bir daha vərəqlədim, əlyazmalarımı, şəxsi arxivimi bir daha saf-çürük etdim. Xalqımızın başına gətirilən o Böyük Faciənin səbəblərini təzədən araşdırdım, yığcam bir yazıda həmin faciələrin miqyasını göstərmək istədim, cəfakeş eloğlum Eldar müəllimin sözünə qüvvət verməyə çalışdım.

* * *

İndi Ermənistan adlanan dövlətin ərazisində yaşayan azərbaycanlıların əzəli torpaqlarından sonuncu deportasiyasından düz 25 il ötür. 1988-ci ilin fevralından başlanan bu proses

həmin ilin noyabr-dekabr aylarında kulminasiya nöqtəsinə çatdı. Dekabrın 7-də baş verən Spitak (Hamamlı) zəlzələsindən sonra bir müddət ermənilərin başları dağıntıların nəticələrini aradan qaldırmağa qarışsa da, proses artıq geriyədönməz xarakter almışdı. Deportasiya aksiyası 1989-cu ilin yayında başa çatdırılmış hesab olundu.

Rəhbərliyində kimlərin olmasından asılı olmayaraq, Sovet Ermənistanının Azərbaycanın Dağlıq Qarabağ və Naxçıvan ərazilərinə iddiası və bu iddiaların fonunda Ermənistandan azərbaycanlıların sıxışdırılıb çıxarılması hər zaman gündəlikdə olmuşdur. Sadəcə olaraq, situasiyadan asılı bu iddialar gah aktuallaşmış, gah da arxa plana çəkilmişdir. SSRİ Konstitusiyasında müttəfiq respublikaların ərazi bütövlüyünün toxunulmazlığı prinsipinin təsbit edilməsi ermənilərin qarşısında bir maneə olsa da, onlar heç zaman bu iddiadan əl çəkməmişlər. Ermənistan rəhbərləri bəzən öz imzaları ilə, bəzən də Dağlıq Qarabağ Muxtar Vilayətinin erməni ziyalılarının imzaları ilə SSRİ rəhbərliyinə vaxtaşırı müraciətlər göndərirdilər. Rəsmi İrəvan və DQMV erməniləri 1945, 1964, 1975, 1977 və 1987-ci illərdə Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi haqqında Moskvaya müraciətlər etmişdilər.

İkinci Dünya müharibəsinin sonunda SSRİ-nin Türkiyənin Qars və Ərdahan vilayətlərinə ərazi iddiası irəli sürmüşdü. SSRİ-yə birləşdirildikdən sonra Qars vilayətində ermənilərin, Ərdahan vilayətində isə gürcülərin məskunlaşdırılması nəzərdə tutulmuşdu. Bu fürsətdən istifadə edən Ermənistan rəhbərləri xarici ölkələrdən 100 minə yaxın ermənini köçürüb gətirtdi ki, onları sonradan Qars vilayətində yerləşdirsin. Əvəzində, 100 min azərbaycanlının Ermənistandan Azərbaycanın Kür-Araz ovalığına "könüllü köçürülməsi" haqqında SSRİ Nazirlər Sovetinin 23 dekabr 1947-ci il qərarının qəbul edilməsinə və 1948-1953-cü illərdə təqribən o qədər azərbaycanlının tarix-etnik torpaqlarından deportasiyasına

nail oldular.

Ermənistanda antitürk, antiazərbaycan təbliğatı 1960-cı illərin ortalarında var gücü ilə yenidən işə salındı. Moskvanın razılığı ilə 1965-cü ildə Ermənistanda uydurma “Erməni soyqırımı”nın 50 illiyi mərasimi keçirildi. Həmin dövrdə İrəvanda Ermənistanı Yenidənbirləşdirmə Komitəsi yaradılmışdı. Bu komitəyə gizli surətdə Ermənistanın o zamankı rəhbərləri və ziyalıları başçılıq edirdilər. Komitə “Türkiyə Ermənistanı”nı, Naxçıvan və Dağlıq Qarabağı Ermənistana birləşdirməyi qarşısına məqsəd qoymuşdu. Həmin dövrdə Ermənistanda aparılan milli ayrıseçkilik və diskriminasiya siyasəti nəticəsində İrəvan və onun ətraf rayonlarından yüzlərlə ailə Azərbaycana köçməyə məcbur olmuşdu.

Ermənistanda yaşayan azərbaycanlılara qarşı açıq elan edilməmiş “səlib yürüşü”nün proqramı respublikanın ən yüksək dairələrində hazırlanır, gizli qərarlar və xüsusi göstərişlər vasitəsilə həyata keçirilirdi. 1983-cü il aprelin 24-də ermənilər “genosid” gününü bəhanə edərək Masis (Zəngibasar) rayonunun mərkəzi Uluxanlıda azərbaycanlılar yaşayan evlərə basqınlar etmiş, qəsəbədəki qəbiristanlıqda qəbir daşlarını qırıb dağıtmışdılar. Müdafiəsiz əhali Türkiyə ilə sərhəd zolağına sığınmağa məcbur olmuşdu.

1984-cü ildə Azərbaycan xalqının qəddar düşməni Zori Balayanın “Ocaq” kitabının çap edilməsi azərbaycanlılara qarşı düşmənçilik hisslərinin açıq-aşkar qızışmasına səbəb oldu. Ermənistanda azərbaycanlılara qarşı aparılan milli ayrıseçkilik siyasətinə, onların müxtəlif bəhanələrlə sıxışdırılmasına nəhayət ki, Sov.İKP MK reaksiya verməyə məcbur olmuşdu. “Ermənistan partiya təşkilatında Sov.İKP MK-nın 1983-cü il iyun plenumunun qərarının yerinə yetirilməsi haqqında” Sov.İKP MK-nın 17 oktyabr 1984-cü il tarixli qərarında deyilirdi ki, son vaxtlarda Ermənistanda millətçilik əhval-ruhiyyəsini qızışdıran əsərlər yazılır, tarixi həqiqətlər təhrif edilir, azlıqda qalan millətlərin dilinin və mədəniyyətinin inkişa-

fına imkan yaradılmır, partiya, sovet və təsərrüfat strukturlarında onların nümayəndələri təmsil olunmurlar və s.

1985-ci ildə Mixail Qorbaçovun SSRi-nin rəhbərliyinə gəlməsindən sonra "yenidənqurma" və "aşkarlıq" pərdəsi altında Ermənistanda və DQMV-də millətçilik ab-havası gündən-günə qızışırdı. Dağlıq Qarabağ ermənilərinin öz müqəddəratını təyinetmə pərdəsi altında Azərbaycana qarşı anneksiya planının həyata keçirilməsinin qarşısını ala biləcək şəxs – Heydər Əliyev 1987-ci il oktyabrın 19-da erməni lobbisinin təzyiqi ilə Sov.İKP MK-nın Siyasi Bürosunun üzvlüyündən və SSRİ Nazirlər Soveti sədrinin 1-ci müavini vəzifəsindən uzaqlaşdırıldı. Bundan az sonra noyabrın 18-də Sov.İKP MK-nın baş katibi M. Qorbaçovun iqtisadi məsələlər üzrə müşaviri akademik Abel Aqanbekyan Parisdə "L'Humanite" qəzetinə verdiyi müsahibəsində DQMV-nin Ermənistana birləşdirilməsinin iqtisadi cəhətdən daha sərfəli olmasını və bu məsələ üzərində xüsusi komissiyanın işlədiyini bəyan etdi.

Həmin ilin noyabrında M. Qorbaçov ABŞ-da səfərdə olarkən onun xanımı Raisa Qorbaçova erməni diasporunun nümayəndələri ilə görüşmüşdü. Görüşün təşkilində SSRİ-nin həmin vaxt ABŞ-dakı səfiri Yuri Dubininin xanımı Liana Zavenovna Dubinina xüsusi fəallıq göstərmişdi. Raisa Qorbaçovanın tamahına bələd olan ermənilər ona qiymətli hədiyyələr bağışlamış, M. Qorbaçovdan Dağlıq Qarabağ ermənilərinin tələblərini yerinə yetirməyi xahiş etmişdilər.

1987-ci ilin avqustunda ermənilər Dağlıq Qarabağdan və Ermənistandan 75 min imza toplayaraq Kremlə göndərmişdilər. Dekabrın 1-də Dağlıq Qarabağ ermənilərinin təmsilçiləri muxtar vilayətin Azərbaycanın tərkibindən çıxarılıb Ermənistanın tərkibinə verilməsi haqqında hazırlanmış müraciəti Sov. İKP MK-ya təqdim etmişdilər. Dağlıq Qarabağın erməni icmasının daha bir müraciəti və toplanmış imzaları 8 yanvar 1988-ci ildə SSRİ Ali So-

veti sədrinin birinci müavini Pyotr Demiçevə təqdim etmişdi.

Fevralın 13-də DQMV-də gizli fəaliyyət göstərən separatçı "Krunk" ("Durna") təşkilatının təşkilatçılığı ilə DQMV-nin Ermənistana birləşdirilməsi tələbi ilə Xankəndidə ilk mitinq keçirilmişdir. Fevralın 18-də Kremldəki erməni lobbisinin "kuyratoru" Georgi Şahnazarovun M. Qorbaçovun köməkçisi təyin edilməsindən sonra erməni separatçıları daha da fəallaşmışdılar. Həmin günlərdə İrəvanda keçirilən mitinqlərdə "Ermənistanı türklərdən təmizləməli!", "Ermənistanda ancaq ermənilər yaşamalıdır!" kimi millətçi şüarlar irəli sürülmüşdü.

DQMV Xalq Deputatlar Sovetinin növbədənkənar sessiyasının çağırılacağı xəbərini alan Azərbaycan KP MK-nın birinci katibi Kamran Bağırov 1988-ci il fevralın 20-də səhər-səhər təyyarə ilə Xankəndinə gəlmiş, Vilayət Partiya Komitəsinin büro iclasını keçirmiş, erməni separatizminin qarşısını almağa çalışmışdı. Lakin elə həmin gün axşam Vilayət Xalq Deputatları Sovetinin növbədənkənar sessiyası keçirilmiş, muxtar vilayətin Azərbaycan SSR-in tərkibindən çıxarılıb Ermənistan SSR-in tərkibinə daxil edilməsi haqqında qəbul edilmiş və qərara anlayışlı yanaşılması üçün Azərbaycan və Ermənistan Ali Sovetlərinin Rəyasət Heyətlərinə müraciət edilmiş, bu məsələnin müsbət həlli üçün SSRİ Ali Soveti qarşısında vəsatət qaldırılmışdı.

Elə həmin gün Qafan rayonundan qovulan azərbaycanlı qaçqınların ilk dəstəsinin nümayəndələri Azərbaycan KP MK-da qəbul edilmişdi.

Fevralın 21-də səhər-səhər əllərində Ermənistan SSR-in bayrağı və M. Qorbaçovun portretləri olan nümayişçilər Vilayət Partiya Komitəsinin binasının qabağına toplaşaraq "Dağlıq Qarabağ Ermənistanın ayrılmaz tərkib hissəsidir!", "Qarabağ – yox, Arçax – hə!", "Yaşasın milli siyasətdə yenidənqurma!" şüarlarını səsləndirmişdilər. Həmin gün axşam Sov.İKP MK-nın Siyasi Büro-

su DQMV-də baş verən hadisəni müzakirə etmiş, ermənilərin iddiasının dövlətin mövcud milli-ərazi quruluşunun dəyişdiriləməsinə cəhd və yolverilməz olduğu mövqeyi bildirilmiş, vəziyyəti nəzarətdə saxlamaq üçün Sov.İKP MK-nın katibi Georgi Razumovski, SSRİ Ali Soveti Rəyasət Heyəti sədrinin birinci müavini Pyotr Demiçev və SSRİ DTK-sı sədrinin birinci müavini Flipp Bobkov Bakıya gəlmiş, oradan da Xankəndinə getmişdilər.

Kremlin ilk rəsmi açıqlamasından narazı qalan ermənilər İrəvanda və Xankəndində etiraz mitinqlərinə başlamışdılar. Fevralın 21-də İrəvanda fəaliyyət göstərən yeganə Dəmirbulaq məscidi (XX əsrin əvvəllərində şəhərdə 8 məscid var idi) və M. F. Axundov adına azərbaycanlı orta məktəbin binası, C. Cabbarlı adına İrəvan Dövlət Azərbaycanlı Dram Teatrının ləvazimatı yandırıldı. İrəvanda bu hadisələrə qarşı etirazını bildirən azərbaycanlıların evlərinə od vurdular.

Fevralın 22-də ermənilər Əsgəran rayonunda Bəxtiyar Quliyev və Əli Hacıyev adlı iki gənci qətlə yetirdikdən sonra Xankəndi-Ağdam yolunda Ağdam rayonunu sakinləri ilə Əsgəran sakinləri arasında qarşıdurma olmuş, 19 nəfər yaralanmışdı. Fevralın 25-də Azərbaycanın öz ərazisindən azərbaycanlıların ilk qaçqınlıq dalğası başladı. DQMV-nin ərazisində ermənilərin təzyiq və təhqirlərinə tab gətirməyən 540 ailə (təqribən 2,5 min nəfər) Ağdam rayonuna, 150 ailə isə (təqribən 500-600 nəfər) Ağcabədi rayonuna pənah gətirmişdi.

Ermənistan ərazisindən isə azərbaycanlıların deportasiyası günü-gündən intensivləşirdi. Fevralın 28-nə olan rəsmi məlumata görə, Qafan rayonundan qonşu Zəngilan rayonuna təqribən 2 min nəfər azərbaycanlı qaçqın kimi gəlmişdi. Həmin günlərdə İmişli və Qubadlı rayonlarına da Ermənistandan yüzlərlə qaçqın ailəsi pənah gətirmişdi. Abşeron rayonuna Ermənistandan canını qurtarıb gələn 200 nəfər qaçqını Mərkəzi Komitənin birinci katibi K. Ba-

ğırov və Moskvadan gələn yüksək vəzifəli şəxslər qəbul etmişdilər. Gəncədə və Naxçıvanda Ermənistandan azərbaycanlıların təqib edilmələrinə etiraz əlaməti olaraq aksiyalar keçirilmişdi.

İrəvanda fəaliyyət göstərən "Qarabağ" komitəsinin rəhbərləri Silva Kaputikyan və Zori Balayan fevralın 24-də Moskvada Sov.İKP MK Siyasi Bürosunun üzvü, MK katibi Aleksandr Yakovlevlə üç saata yaxın danışıq aparmışdılar. Fevralın 26-da isə M. Qorbaçovun köməkçisi Georgi Şahnazarovun və A. Yakovlevin («Latinskaya Amerika» jurnalının redaktoru Serqo Mikoyanın qayını A. Yakovlevin köməkçisi idi) müşayiəti ilə Sov. İKP MK-nın baş katibi M. Qorbaçov S. Kaputikyanı və Z. Balayanı qəbul etmişdi. Saatyarım müddətdə onlar M. Qorbaçova türk dünyasının xəritəsini və saxta tarixi arayışlar təqdim etmiş, onu DQMV-nin Azərbaycanın tərkibində qalmasının mümkünsüzlüyünə inandırmağa çalışmışdılar. Lakin Qorbaçov onlara Dağlıq Qarabağın Ermənistana veriləcəyini vəd etməmişdi. Əvəzində, DQMV-nin sosial-iqtisadi inkişafı üçün o dövrün miqyasına görə çox böyük bir məbləğ olan 400 milyon rubl ayırılacağına söz vermişdi. Çünki Qorbaçov bilirdi ki, SSRİ ərazisində 19 potensial milli münaqişə ocağı mövcuddur və sərhədlərin dəyişdirilməsi yolu ilə Dağlıq Qarabağın Ermənistana verilməsi SSRİ-nin süqutuna gətirib çıxara bilərdi. Həmin görüşdə G. Şahnazarov S. Kaputikyan və Z. Balayana deyir ki, gedin İrəvanda deyin ki, tezliklə milli məsələyə həsr olunacaq Ümumittifaq konfransı keçiriləcək və o zaman qərar qəbul ediləcək. Bundan sonra İrəvanda və Xankəndində yeni mitinqlər dalğası başlamışdı.

Fevralın 27-də Sov.İKP MK-nın beynəlxalq əlaqələr şöbəsi müdirinin birinci müavini Karen Brutens Xankəndinə gələrək erməni separatçılarının rəhbərləri ilə tam məxfi görüş keçirmiş, onlara təzyiqləri artırmağı və tələblərindən geri çəkilməməyi məsləhət görmüşdü.

Ermənistandan azərbaycanlıların deportasiyasının qarşısını almağın mümkünsüzlüyünü görən Azərbaycan KP MK martın 1-də Həsən Həsənovun başçılığı ilə Ermənistandan gələn azərbaycanlılarla iş aparmaq məqsədilə respublika komissiyası yaratmışdı.

Fevralın 27-28-də Dağlıq Qarabağda və Ermənistanda azərbaycanlılara qarşı edilən zorakılıqlara etiraz əlaməti olaraq keçirilən mitinqdən sonra DTK-nın ssenarisi və erməni ekstremistlərinin bilavasitə iştirakı ilə Sumqayıtda kütləvi iğtişaşlar törədildi. Bundan sonra Ermənistandan azərbaycanlıların yeni qaçqınlıq dalğası başladı. Moskvanın, onun Azərbaycana və Ermənistana göndərilmiş emissarlarının ikiüzlü mövqeləri (Yeqor Liqaçov Azərbaycanda, Aleksandr Yakovlev Ermənistanda) erməni millətçilərinin öz bədnam niyyətlərini həyata keçirmək ümidlərini artırırdı.

Erməni millətçiləri üçün Ermənistanda ən münbit rayonlarda yaşayan 200 mindən artıq azərbaycanlını deportasiya etmək, Dağlıq Qarabağ problemini həll etmək qədər vacib idi. Azərbaycan hökuməti isə Ermənistandan gələn qaçqınları yük maşınlarına dolduraraq geri qaytarmaqla öz işini bitmiş hesab edirdi. 1988-ci il martın 21-nə olan rəsmi məlumata görə, fevralın 28-dən həmin günədək Ermənistandan 16900 nəfər qaçqın gəlmiş, onlardan 8600 nəfəri geri qaytarılmışdı. Buna baxmayaraq, dağ yolları ilə Ermənistanın Vardenis (Basarkeçər), Masis (Zəngibasar), Razdan (Axta), Krasneselo, Yeğeqnadzor, Ararat (Vedi) rayonlarından qaçqın axını gəlir və əsasən Gəncə, Mingəçevir, Naxçıvan şəhərlərində, Şərur, Zəngilan, Qazax, Səlyan, Xanlar (Göygöl), Jdanov (Beyləqan) rayonlarında özlərinə sığınacaq tapırdılar. Naxçıvanda vəziyyət o həddə çatmışdı ki, Bakıdan oraya əlavə ərzaq göndərilməsinə başlanılmışdı.

11 may 1988-ci ildə ermənilər Ararat (Vedi) rayonunun Şiraz-

lı kəndinə hücum etmiş, iki nəfər qətlə yetirilmiş, onlarla nəfər yaralanmış, evlər yandırılmışdı. Əhali Sovet-Türkiyə sərhədinə çəkilərək uzun müddət çadırlarda yaşamaq məcburiyyətində qalmışdı.

Ermənistanda yaşayan azərbaycanlıların vəziyyətini öyrənmək, onların problemlərini həll etmək məqsədilə Azərbaycan KP MK-nın katibi Ramiz Mehdiyevin başçılığı ilə İrəvana nümayəndə heyəti göndərilmişdi. 13-15 aprel 1988-ci il tarixində Ermənistanda olmuş nümayəndə heyəti iki dəfə Ermənistan KP MK-nın birinci katibi Karen Demirçyanla görüşmüşdü. Lakin verilən vədlərə baxmayaraq, azərbaycanlılara qarşı edilən zorakılıqlara və onların deportasiyasına son qoyulmamışdı. Ermənistandan qovulan azərbaycanlılar Azərbaycan KP MK-ya gələrək, onların Dağlıq Qarabağda məskunlaşdırılmalarını xahiş edirdilər. Azərbaycan rəhbərləri isə nəinki onlara bu şəraiti yaradır, əksinə, onları DQMV-nin ərazisinə buraxmamaq haqqında hüquq-mühafizə orqanlarına möhkəm-möhkəm tapşırıqlar verirdilər.

1988-ci il mayın 15-də ilk dəfə keçmiş Lenin – indiki Azadlıq meydanında əsasən tələbələrin və ziyalıların iştirakı ilə azərbaycanlıların Ermənistandan qovulmasına etiraz əlaməti olaraq izdihamlı mitinq keçirildi. Mitinqdə “Erməni təhrikçiliyinə son qoyulsun!”, “Ermənistanda yaşayan azərbaycanlılar üçün muxtariyyət!”, “Daşnaklara ölüm!” və s. şüarlar səsləndirilmişdi.

1988-ci il iyunun 15-də Ermənistan SSR Ali Sovetinin sessiyası DQMV-nin Ermənistana birləşdirilməsi haqqında qərar qəbul edərək SSRİ Ali Sovetinə müraciət etdi ki, buna razılıq versin. Azərbaycan SSR Ali Soveti iyunun 17-də bu qanunsuz tələbi rədd etdikdən sonra Ermənistandakı azərbaycanlıların vəziyyəti daha da ağırlaşdı. İyunun 17-20-də İrəvanda teatr meydanında mitinqə toplaşan qeyzlənmiş erməni dəstələri avtobuslarla azərbaycanlılar yaşayan Masis rayonunun mərkəzinə və Zəngilər,

Zəhmət, Dəmirçilər, Dostluq, Nizami, Sarvanlar kəndlərinə basqınlar etdilər. Müdafiəsiz on mindən çox azərbaycanlılar Sovet-Türkiyə sərhədinə toplaşmış, günlərlə orada gecələməyə məcbur olmuşdular. Həmin günlər 20-dən çox azərbaycanlı yaralanmışdı. Rayon mərkəzi Uluxanlı qəsəbəsindən 3 mindən çox azərbaycanlı evlərindən çıxarıldı. Bütün bu iğtişaşlar zamanı SSRİ Daxili İşlər Nazirliyinin rayonda olan qüvvələri yalnız müşahidəçi rolunu oynayırdılar.

1988-ci il iyulun 9-da Azərbaycan KP MK-nın yeni birinci katibi Əbdürrəhman Vəzirovun tapşırığı ilə Şuşada və DQMV-nin digər məntəqələrində özbaşına və yaxud qohumlarının yanında məskunlaşmış azərbaycanlı qaçqınlar muxtar respublika ərazisindən çıxarılaraq digər rayonlara göndərildilər.

1988-ci il iyulun 18-də SSRİ Ali Soveti Rəyasət heyətinin iclası DQMV haqqında məsələni müzakirə edərək respublikalar arasında sərhədlərin dəyişdirilməsinin yolverilməzliyi haqqında qərar qəbul etdikdən sonra erməni millətçiləri azərbaycanlıların Ermənistan ərazisindən çıxarılması üçün hər yerdə mitinqlər təşkil etməyə başladılar.

İyulun 21-də ermənilərin Kalinino rayon mərkəzində yaşayan azərbaycanlılara silahlı hücumu nəticəsində 86 yaşlı Məhəmməd Sadıqov qətlə yetirilmiş, onlarla adam yaralanmışdı.

Avqustun 20-də Xankəndi şəhər meydanında keçirilən mitinqdə Ermənistandan gələn azərbaycanlı qaçqınların muxtar vilayətin ərazisindən çıxarılmaları tələbi irəli sürülmüşdü.

Ermənistan EA-nın müxbir üzvü, "Qarabağ" hərəkatının liderlərindən olan akademik Rafael Kazaryan 1988-ci il noyabrın 4-də İrəvanda keçirilən mitinqdə demişdi: "Dəstələrin köməyi ilə emiqrasiyanı təmin etmək lazımdır. Bizə bütün onilliklər ərzində ilk dəfə Ermənistanı türklərdən təmizləmək imkanı verilmişdir. Mən bunu bu on aylıq mübarizəmizin ən böyük nailiyyəti hesab

edirəm".

1988-ci il noyabrın ortalarında Ermənistandan Azərbaycana 80 mindən artıq qaçqın pənah gətirmişdi. Noyabrın 17-də Bakıda "Azadlıq" meydanında keçirilən mitinq zamanı Ermənistanda yaşayan azərbaycanlılara muxtariyyət verilməsi tələbi ilə qətnamə qəbul edilmişdi. Ermənistan televiziyası həmin gün Bakıda keçirilən mitinqdən reportajlar göstərərək, həmin qətnamənin tələblərini dəfələrlə efirdə səsləndirmişdi. Noyabrın 22-də Ermənistan SSR Ali Sovetinin azərbaycanlı deputatların iştiraki olmadan növbədənkənar sessiyası çağırılmışdı. Sessiyanın keçirildiyi Opera teatrının binasının qarşısına toplaşan mitinq iştirakçılarının hücumundan sonra Ermənistan rəhbərliyi mitinqçilərin tələbi ilə sessiyasının gedişini dayandırmış, deputatları və rayon rəhbərlərini "qayda-qanunu bərpa etmək" adı altında yerlərdə göndərmişdi. Rayon rəhbərlərinə tapşırıq verilmişdi ki, bir həftə ərzində, yəni noyabrın 28-dək Ermənistanı azərbaycanlılardan təmizləmək aksiyasını başa çatdırsınlar.

Ermənistan KP MK, Ali Sovet və Nazirlər Sovetinin orqanı olan "Kommunist" (rusca) qəzeti 13 dekabr 1988-ci il tarixli sayında dərc edilən "Fəlakət anı, məsuliyyət anı" məqaləsində həmin günlərdə törədilən qırğınlardan bəhs edərək yazırdı: "Noyabrın 26-da "Qarabağ" hərəkatı fəallarının təhrikçi çıxışlarından qızışmış 500 nəfər Kirovakan (indiki Vanadzor) sakini Şaumyan (əvvəlki adı Vartanlı olmuşdur) kəndinə doğru hərəkət etdi. Vuruşma iki gün davam etdi, silahlı atışma oldu. Ölənlər var. Kuybışev kəndində də qırğınlar törədildi, orada da tələfat var. Hərəkatın fəallarının köməyi ilə yaradılmış "özünümüdafiə dəstələri" yollarda qoyduqları postlarda azğınlıqlar törədirdilər. Azərbaycanlı kəndlərinə ərzaq köməyi göstərən ermənilər döyülürdülər."

Vartanlı və Kuybışev kəndlərində ermənilərin törətdikləri qırğınları ört-basdır edən rəsmi orqanlar yalnız "atışma olmuşdur,

tələfat var" ifadələri işlətməklə kifayətlənmişdilər. Vartanlı kəndi Kirovakan şəhərinə bitişik olmasına baxmayaraq, inzibati-ərazi bölgüsünə görə Quqark rayonuna daxil idi. XX əsrin əvvəllərində tamamilə azərbaycanlılar yaşayan Vartanlı kəndində 1988-ci ilin sonunda ermənilər çoxluq təşkil edirdilər. Ermənilər noyabrın 25-dən 26-na keçən gecə kəndə silahlı hücum etmişdilər. Həmin gün güclü qar yağır, boran əsirdi. Azərbaycanlılar əsasən kəndi tərk edib ətraf meşələrə çəkilməyə məcbur olmuşdular.

Ümumiyyətlə, təkcə noyabrın 26-27-də Vartanlı kəndində 14 nəfər azərbaycanlı vəhşicəsinə öldürülmüş və yandırılmışdır. Kəndin sağ qalan əhalisi qarlı-çovğunlu günlərdə dağlarla, meşələrlə gündüzlər gizlənib yalnız gecələr yol gedərək 13-14 gün ərzində Azərbaycana çatmışdılar. Onlarla vartanlılar dağlarda itkin düşdülər. Toqquşma zamanı aldıqları bədən xəsarətindən, yollarda tutulduqları xəstəlikdən sonra Azərbaycana gələn onlarla vartanlılı vəfat etmiş, bir çoxları ömürlük şikəst olmuşdular. Ümumiyyətlə, həmin dövrdə Quqark rayonunda ermənilərin törətdiyi qırğınlar nəticəsində 30-dan artıq azərbaycanlı qətlə yetirilmişdir. Quqark faciəsi Ermənistan rəhbərliyi tərəfindən ört-basdır edildi. Sonralar, yəni 1989-cu ildə Ermənistan KP MK bürosu Quqark rayon partiya komitəsinin birinci katibi L. Bağdasaryanı və RİK-nin sədri S. Kazaryanı işdən azad etməklə kifayətləndi.

Vartanlı faciəsi öz ssenarisinə görə 1918-1920-ci illərdə İrəvan quberniyasında azərbaycanlılar yaşayan kəndlərə erməni quldurlarının hücumları zamanı törədilən vəhşiliklərin təkrarı idi. Erməni tarixçisi Leo (əsl adı Arakel Babaxanyandır) 1925-ci ildə Tiflisdə ermənicə çap olunan "Ançyaliç" ("Keçmişdən") əsərində erməni silahlı dəstələrinin azərbaycanlılara qarşı törətdikləri vəhşilikləri etiraf edərək yazır: "Daşnaksakanlar "silip-süpürməklə" (yəni azərbaycanlı kəndlərində etnik təmizləmə aparmaqla) məşğul idilər. Sürməli qəzasının türk (azərbaycanlı) əhalisinin xeyli hissəsi

öz yaşayış yerlərindən qaçmışdılar. İrəvan və digər qəzalarda bir çox kəndləri dağıdılmış və yandırılmışdı. Erməni fidailəri heç bir faydası və zəruriyyət olmadan hətta elə kəndlərdə vəhşiliklər törədirdilər ki, həmin kəndlərdə türk əhalisi çox az olduğu üçün ermənilərə heç bir ziyan verə bilməzdi. Xüsusən Böyük Qarakilsə şəhərinin yanındakı Vartanlı kiçik türk kəndində törədilən qırğınlar həyəcanlandırıcı idi". 1918-ci ildə Vartanlıda törədilən qırğınlar düz 70 ildən sonra bir də təkrarlanmışdı. 1918-ci ilin Novruz bayramı günlərində ermənilər Vartanlı kəndinin kişi cinsindən olan bütün sakinlərini qoyun tövlələrinə toplayaraq hamısını yandırmışdılar. Qadınlar , körpələr meşələrə qaçaraq dağlarda tələf olmuşdular. Deməli, ermənilər təkcə XX əsrdə Vartanlı kəndində iki dəfə azərbaycanlılara qarşı soyqırım törətmişlər. Təəssüf ki, dünya ictimaiyyəti Ermənistandakı nə 1918-1920-ci illər, nə də 1988-1989-cu illər qırğınları haqqında xəbər tutmamışdır.

1988-ci ilin noyabrında Spitak (Hamamlı) rayonunda da azərbaycanlılara qarşı qırğınlar törədilmişdi. Noyabrın 28-də Spitak rayon İcraiyyə Komitəsinin sədri V. Haycyan, daxili işlər şöbəsinin rəisi rəisi V. Sarkisyan, DTK rayon şöbəsinin sədr müavini Mehrabyan rayonun azərbaycanlılar yaşayan Saral və Qusarlı kəndlərinə gəlib bildirmişdilər ki, onların təhlükəsizliyinə təminat vermirlər, ona görə də əgər iki saat ərzində kəndi tərk etməsələr, silahlı dəstələr kəndə hücum edəcəklər. Camaat onların təklifini rədd edir. Lakin Spitak və Quqark rayon rəhbərləri yenə gəlib təkidlə tələb edirlər ki, kənd camaatı tezliklə çıxmalıdırlar. Onlar özləri ilə 34 avtobus və 40 yükünü özüboşaldan maşın gətirmişdilər. Onların göstərişi ilə bir dəstə erməni sahiblərinin gözü qarşısında ev əşyalarını həyətə çıxarıb, od vururlar. Əhalini zorla avtobuslara mindirərək kəndlərdən çıxarırlar. Həmin avtobusları Spitak rayonun ərazisindən kənarda - Quqark rayonunun Mrqahovit (Həmzəçimən) kəndi yaxınlığında axşamdan xeyli keçmiş silahlı

dəstələr gözləyirdilər. Spitak rayonunun rəhbərləri işi elə qurmuşdular ki, qan qonşu rayonun ərazisində tökülməli idi, bununla da onlar məsuliyyətdən kənarda qalacaqdılar. Gecənin qaranlığında yolun kənarında pusquda durmuş quldurların avtobusları atəşə tutması nəticəsində 3 nəfər (Balacayev Şahin Səyyad oğlu, Balacayev Teymur Məsim oğlu və Balacayeva Sürəyya Hüseyn qızı) həlak olmuş, 7 nəfər ağır yaralanmışdı.

Ermənistanda azərbaycanlılara qarşı dəhşətli cinayətlər törədilən rayonlardan biri də Stepanavan (Cəlaloğlu) rayonudur. Kuybışev kəndinin sakinləri Təmraz Yusif oğlu İsgəndərov, Gilas Rüstəm qızı Xəlilova, Şərif Cabbar oğlu Xəlilov vəhşicəsinə döyülmüş və soyuq silahla qətlə yetirilmişlər. Gərgər kənd sakini, Puşkino kolxozunun sağıcısı Bəsti İsrafil qızı Mustafayeva isə Ermənistanda baş vermiş dəhşətli zəlzələdən sonra, yəni bütün dünyanın Ermənistanın halına ağladığı bir vaxtda, 30 dekabr 1988-ci ildə diri-diri yandırılmış və meyiti zibillikdə gizlədilmişdi. Xeyli müddətdən sonra onun meyiti hərbçilərin köməyi ilə tapılmışdı.

Yuxarıda adı çəkilən “Fəlakət anı, məsuliyyət anı” məqaləsində azərbaycanlıların hansı şəraitdə və necə deportasiya edilmələrinə qismən də olsa aydınlıq gətirilimişdi: “Qarabağ” komitəsi avantüristlərinin çağırışına millətçilik azarına tutulmuş bir sıra partiya-sovet işçiləri də qoşulmuşlar. Ayrı-ayrı rayonlarda millətlərarası qırğına sürükləyən coşmuş ehtirasları cilovlamaq, vətəndaşları müdafiə etmək, təxribatçıları ifşa etmək əvəzinə, onlar adamların (yəni azərbaycınlıların) kütləvi surətdə çıxarılmasına “fətva” verdilər. Bu cür “missiya” ilə bəzi “xadimlər” Kirovakanda, Stepanavanda, Artaşatda evləri bir-bir gəzirdilər.” Əlbəttə, azərbaycanlılar yaşayan bütün rayonların vəziyyəti belə idi. Deportasiya aksiyasını müəyyən olunmuş müddətdə başa çatdırmaq üçün Kalinin, Spitak, Quqark, Noyemberyan, Krasnoselo, Vardenis, Yağeqnadzor, Əzizbəyov, Ararat, Masis, Sisyan və Meğri rayonlarının rəhbərləri

xüsusilə canfəşanlıq göstərmişdilər.

"Fəlakət anı, məsuliyyət anı" məqaləsinin bir yerində yazılırdı: "Komitənin (yəni "Qarabağ" komitəsinin) yerli özəklərinin təşəbbüsü ilə rayon və kəndlərdə mitinqlər təşkil edilərək azərbaycanlılardan öz evlərini tərk etmələri tələbləri irəli sürülürdü. Ən həyəcanlandırıcı hal odur ki, "Qarabağ" komitəsinin hazırladığı siyasi münaqişələrə hətta uşaqları da cəlb edirdilər. Təsəvvür edin ki, Amasiya rayonunun mərkəzində rayon Xalq Nəzarəti Komitəsi sədrinin oğlunun rəhbərliyi ilə 30 məktəbli nümayiş keçirir və azərbaycanlıların işdən qovulmasını tələb edirdilər". Amasiyanın beynəlmiləl məktəbinin erməni şagirdlərinin tələbi ilə dərhal məktəbin Azərbaycan bölməsi bağlanmışdı. Bir həftə ərzində, 1988-ci il dekabrın 1-dək rəhbər vəzifələrdə işləyən azərbaycanlıların əksəriyyəti işdən azad edilmişdilər.

1988-ci il dekabrın 7-də Spitak zəlzələsinin baş verməsinədək Ermənistan ərazisində azərbaycanlıların yaşadıqları bütün rayonlarda erməni silahlı dəstələri kütləvi qırğınlar, qətl və qarətlər törətmişdilər.

1988-ci ilin noyabr-dekabr aylarında bir tərəfdən Ermənistanın azərbaycanlılar yaşayan kəndlərinin əhalisi sıxışdırılır, kəndlərə ərzaq göndərilmir, elektrik xətləri kəsilir və silahlı basqınlar edilir, digər tərəfdən kəndləri tərk edən ailələrə yollarda divan tutulur, əmlakları qarət edilir, özləri isə qətlə yetirilirdilər. Ermənistanda milli zəmində baş verən cinayətlərin əksəriyyəti əsasən azərbaycanlı əhalinin öz yaşayış məntəqələrini tərk etməyə məcbur olduqları vaxt baş vermişdi. Ermənistandan Azərbaycana gedən bütün yollar üzərində bir neçə yerdə silahlı quldur dəstələri yerləşdirilmişdi. Quldurların əksəriyyəti milis forması geyərək özbaşına yoxlama-buraxılış məntəqələri yaratmışdılar. Onlar bütün maşınları saxlayır, sərnişinlərin sənədlərini yoxlayır və maşında azərbaycanlılar olduğunu müəyyən edən kimi onu maşından düşürür, əmlaklarını

boşaldaraq qarət edir, özlərini isə vəhşicəsinə qətlə yetirirdilər.

Yeri gəlmişkən, 1989-cu ilin sonlarında Azərbaycan Qaçqınlar Cəmiyyəti yaradıldı. Eldar müəllim Cəmiyyətin ideologiya şöbəsinin müdiri, mən isə təşkilat şöbəsində təlimatçı vəzifəsində işləməyə başladıq. Hər gün yüzlərlə qaçqın Qaçqınlar Cəmiyyətinə gəlir, öz dərd-sərlərini danışır, problemlərinin həllində Cəmiyyətdən köməklik göstərilməsini xahiş edirdilər. Qaçqınlar Eldar müəllimin iş otağına gələrək erməni vandallarının başlarına gətirdikləri faciələr, itkilər barədə yazılı məlumatlar verirdilər. Eldar müəllimin bu kitabındakı ayrı-ayrı epizodlar məhz həmin izahatlar əsasında qələmə alınmışdır.

Ermənistanı 1988-ci ildə tərk edərək və Xanlar (Göygöl) rayonunun Quşqara kəndinə pənah gətirmiş, milliyyətcə rus olan L.V.Tolstyak Azərbaycan Qaçqınlar Cəmiyyətində yazdığı izahatında göstərmişdi ki, noyabrın 27-də Ermənistan SSR Nazirlər Soveti sədrinin birinci müavini (daha sonralar Ermənistan KP MK-nın birinci katibi) Vladimir Movsesyan Basarkeçər rayonunun Zod kəndinə gəlib əhalinin kəndi tərk etməsi üçün üç gün vaxt veridiyini bəyan etdi və əlavə etdi ki, bu müddətdə kəndi tərk etməsələr, onların təhlükəsizliyinə təminat verilməyəcək.

Hərbçilərin və "BTR"-lərin müşayiəti ilə Amasiya rayonunun Oxçoğlu kəndindən yola salınan 15 ailənin ev əşyalarını qonşu Axuryan rayonunun Kaps (keçmiş Qanlıca) kəndində ermənilər maşınları boşatmış, talan etmiş, sonra isə od vurub yandırmış və yük sahiblərini ölümcül döymüşdülər. Bu cinayət işi ilə SSRİ Prokurorluğunun əməkdaşları məşğul olmalarına baxmayaraq, heç kəs məsuliyyətə cəlb edilməmişdi.

Həmişə milli ayrıseçkilik siyasəti yürüdən Ermənistan rəhbərliyi zəlzələdən sonra da öz çirkin əməllərini davam etdirmişdi. Zəlzələ zamanı həlak olmuş, ağır yaralanmış, evləri dağılmış azərbaycanlıların taleyinə biganə qalmışdılar. Spitak və Quqark

rayonlarının rəhbərləri həmin rayonların hərbi komendantlarına təqdim etdikləri siyahıda azərbaycanlı kəndlərinin adlarını siyahıdan çıxarmışdılar ki, guya artıq orda əhali yaşamır. Bununla da onları ərzaq və digər zəruri şeylərlə təmin etməkdən, tibbi yardımdan məhrum etmişdilər.

Müvafiq sənədlər və şahid ifadələri əsasında 1990-cı ildə Azərbaycan Qaçqınlar Cəmiyyətində tərtib edilmiş siyahıya əsasən, 1988-1990-cı illər ərzində Ermənistanda 216 nəfər azərbaycanlı vəhşicəsinə qətlə yetirilmiş və ya millətlərarası münaqişə zəminində baş vermiş hadisələr nəticəsində həlak olmuşdur. Həmin siyahıya əsasən, 52 nəfər aldığı xəsarət nəticəsində ölmüş, 34 nəfər işgəncə ilə öldürülmüş, 20 nəfər odlu silahla qətlə yetirilmiş, 15 nəfər yandırılmış, 8 nəfər maşınla vurulmuş, 9 nəfər yollarda qəzaya uğradılmış, 7 nəfər həkim qəsdi nəticəsində, 9 nəfər dəhşətli hisslərdən keçirdiyi infarkt nəticəsində ölmüş, 2 nəfər intihar etmiş, bir nəfər asılmış, 2 nəfər maşın partladılması nəticəsində, bir nəfəri elektrik cərəyanı ilə, bir nəfəri suda boğub öldürmüşdülər, 6 nəfər itkin düşmüş, 20 nəfər xəstəxanadan yoxa çıxmış, 48 nəfər isə dağlarda borana düşüb həlak olmuşlar.

1990-cı ilin avqustun 9-da Azərbaycan Respublikasının Ali Soveti Qaçqınlar Cəmiyyətində tərtib edilən siyahını və digər faktları məktubla SSRİ Prokurorluğuna göndərmiş və Ermənistanda milli münaqişələr zəminində qətlə yetirilmiş azərbaycanlılar haqqında məlumat verməyi xahiş etmişdi. SSRİ Baş Prokurorunun müavini V. İ. Kvartsovun 4 oktyabr 1990-cı il tarixli cavab məktubunda deyilirdi: “Sizin məktubunuzla əlaqədar olaraq bildirirəm ki, 1988-1989-cu illərdə Ermənistan SSR-də milli zəmində baş verən cinayət faktları üzrə 675 cinayət işi qaldırılmışdır, onlardan 283-ü istintaq aidiyyati üzrə Azərbaycana göndərilmişdir. Eyni zamanda Azərbaycan SSR-dən Ermənistana təhqiqat üçün 138 cinayət işi daxil olmuşdur. 1989-cu il dekabrın 31-nə olan məlumata görə

Ermənistanın hüquq-mühafizə orqanlarının icraatında olan bu qəbildən 530 cinayət işindən 200 iş üzrə cinayət açılmamış və istintaq dayandırılmışdır.

1988-ci ilin noyabr-dekabr aylarında Ermənistan ərazisində milli münasibətlərin kəskinləşməsi üzündən bir sıra rayonlarda qarət, yanğın və ictimai qayda-qanununa zidd olan digər hallarla müşayiət olunan kütləvi iğtişaşlar baş vermişdir... Bu hərəkətlər nəticəsində 21 nəfər öldürülmüş (20 azərbaycanlı və bir erməni), 4 nəfər sonradan ölümlə nəticələnmiş ağır bədən xəsarəti almışdır. Qətl hadisəsi üzrə 8 cinayət işi və zərərçəkənlərin ölümü ilə nəticələnmiş ağır bədən xəsarəti üzrə dörd işin istintaqı başa çatdırılaraq məhkəməyə göndərilmişdir. Əliyevlər barəsindəki cinayət işinə bəraət qazandırıcı əsaslar üzrə xitam verilmişdir, belə ki, istintaq bu qənaətə gəlmişdir ki, onun Mirzoyanı öldürməsi son zəruri müdafiə həddindən baş vermişdir.

Bu qəbildən məhkəməyə göndərilən üç qətl və ağır bədən xəsarəti yetirilməsi üzrə iki cinayət işi üzrə günahkarlar müxtəlif müddətlərdə azadlıqdan məhrum edilmişlər. Bir neçə cinayət işi əlavə istintaqa qaytarılmışdır.

Ermənistan Prokuroruna tapşırılmışdır ki, bu işlər üzrə aparılan istintaqın tamlığını və obyektivliyini yoxlasın, onun başa çatdırılması üçün tədbirlər görsün. Günahkarların müəyyənləşdirilməməsi üzündən istintaqın xitam verilmiş işləri araşdırmaq və istintaqı təzələmək məsələsinin mümkünlüyünü öyrənmək tapşırığı da verilmişdir. Ermənistan məhkəmələrinə milli nifaq zəminində baş vermiş 91 müttəhim barəsində cəmisi 53 cinayət işi göndərilmişdir. 48 iş üzrə 82 nəfər mühakimə olunmuş, onlardan 30 nəfər müxtəlif müddətdə azadlıqdan məhrum edilmişdir.

SSRİ Prokurorluğu cinayətlərin açılmasına nəzarət edir və zəruri kömək göstərir." Əslində, SSRİ Prokurorluğu bununla öz işini bitmiş hesab etmişdi.

Bu məktubla əlaqədar Ermənistan SSR Prokurorluğundan SSRİ Prokurorluğuna göndərilən cavab məktubunda azərbaycanlılara qarşı törədilən bir çox qətllər etiraf edilsə də, əksər cinayətlər ört-basdır edilmiş, onların üstü açılmadan aşağıdakı kimi şablon cavablar verilmişdi: "Göstərilən məlumatlara uyğun şəxs pasport qeydiyyatı stolundan və kənd sovetinin təsərrüfat kitabından keçməmişdir," "Ünvanından qeydiyyatdan çıxmışdır", "Ölümü haqqında qeydiyyat rayon VVAQ şöbəsində yoxdur," "1988-ci ildə ünvanından çıxıb Azərbaycan SSR-ə getmişdir" və s.

Məhz hüquq-mühafizə orqanlarının nəzarətsizliyi, onların erməni millətçilərinin separatçı hərəkətlərinə vaxtında və qanuni qiymət vermədiklərinin nəticəsində azərbaycanlılar əsrlər boyu yaşadıqları əzəli torpaqlarından iki həftə ərzində vəhşicəsinə qovuldular. Keçmiş İttifaq orqanları azərbaycanlıların Ermənistandan deportasiyasına seyrçi münasibət göstərdi. Demək olar ki, bütün azərbaycanlılar Ermənistandan qovulduqdan sonra, yəni 1988-ci il dekabrın 6-da Sov. İKP MK və SSRİ Nazirlər Soveti "Vətəndaşların daimi yaşayış yerləri məcburi tərk etməsində Azərbaycan SSR və Ermənistan SSR-in yerli orqanlarının ayrı-ayrı vəzifəli şəxslərinin yolverilməz hərəkətləri haqqında" qərar qəbul etmişdi.

SSRİ Nazirlər Soveti sədrinin ozamankı müavini B. Şerbinanın rəhbərliyi ilə hər üç Zaqafqaziya respublikalarının nazirlər sovetlərinin sədrləri və İttifaqın müvafiq nazirliklərinin rəhbər işçiləri da daxil olmaqla xüsusi komissiya yaradılmışdı. Bu komissiya qaçqınların təhlükəsiz köçürülməsi və yerləşdirilməsi məsələləri ilə məşğul olmalı idi. Əslində isə Ermənistandan azərbaycanlılar faktiki olaraq təmizləndikdən və dekabrın 7-də orada baş verən zəlzələdən sonra bu komissiya da heç bir iş görmədən öz işini başa vurmuşdu.

Zəlzələnin vurduğu ziyanları aradan qaldırmaq, iqtisadiyyatı bərpa etmək üçün Ermənistana xeyli miqdarda işçi qüvvəsi lazım

idi. Məhz bu məqsədlə də 1989-cu il yanvarın 4-də Ermənistan rəhbərliyinin "xahişi" ilə Azərbaycan rəhbərliyi hər iki respublikanın KP MK-larının, Ali Soveti Rəyasət Heyətlərinin və Nazirlər Sovetlərinin adından daimi yaşayış yerlərinə qayıtmaları üçün qaçqınlara müraciət etmişdi.

Ermənistan rəhbərliyi azərbaycanlıların Ermənistana qayıtmasına təminat verilməsi illüziyası yaratmaq məqsədilə 15 dekabr 1988-ci ildə Sov. İKP MK və SSRİ Nazirlər Sovetinin 6 dekabr tarixli yuxarıda adı çəkilən qərarının yerinə yetirilməsinin gedişini müzakirə edərək 13 nəfər rəhbər işçini partiya sıralarından xaric etmiş, 68 nəfərə partiya tənbehi vermişdi. Büro həmçinin Quqark rayon Partiya Komitəsinin birinci katibini və İcraiyyə Komitəsinin sədrini işdən azad etməklə kifayətlənmiş, Stepanavan və İcevan rayonlarının birinci katiblərinə ciddi töhmət vermiş, adları çəkilən rayonlardan əlavə Yeğeqnadzor, Krasnoselo, Ararat, Masis, Amasiya, Noyemberyan rayonlarında vətəndaşların hüquqlarının pozulması, şantaj və kütləvi iğtişaşlara yol verildiyini qeyd etmişdi. Ermənistan Prokurorluğu isə Sevan, Kalinino və Abovyan rayonlarının prokurorlarını işdən azad etmişdi.

Məhz Moskvanın ermənilərə arxa durması nəticəsində 1988-1989-cu illərdə indiki Ermənistan ərazisində azərbaycanlıların yaşadıqları 170 təmiz və 94 qarışıq yaşayış məskənləri boşaldıldı. Ermənistanın Meğri rayonunun Zəngilan rayonu ilə həmsərhəd bölgəsində qalmış axırıncı azərbaycanlı kəndi – Nüvədi də 1991-ci il avqustun 8-də boşaldıldı.

Ümumiyyətlə, həyata keçirilən sonuncu etnik təmizləmə nəticəsində Ermənistanın 22 kənd, rayonundan və 6 şəhərindən təqribən 250 min azərbaycanlı tarixi-etnik torpaqlarından vəhşicəsinə qovuldular.

1988-ci ilə qədər Ermənistanda azərbaycanlıların yaşadıqları ərazi respublika ərazisinin (29, 8 min kv.km.) 25 faizini, yaxud

təqribən 7,5 min kv. km təşkil edirdi. Bu isə keçmiş DQMV-nin ərazisindən (4,4 min kv. km) təqribən 3 min kv. km artıqdır.

Ermənistan rəhbərliyi azərbaycanlıların etnik təmizlənməsi aksiyasını başa çatdırdıqdan sonra, onların yaşadıqları kəndlərin adlarının dəyişdirməyə başlamışdır. İndiyədək Ermənistanda 702 azərbaycanlı yaşayış məntəqəsinin adları dəyişdirilərək erməniçələşdirilmişdir.

Təkcə XX əsrdə ermənilər havadarlarının köməyi ilə indiki Ermənistan ərazisində azərbaycanlılara qarşı 1905-1906-cı illərdə və 1918-1920-ci illərdə etnik təmizləmə, 1930-cu illərdə kütləvi repressiyalar, 1948-1953-cü illərdə deportasiya həyata keçirmiş və nəhayət, 1988-1989-cü illərdə etnik təmizləməni başa çatdırmağa müvəffəq olmuşlar.

Ümumiyyətlə, son 200 ildə indiki Ermənistan ərazisində iki mindən artıq azərbaycanlı yaşayış məntəqələri müxtəlif yollarla (deportasiyalarla, silah gücünə qovmaqla, soyqırım törətməklə, kəndləri yandırıb xaraba qoymaqla və s.) siyahıdan silinmiş, tarixi Azərbaycan torpaqlarında monoetnik Ermənistan dövləti yaradılmışdır.

Prezident Heydər Əliyevin 26 mart 1998-ci il tarixli "Azərbaycanlıların soyqırımı haqqında" fərmanının imzalanmasından sonra 31 mart 1998-ci ildə Azərbaycan Respublikasının Milli Məclisi xüsusi sessiya keçirmiş, azərbaycanlılara qarşı soyqırım cinayətlərinin cəzasız qalmasını və bu barədə beynəlxalq ictimaiyyətdə məlumatın olmamasını nəzərə alaraq, beynəlxalq təşkilatlara müraciət etmişdir ki, XIX-XX əsrlərdə erməni millətçilərinin və onların havadarlarının azərbaycanlılara qarşı törətdikləri soyqırım cinayətini tanısın. Bu istiqamətdə artıq müəyyən nəticələr əldə edilmişdir. Analoji addımın azərbaycanlıların Ermənistan ərazisindən 1988-1989-cu illər deportasiyası və etnik təmizlənməsi ilə bağlı atılması da zəruridir.

18 sentyabr 2013-cü ildə Prezident İlham Əliyev Quba Soyqırımı Memorial Kompleksinin açılışında sözlərini hər bir azərbaycanlıya, hər bir ziyalıya ünvanlayaraq demişdir: “Azərbaycanın ərazi bütövlüyü tam şəkildə bərpa edilməlidir, Şuşada, Xankəndidə Azərbaycanın dövlət bayrağı qaldırılmalıdır və gələcəkdə azərbaycanlılar bütün tarixi torpaqlarında yaşamalıdırlar. Bizim tarixi torpaqlarımız İrəvan xanlığıdır, Göyçə, Zəngəzur mahallarıdır. Vaxt gələcək biz orada da yaşayacağıq. Mən buna inanıram, buna əminəm. Buna nail olmaq üçün hər birimiz öz səylərimizi qoymalıyıq, hər birimiz öz işimizlə o müqəddəs günü yaxınlaşdırmalıyıq.”

Hesab edirəm ki, Eldar müəllimin bu kitabı sözün müstəqim mənasında erməni vandallarına qarşı ittiham aktıdır! Tarixi torpaqlarımızı unutmamaq və əzəli torpaqlarımıza Böyük Qayıdış üçün bir çağırışdır!

Gözlərin nurlu, qələmin iti, sözün kəsərli, canın sağlam olsun, əziz dostum!

**Nazim MUSTAFA,**
*AMEA A. A. Bakıxanov adına Tarix İnstitutunun elmi işçisi,*
*Dövlət mükafatı laureatı*

# FACİƏNİN MÜQƏDDİMƏSİ

Artıq xeyli vaxtdır ki, Azərbaycan xalqı erməni hiyləsi ilə çəpərlənmiş böhtan burulğanında sağa-sola əl atır, bu xəyanət dünyasının dərin girdabından xilas olmağa, əvvəlcədən odu qalanmış bir ocağın qızarmış közündən uzaqlaşmağa çalışır. Ancaq şeytan barmağı ilə idarə olunan bu kələkdən qurtara bilmir ki, bilmir. Qurtara biimir ona görə ki, iki yüz ilə yaxındır erməni millətçiləri Azərbaycan xalqına qarşı hər cür təcavüz hazırlayır və həyata keçirirlər. Torpaq hərisliyi insani keyfiyyətlərini itirmiş erməni millətçilərini minbir oyundan çıxmağa vadar edir. Onlar türklərdən torpaq qoparmaq üçün öncə mayası yalan, cövhəri böhtan olan oyuna girişmişlər. Tarixin bütün dövrlərində haqq heç vaxt haqq ilə vuruşa girməyib, əksinə, haqq-nahaqla vuruşub. Ədaləti yıxmaq, daha doğrusu, məhv etmək üçün nahaq əliqılınclı hücum çəkir. Haqqı məhv etməkdən ötrü nahaq yüz fitnə-fəsada əl atır.

Bu günün daşına qədim yamaqlar vurulmuş saxta daşlardan başqa heç bir tarixi həqiqətə arxalanmayan erməni millətçiləri torpaq iddialarına hər vasitə ilə haqq qazandırmağa çalışırlar. Son məqsəd azərbaycanlılar yaşayan Zəngəzurdan Göyçəyə, Dağborçalıdan Dərələyəzə, Dərəçiçəkdən Vedibasara, Zəngibasardan Ağbabaya kimi sahib olmaq idi. Oldular da. Deyirlər, haqq nazilər, üzülməz. Lakin gozumuzün qabağında haqq nazildi, nazilə-nazilə də üzüldü.

Özlərinə böyük dövlət yaratmaq istəyi ilə vurnuxan ermənilər Messopotamiyada aşıqlarını sorumuş, Kilikiyada (1266-cı il) siyasi oyunlar təşkil etmiş, Türkiyədə, Qafqazda minbir fırıldaqdan

çıxmışlar, lakin kələkləri baş tutmamışdır. Əsrlər boyu Ermənistan dövləti yaratmaq xülyası ilə yaşayan ermənilər yeri gəldikdə bütün vasitələrdən istifadə etməyi qarşılarına məqsəd qoymuşlar.

XIX əsrin əvvəllərində Rusiya ilə İran arasında baş verən müharibədə ermənilər ruslarla "dil tapmağa" üstünlük verdilər. Müharibə boyu Rusiyanın "qoltuqağacı"na çevrilən ermənilər İranda və Azərbaycanda təxribatlar törədir, qanlı qırğınlara rəvac verirdilər. Rusiya ilə

İran arasında gedən müharibənin ağırlığı, əsasən, İrəvan xanlığının üzərinə düşürdü. 1805-ci ildə ruslar İrəvan xanlığına qarşı ardı-arası kəsilməyən hücumlara başladılar. Demək olar ki, rus qoşunlarının "bələdçiləri" bütövlükdə ermənilərdən ibarət idi. Azərbaycan tarixində şanlı qəhrəmanlıqlar göstərmiş Hüseynqulu xan və qardaşı Həsən xan güclü rus ordusuna qarşı mərdliklə müqavimət göstərirdi. Bu vaxt Abbas Mirzə İrandan böyük qoşunla İrəvan xanının köməyinə gəldi. Tələfat böyük olsa da, tərəflər üstünlük qazana bilmədilər. Bu döyüşlərin nəticələri haqqında **General- leytenant P. D. SİSİANOV** deyirdi:

*- "Özümə baxanda ürəyim ağrıyır. Mənim 30 illik xidmətim ərzində ilk dəfədir ki, (Rus ordusunun tarixində isə ikinci generalam ki,) mühasirəyə alınmış şəhəri fəth etmədən qoşunları geri çəkdim".* **(İrəvandakı məğlubiyyətdən sonra Sisianovun İmperatora yazdığı məktubundan.)**

*General- feldmarşal* ***İ.V.Qudoviç*** *isə Sisianovdan 4 il sonra- 1808-ci ildə İrəvana hücum edən, 30 illik təcrübəyə malik bu məşhur rus generalı Həsən xanın ordusu ilə üzbəüz vuruşda 1000 nəfərdən artıq itki verib, öz sələfindən də betər rüsvayçı vəziyyətdə məğlub olub geri qayıdaraq istefaya cıxır.*

Böyük sərkərdə, mərd və cəsur Hüseynqulu xan (qardaçı Həsən xanla birlikdə) ilə rus qoşunu arasında 22 il şiddətli döyüşlər getmiş və görkəmli sərkərdənin başçılığı ilə onun qoşunu 1827-ci ildə rusları məğlub etmişdir.

General Paskeviç rusların bu məğlubiyyətindən qəzəblənərək güclü qoşunla İrəvan qalasına hücuma keçdi. Uzunillik müharibələr və köməksizlik öz nəticəsini verdi. Sonuncu imkanına qədər qətiyyətlə vuruşan Hüseynqulu xanın qoşunu məğlub oldu. Beləliklə, İrəvan qalası rusların əlinə keçdi.

1828-ci il mart ayının 20-də I Nikolay Türkmənçay müqaviləsini təsdiq etdi. Cəmi bir gün sonra erməni vilayətinin yaranması haqqında qərar imzaladı. Beləliklə, qədim Azərbaycan torpağının bətnindən erməni vilayəti adı altında Ermənistan adlı bic bir ölkə doğuldu. Dərhal İrəvan xanlığı ərazisində erməniləşdirmə siyasəti başladı. Çar nümayəndələri ermənilərin qulağına pıçıldadılar ki, "bir kəndiniz ala dağda, bir kəndiniz rapa dağda" olmaqla bu vilayəti qoruyub saxlaya bilməzsiniz. Odur ki, toplaşın İrəvan, Gəncə, Qarabağ ərazilərinə. Çar özü bu köçürməyə, ermənilərin Azərbaycan ərazisində münbit torpaqlarda və strateji nöqtələrdə yerləşməsinə kömək etdi. Bu məqsədlə xəzinəsindən böyük miqdarda qızıl pul xərclədi.

İrandan, Türkiyədən, Suriyadan və başqa ölkələrdən gələn ermənilər asta-asta ayaqlarına yer elədikdən sonra başladılar yunan va alban abidələrinə "erməni yamağı" vurmağa. Nə qədər qədim abidələr vardısa, hamısına erməni əlifbası ilə yazılmış daş yamadılar.

1920-ci ildə xarici dövlətlərin himayəsi ilə Ermənistan adlı respublika dünyaya gəldi. Əslində, Cənubi Azərbaycanla Şimali Azərbaycanın və Türkiyənin arasına Ermənistan "göydən" düşdü.

“Ayağıma yer elərəm, gör sənə neylərəm” prinsipi ilə yaşayan daşnaklar bütün vasitələrə al atdılar. Maddi-mədəniyyət abidələrini özününküləşdirmək üçün cürbəcür oyunlardan çıxdılar.

Dərələyəz camaatının gözü qabağında Ortakənd kəndində olan alban abidəsinə ”erməni yamağı” vurdular. Sonra isə dünyaya yaydılar ki, ay dadi-bidad, bu abidə 700 il bundan əvvəl yaradılmış Qladzor universitetidir. Heç kəs də onlardan dəlil-sübut tələb etmədi. Demədilər ki, 1300 il əvvəl buranın sakinləri türklər olmuşdur...

1988-ci il hadisələrindən cəmi üç-dörd il əvvəl Krasnoselo rayonunun Cıvıxlı kəndi yaxınlığında qədim Bizans abidəsi aşkar edildi. Yerli ermənilərin də fikrincə, abidə yunan mədəniyyətinə məxsusdur. Lakin az vaxt ərzində “müəyyənləşdi ki” bura Ermənistanda xristianlığın ilkin ocaqlarından biri olmuşdur.

XVI əsrdə Şah Abbas tərəfindən tikilmiş ”Şah Abbas karvansarası” xalqımızın nadir maddi-mədəniyyət abidələrindən biridir. Göyçə mahalı ilə Dərələyəz mahalları arasında ”Səlim gədiyi” adlanan yerdə ucaldılmış bu abidənin sinəsinə son vaxtlar ”xaç” dağı çəkilməyə başlanmışdı. Bu arada ərəb əlifbası ilə yazılmış daş kitabə “müvəqqəti” olaraq çıxarıldı və sonra bir də yerinə qaytarılmadı. Bundan sonra gəl sübut elə ki, ”Səlim gədiyi”ndəki abidə ”Şah Abbas karvansarası”dır.

Bir çox mahallarda xristianlığa aid abidələrin azlığı, yaxud yoxluğu erməniləri son vaxtlar çox narahat edirdi. Buna görə gizli yollarla xaç daşları gətirib kəndlərdə qurmağa, sonradan isə onları ”aşkar edib” maddi-mədəniyyət abidəsi kimi qeydə almağa başladılar.

Göyçə mahalındakı Ardanış kəndinin qənşərində olan dağın belində ta qədimdən bəri ”Ocaq” deyilən ziyarət yeri var. Kənd camaatının gözü önündəcə vertolyotdan ermənilər oraya nə isə töküb gedirlər. Bunu yoxlamaq istəyən uşaqlar dərhal özlərini

”Ocağ”a yetirirlər. Çatanda görürlər ki, ermənilər çoxlu xaç daşı gətirib töküblər. Bu növbəti xəyanəti dərk edən uşaqlar başlayırlar xaç daşlarını dağdan üzüqoylu hellən qoymağa.

Belə bir tarixi saxtakarlığın Qazax, Kəlbəcər, Gədəbəy camaatı da dəfələrlə şahidi olmuşdur. Əskipara kəndi yaxınlığındakı alban kilsəsinə ermənilərin gizli yolla xaç düzəltməsi, Gədəbəy, Kəlbəcər qayalarına erməni naxışı vurmaq və onların fotosurətini götürüb Amerikadan belə yaymaq tarixi saxtakarlıqdan başqa bir şey deyildir.

Əgər bu gün Ermənistan dediyimiz əraziyə on il əvvəl səyahətə çıxsaydıq üç yüzdən artıq türk mənşəli yaşayış məntəqəsinə rast gələrdik. Qırx il əvvəl isə bu rəqəm iki dəfədən də çox olardı. Əsrin əvvəllərində isə Ermənistan ərazisindəki kənd və qəsəbələrin ümumi sayının 70%- ni türk mənşəlilər təşkil edirdi.

Qaraqoyunluların (1410-1467) hökmranlığı dövründə Çuxursəd vilayətinin inzibati mərkəzi olmuş İrəvan əsrlər boyu müsəlman şəhəri olmuşdur. İrəvan haqqında olan yüzlərlə tarixi həqiqətlərdən birinə nəzər salaq:

“Burada (**İrəvanda- E. İsmayıl**) yaşayan əhalinin sayı və milli tərkibi haqqında ilk və nisbətən dəqiq məlumatı birinci dəfə İ. Şopen vermişdir. Onun hesablamalarına görə, son sərdar zamanı İrəvanda 2400 ailə, 12 min nəfər yaşamışdır. Şəhər ruslar tərəfindən alınandan sonra yerli kübar ailələrin bir qismi İrana köçmüş, ermənilər isə İrandan və Türkiyədən buraya gəlmişlər. Müharibənin sonunda (1828) əhalinin milli tərkibi belə olmuşdur: azərbaycanlılar - 1807 ailə, 7331 nəfər, ermənilər 567 ailə, 2369 nəfər” (**Bax, Sovet Ermənistanında Azərbaycan kitabı. 1925 - 1985, Yerevan 1985, səh. 12**).

Bu şəhərdə doqquz məscidin olması da İrəvanı bizə bütövlükdə

Azərbaycan şəhəri kimi təqdim edir:

**Göy məscid, Şəhər məscidi, Zalxan məscidi, Günlüklü məscid, Novruzəli məscidi, Günbəzli məscid, Hüseynəli məscidi, Qala məscidi. Hacı bəyin məscidi və s.**

İrəvan şəhərində olan 9 məsciddən son vaxtlar yalnız biri xidmət göstərirdi. Bu məscidə Hacı Cəfər məscidi, yaxud ”Günlüklü məscid” deyirdilər. Sonralar bu məscid “Dəmir bulaq məscidi” kimi rəsmləşmişdi.

Məscid 1327-ci ildə (Hicri) İrəvan şəhərinin sakini Hacı Cəfər tərəfindən tikilmişdir.

İndiki Ermənistana xaricdən ermənilərin axını təsadüfi xarakter daşımırdı. Çağırışla gələn ermənilər planlı şəkildə yerləşdirilirdi. Bu tədbir xüsusilə Ermənistanda Sovet hakimiyyəti qurulduqdan sonra mütəşəkkil qaydada həyata keçirildi. Təkcə İrəvan şəhərində yerləşdirmə məkrli siyasət yeridən, hiyləgər erməni millətçiləri üçün bir o qədər də sərfəli deyildi. Ona görə də Ermənistan respublikasının hər tərəfində ermənilər üçün yaşayış məntəqələri yaradılırdı. Bu dövrlərdə daşnakların törətdiyi qırğın zamanı (1918-1920) yurd-yuvasından didərgin düşmüş azərbaycanlılar da öz evlərinə qayıdırdılar. İndiki Ermənistan rayonlarının əksəriyyətində cəmi bir-iki erməni kəndi, qalanları isə türk kəndləri idi. Ona görə də köçkün erməniləri yerləşdirmək heç də asan məsələ deyildi. Bu zaman böyük problemlər üzə çıxırdı.

**Rza Vəlibəyov “Keçmişdən səhifələr”**[1] kitabında Vedi rayonu barədə yazır:

*“Qaçqınlıqdan qayıdan azərbaycanlı əhalisi öz kəndlərində və xarabalarında yerləşib, sonralar həmin xarabaları tədricən bərpa edirdi. Türkiyədən qaçmış mühacirlərin yerləşdirilməsi isə olduqca ağır bir iş idi. Onlar üçün ayrı kənd verilməsi və yaxud yeni kənd salın-*

1 **Rza Vəlibəyov “Keçmişdən səhifələr”, Yerevan, 1969, səh. 77.**

*ması haqqında söhbət ola bilməzdi. Onun üçün nə vaxt, nə də maddi imkan vardı. Söhbət onları mövcud olan yaşayış məntəqələrində yerləşdirməkdən ibarət idi. Həm də onlar rayonun dağlıq hissələrində yox, aran hissələrində yerləşdirilməli idilər. Rayonun aran hissəsində iki erməni kəndindən - Dəvəli və Reyhanlıdan başqa qalan bütün kəndlər azərbaycanlı kəndləri idi.*

*Dövlət sərhəddi olan Araz çayının sahilindəki Alməmməd və Şidli kəndlərindən başqa rayonun aran hissəsindəki kiçik Vedidən başlayaraq Çimən kəndinədək bütün azərbaycanlı və erməni kəndlərinə mühacir ermənilər yerləşdirildi".*

Demək olar ki, bütün rayonlarda vəziyyət Vedidə olduğu kimi cərəyan edirdi. Qəmərli (Artaşat 1950) rayonunda olan altmış iki kənddən ikisi aysoru, ikisi isə erməni kəndləri olduğuna görə qaçqın ermənləri yerləşdirmək çətinlik törədirdi. Səbəbi o idi ki, azərbaycanlılar erməniləri öz kəndlərində yerləşdirməkdən imtina edirdilər.

Yaxşı bilirdilər ki, gələcəkdə ermənilər onlara bir kələk qurub, sıxışdıracaqlar. Lakin bu iş çox ustalıqla həyata keçirilirdi. Eləcə də Ermənistanın hər tərəfində qaçqın ermənilər çox səylə yerləşdirilirdi. "Köhnəlikdən xilas olmaq" pərdəsi altda "inqilabçı" ermənilərin adı azərbaycanlı kəndlərinin yaxasından asılır və gizli bir hiyləgərliklə kəndlərin adları dəyişdirilirdi.

Basarkeçər, Krasnoselo, Axta, Allahverdi, Kalinino, Əzizbəyov, Sisyan, Gorus, Qafan, Amasiya, Hamamlı, Zəngibasar, Kəvər, Qaranlıq və başqa rayonlarda ermənilərin yerləşdirilməsi prosesi əsrin əvvəllərindən başlamış əllinci illərə kimi fırıldaqla davam etdirilirdi. Bu dövrdə erməni millətçilərinin öz

qarşılarına qoyduğu iki vəzifə diqqəti xüsusilə cəlb edirdi: **Birincisi-** Ermənistanda ermənilərin sayını hər vəchlə artırmaq (yəni tədricən erməniləri xaricdən Ermənistana gətirmək, Azərbaycan türklərini Ermənistandan köçürmək yolu ilə), **İkincisi-** şantajla torpaqlar mənimsəmək və Dağlıq Qarabağın Ermənistanın tərkibinə keçməsi üçün tədbirlər hazırlamaq.

İki əsrdir ki, erməni millətçiləri Azərbaycan xalqına qarşı gecəli-gündüzlü məkrli siyasət hazırlamaqla məşğuldur. Belə bir iyrənc siyasət dəfələrlə iki xalqın toqquşmasına səbəb olmuş, kütləvi insan qırğınlarına gətirib çıxarmışdır. Bütün qırğınların törədicisi olan ermənilər həyasızcasına həmişə öz təqsirlərini türklərin ayağına yazmaq üçün ən mənfur yalanlara, fırıldaqlara əl atmalı olmuşlar.

1905-ci ildə törədilən erməni-müsəlman qırğınının ilk plan çəkəni, ilk güllə atanı, qan tökəni ermənilər oldu. Silahlı nizami ordu dinc azərbaycanlıların üstünə yeridildi. Qaçqınlıq bəlası başlandı. Minlərlə insan yurdsuz-yuvasız qaldı. Minlərlə insanın nahaq yerə qanı axıdıldı, yaxud aclıq və səfalətdən məhv oldu.

"Böyük Ermənistan" iddiası ilə yaşayan ermənilər bir-birinin ardınca qanlı qırğınlar törədir, dinc insanları qəddarlıqla qətlə yetirirdilər. 1905 və 1906-cı ildə erməni qaraguruhu Türkiyədə olduğu kimi gah Qarabağda, gah Bakıda, gah İrəvanda, Gəncədə, gah Təbrizdə, gah Naxçıvanda fitnə-fəsad törədir, dinc müsəlmanları rəhmsizcəsinə məhv edirdilər. Həyasızcasına dünyaya yayırdılar ki, müsəlmanlar zavallı erməniləri qırırlar.

Lalayev soyadlı erməni 20-30 nəfərdən ibarət quldur dəstəsi yaradaraq Bakının küçələrində müsəlmanları atəşə tutur, xeyli sayda adam öldürür. Bundan biraz sonra erməni terrorçuları qubernatorun faytonunu bomba ilə partladaraq onu qətlə yetirirlər.

1905-ci ildə İrəvanda müsəlmanların az yaşadığı bir məhəlləyə

hücum edərək günahsız adamları qırmağa başlayırlar. Səlnaməçi qeyd edir ki, müsəlmanlar az olsa da, ermənilərə qarşı böyük müqavimət göstərmiş və mərdliklə vuruşmuşlar. Həmin qeyri-bərabər döyüşdə 40 erməni, 2 müsəlman öldürülmüşdü. Sursatı qurtaran müsəlmanlar məhəllədən qaçmalı olublar. Ermənilər aradan çıxa bilməyən kimsəsiz qadın və uşaqları amansızcasına məhv etmişlər. Bunu eşidən şəhərin ətraf kəndlərindəki müsəlmanlar ermənilərin üstünə yerimiş, aslan kimi qəzəblənmiş müsəlmanlar ələ düşən erməniləri məhv etmişlər.

Qafqaz canişini tez işə qarışmış, Şeyxulislamı və katalikos Hayriki işə qoşmuşdur. Ermənilərə qarşı başlanan hücum qısa vaxtda dayandırılmışdır. Halbuki müsəlmanlr qırğına məruz qaldıqda Qafqaz canişini hər şeyi görməzliyə vurmuş, səsini belə çıxarmamışdır.

Ermənilər illərdən bəri əldə etdikləri silahlarla silahlanaraq 1905-ci ildə Naxçıvanda qəflətən dinc müsəlmanların üzərinə hücuma keçdilər. Canı boğazına yığılmış Naxçıvan əhalisi balta, bel, daş, dəmir götürərək quduzlaşmış ermənilərin üstünə atılıb, onları tərksilah eləyib məğlubiyyətə düçar etdilər. Müsəlmanlar bundan sonra erməni kəndlərinin üstünə yeridilər. Böyük Badamlı kəndinin erməniləri irəli yeriyib, kəlmeyi-şəhadət oxuyub, müsəlmanlığı qəbul etdiklərini bildirdilər. Müsəlmanlar böyük ehtiramla geri döndülər. Dondan- dona girməyi

şeytancasına bacaran ermənilər yenə də müsəmnları aldatdılar.

Naxçıvanda, İrəvanda və Bakıda dinc əhalinin ermənilər tərəfindən qətlə yetirildiyini eşidən Təbriz camaatı böyük bir qətiyyətlə ermənilərin üstünə hücuma keçdilər. Bu vaxt hay-küy salan, ağlayıb-sızlayan ermənilər qaçıb gizlənməklə Təbriz hakimindən kömək istədilər. Təbriz haki-

mi böyük mərhəmətlə onların sağlamlığını qoruyub saxladı.

1905 və 1906-cı illərdə ermənilər Şuşada da iğtişaşlar yaratdılar. Onların məqsədi Şuşanı ələ keçirmək idi.

Ermənilər istər Bakıda, istər İrəvanda, istərsə də Şuşada və başqa yerlərdə iğtişaşlar yaradır, məğlub olduqda isə müsəlmanları dilə tutur, bunu bir neçə yaramazın adına yazırdılar. Lakin ara sakitləşəndən sonra yeni qüvvə toplayıb, başqa bir təcavüzə əl atıb yeni hadisə törədirdilər.

1905-1907-ci illərdə Gəncədə, Naxçıvanda, Gümrüdə, İrəvanda, Şuşada baş verən bir çox toqquşmalar nəticəsində xeyli sayda günahsız Azərbaycan türkü məhv olmuşdur. Göyçənin 120-dən artıq kəndi dağılıb, əhalisi qaçqın düşmüşdür.

1905-ci il inqilabı geniş vüsət sldığı bir vaxtda çarizm Qafqazda inqilabı boğmaq məqsədi ilə xalqlar arasında düşmənçilik toxumu səpirdi. Öz işğalçılıq siyasətini həyata keçirmək üçün ədavətin qızışdırılması ermənilərin ürəyindən idi. Ermənilər onsuz da qırğın törətməyə hazırlıq görür və Qafqazda müstəqil dövlət yaratmağa can atırdılar. Belə düşünürdülər ki, müharibə edib kim qalib gələrsə, Qafqaz müstəqil olduqda həmin millət hakim olacaqdır.

Nəhayət, 1905-ci ildə çar imperiyasının köməyi ilə ermənilər Azərbaycan kəndlərinə hücuma keçdilər. Qəsbkar rus ordusu ermənilərə yaxından kömək edirdi. Bu dövrdə çarın əmri ilə Azərbaycan türklərinə silah gəzdirmək qadağan edildi. Ermənilər Azərbaycan torpaqlarına hücum edib qan tökür, qarət eləyir, talanlar törədir, digər tərəfdən də azərbaycanlıları "vəhşi" adlandıraraq erməniləri qırmaqda suçlandırırdılar. Demək ermənilərin gücü də, hünəri də, qoçaqlığı da Rusiya və digər böyük xristian dövlətləri ilə əlaqəli idi.

Hələ 1904-cü ildə ermənilər azərbaycanlıları dövlət

əleyhinə qaldırmağa çalışırdılar. Eyni zamanda onları hədələyirdilər: **“Əgər bizə qarışmasanız biz sizin qanınız ilə yeri doyuracağıq və sizin millətinizə od vurub dünyanı oda salacağıq”. (“Həyat”, 1905, N-30).** Ermənilər xristian aləmində yayırdılar ki, bizim müsəlmanlarla apardığımız müharibə yalnız xristianlığı “müdafiə” məqsədi güdür. Orada deyilirdi:

**“Aman, biz ermənilər cəmi xaçpərəstlərin üzərinə hücum edən hilali taleyin qabağında, önündə mətin bir sədd kimi dayanıb onları mühafizə edir və ona görə də ümumsəlib oyun və xüsusən ruslar gərək bizə hami olsun”. (“Həyat” 1906, N-46).**

Rusiyadan hərbi və maddi yardım alan, təpədən dırnağadək silahlanmış ermənilər heç bir hazırlığı olmayan, silahsız azərbaycanlıların üzərinə hücuma keçdilər. Zəngəzur, Vedibasar, Zəngibasar, Dərəçiçək, Göyçə, Qaraqoyunlu, Pəmbək mahallarında azərbaycanlılar nizami ordu tərəfindən məhv edilirdi. Ermənilərin törətdikləri qarət və talanlar namərdcəsinə həyata keçirilirdi.

Zəngibasarın Xırda Şöllü (Dəmirçi) kəndinin ağsaqqalları ilə “dil tapan” ermənilər onları sülhə çağırırlar. Və razılığa gəlirlər ki, Hacı Elləz kəndi (Daragert) yaxınlığındakı qumluqda danışıqlar aparılacaqdır. Nümayəndələr ağ bayraqla oraya toplaşsınlar. Türk kəndlərinin nümayəndələri ağ bayraqla sülh çağırışına gedərkən xain və hiyləgər daşnaklar tərəfindən gülləbaran edilirlər. Ən acınacaqlısı o idi ki, hamilə qadınları nizələrə taxır, uşaqların və qocaların başını kəsir, ümumiyyətlə, azərbaycanlıları vəhşicəsinə məhv edirdilər, həm də öz güclü təbliğatları ilə özlərinin törətdikləri bu vəhşilikləri türklərin ayağına yazırdılar.

1905-ci il hadisələrində indiki Ermənistan ərazisindən

350 mindən artıq Azərbaycan türkü yerindən-yurdundan didərgin düşüb dağa-daşa səpələndi. Bu ağır müharibədə 150 mindən artıq azərbaycanlı məhv edildi. Evindən-eşiyindən amansız zülümlə qovulan azərbaycanlılar Azərbaycana, İrana, Türkiyəyə və Orta Asiya ölkələrinə yayıldılar

Dişini ac yalquzaq kimi Azərbaycan xalqının üstünə qıcamış erməni cəlladları talanlar, qarətlər törətməkdən doymayıb, azərbaycanlıları diri-diri yandırmaqla namərd düşmən simasını nümayiş etdirdilər.

Həmişə güclülərin qulu, gücsüzlərin qatili rolunu ifa eləyən erməni millətçiləri Türkiyə dövlətinə dəfələrlə xəyanət etmiş, onu müharibələrə qoşmaqdan ötrü simasız və satqın qonşu olduğunu təsdiqləmişdir.

1918 - 1920-ci illərdə daha böyük cinayətin törədicisi olan ermənilər ingilis və rus silahı ilə silahlanaraq dinc azərbaycanlıların üstünə nizami qoşunla hücum çəkdilər. Məqsəd ön planda Ermənistan dövləti yaratmaq və "Böyük Ermənistan" üçün zəmin hazırlamaq idi. Belə bir alçaq niyyətə xidmət edən quduz Andronikin başçılıq etdiyi daşnak cəlladları Zəngəzur,Vedibasar,Dərələyəz, Zəngibasar və Sərdarabad ətrafında kəndlərə od vura-vura irəliləyirdi. Qarabağlar da daxil olmaqla Gərnibasara çatana kimi iki yüzdən artıq kənd odlara qalandı.

Qədili, Qaraxaç, Zar, Nurnus, Ozannar, Sabunçu, Gümüş, Qızılörən və başqa kəndlərin külü qalmışdı. Ərzinə (indiki "Arzini" sanatoriyası) yaxınlığında yerləşən Ozannar kəndi 1918-ci ildə çox böyük qəddarlıqla yandırılıb məhv edildi. Ulu ozanlarımızın yadigarı olan və min ildən artıq yaşa malik bu kəndin çoxlu mədəniyyət abidələri sıradan çıxarıldı, xarabalıqlarına gətirilib xaç daşları atıldı. Qarakilsənin (indiki Kirovakan) Vartana kəndi yerli-dibli viran edildi. **Haqqıxlı** kəndində (indiki İcevan rayonu) 71 nəfər sayseçmə

adamı iclas adı altında yığıb odladılar. Basarkeçərdə Şişqaya kimi böyük bir kənd viran edildi. 700 nəfərə qədər azərbaycanlı yandırıldı. Öldürülənlərin yarıdan çoxu qadınlar və uşaqlar idi.

Yeri gəlmişkən qeyd edim ki, bu qanlı qırğının təşkilatçılarından biri daşnak sərkərdəsi Sulikov Zodda öldürüldü və daşnak qoşunu burada ciddi əks-zərbəyə məruz qaldı.

Nijdeyin və Vahramın boyük ordu ilə Göyçəyə yeriməsi qanlı divana çevrildi. Əvvəlcə çox mərdliklə vuruşan xalq nizami ordusu və kifayət qədər güclü silahı olmadığına görə məğlub oldu. Bundan sonra daşnaklar tutduqları azərbaycanlı kəndlərində hərbi postlar qoydular, kəndlər arasında gediş-gəlişi kəsdilər, kütləvi xərac yığmağa və kəndləri soyub-talamağa başladılar. Digər tərəfdən də qan axıdılması ara vermirdi. Aşıq Ələsgərin sevimli şəyirdi, bülbül səsli Aşıq Nəcəfin kürəyinə odlu samovar bağlayıb işgəncə ilə öldürdülər. Təbii haldır ki, milli ordusu olmayan vəziyyətdə mahallar bir-birinə kömək əli uzada bilməzdi.

Göyçə gölünün sağ cinahında olan kəndlər dağıdılandan sonra gölün üzü ilə çoxlu qayıq təşkil edib sol cinahda yerləşən - Toxluca, Ağbulaq, Ardanış, Cil, Babacan və Pəmbək kəndlərini atəşə tutmalı oldular. Qayıqdan atılan top atəşi bu kəndlərin camaatını sarsıda bilmədi. Əslində düşmən güclü müqavimətə rast gələrək bir neçə qayığı batırıldıqdan sonra geri qayıtmağa məcbur oldu.

Basarkeçərdən tutmuş ”Çayqarışan”a qədər xalq daşnaklara qarşı igidlik və mərdlik göstərirdi. Qaraqoyunlu dərəsində meşə boyu fəaliyyət göstərən dəstələr güclü düşməndən ötrü əməlli-başlı əngələ çevrilmişdilər.

Hacımuğanlı Qaçaq İbrahimin, Dərəli Tahar Eyyubovun, Basarkeçərdən Ələsgəroğlu Bəşirin, Məşədi İsanın, Kor Hümbətin, Cığal Həsənin, Topal Orucun, Dəli İsmayılın, Məşədi Hümbətin,

Kalvayı Abbasəlinin, Qəhrəmanın, Qaraqoyunlu dərəsindən Mehrəli Kovxanın, Hasança Paşanın, Mağlar Usufun dəstələri daşnak quldurlarına qarşı qətiyyətlə vuruşmuş, şücaət və dönməzlik göstərmişlər.

Lakin qeyri-bərabər vuruşun nəticəsi özünü göstərdi. Belə bir vəziyyət, ilk növbədə, Azərbaycan mahallarının bir-biri ilə zəif əlaqədə olması və bir mərkəzdən idarə olunan milli ordunun yoxluğu ilə bağlı idi. Məlum həqiqətdir ki, hərə öz kəndini qorumaqla düşmənə qalib gəlmək mümkün deyildi. Ona görə də nizami daşnak ordusu kütləvi insan qırğınına nail oldu.

Andronikin qatil sərkərdələrindən biri - **mayor Vahram yazır:** ***"Mən türk əhalisinə Basarkeçərdə olmazın divan tutdum, ancaq bəzən gülləyə heyfim gəlirdi. Axı, bu itləri qırmaq üçün ən yaxşı vasitə odur ki, hər bir döyüşdən sonra sağ qalanları yığışdırıb, diri-diri quyulara doldurub üstündən də ağır daşlar qoyasan. Mən eləcə də elədim. Bütün kişiləri, qadınları və uşaqları diri-diri quyulayaraq birdəfəlik qurtardım... (Bax:A. Lalayan, «Kontrrevolyusionnıy daşnaksutyun i imperialistiçeskaya voyna 1914-1918 q.q." "Revolyusionnıy Vostok" jurnalı N 2, 3, 1936).***

Vahramın yazdığına görə, Göyçədə altmış minə qədər türk öldürülmüşdür. 1919-cu ilin aprelində dağlardan aşan azərbaycanlılar borana düşüb, külli miqdarda tələfata uğramışlar. Böyük Qaraqoyunlunun yaxınlığında olan "Sümüklü dərə"nin adı da bizə tarixin məhz həmin acı faciələrindən yadigar qalmışdır. Boranda qırılan qaçqınların sümüyü bu günə kimi «Sümüklü dərə"də qalmaqdadır.

İndiki Ermənistan ərazisində 1918-1920-ci illərdə daşnaklar 150 mindən artıq azərbaycanlını qırğına çəkərək, minbir əzabəziyyətlə didərgin saldılar. Bu vaxt Zəngəzur mahalı da başdan-ba-

şa daşnak əsgərlərinin qəddarlığına məruz qaldı.

Daşnakların hücum planı bütün mahallarda eyni xətt üzərində həyata keçirilirdi. İstər Vedibasar olsun, istərsə də Dərəçiçək, Ağbaba, Ələyəz, Pəmbək, Dağborçalı mahallarında da qan su yerinə axır, on minlərlə türk heç bir günahı olmadan Andronikin gülləsinə tuş gəlirdi.

Daşnakların Azərbaycan xalqına tutduğu divan heç də yerdə qalmamışdır. Bu qisas Abbasqulu bəy Şadlinski tərəfindən alınmışdır demək azdır, daşnakların darmadağın edilməsində xalqımızın bu qeyrətli oğlunun böyük əməyi olmuşdur.

**R. Vəlibəyovun "Keçmişdən səhifələr" kitabında oxuyuruq: *"Vedi rayonunun əhalisi dəmir yolu boyu yerləşmiş və mövqe tutmuş Qızıl Ordu və partizan hissələrinə yaxından kömək edirdi. Abbasqulu bəy Şadlinskinin məşhur "Qırmızı tabor"u Qəmərli cəbhəsində və Zəngəzurda daşnakların darmadağın edilib sərhəddən kənara tullanmasında göstərdiyi igidlik və şücaət üçün həmin taborun çoxsaylı döyüşçüləri və qəhrəman komandiri "Qırmızı Bayraq" ordeni və müxtəlif medallarla təltif edildilər."*[2]**

Daşnaklar Ermənistandan xaricə qovulandan sonra iki millət arasında dinclik, əmin-amanlıq yaranmağa başladı. Bu dəfə onlar cildini dəyişdilər. İkiüzlülüyü məharətlə bacaran daşnaklar indi sosializm cəbhəsində cəmləşir, kommunist partiyası sıralarına keçir və kommunist rolunda çıxış edirdilər. Əlaltından yenə Azərbaycana qarşı fitnəkar tədbirlər hazırlanırdı. Kommunist pərdəsi altında, xalqlar dostluğundan danışa-danışa daşnak barmağı yüz yuvaya uzanırdı. Azərbaycanın və Azərbaycan xalqının yönünü milli zəmindən uzaqlaşdırmaq, öz soykökünə yadlaşdırmaq kimi çox

2 **"Keçmişdən səhifələr", səh. 21.**

ciddi əməliyyatlar həyata keçirirdilər. Qeyd etmək lazımdır ki, panturkizm və panislamizm terminlərinin yaradıcısı da məhz onlardır.

Qəribə orasıdır ki, otuzuncu illərdə anadan olanların ata-anaları yaş kağızında və təsərrüfat kitabında türk yazıldığı halda, özləri azərbaycanlı yazıldılar. Ata türk, oğul azərbaycanlı...

Başqa bir cinayət - yetmiş ildə üç əlifbadan istifadə edilməsi xalqımıza qarşı məkrli siyasətini əyani sübutuna çevrildi. Beləliklə, ermənilərin qurduğu tələ, çəkdiyi plan əsasında Azərbaycanın minlərlə istedadlı oğul və qızı represiya dövrünün qurbanı oldu. Azərbaycanda gedən ictimai-siyasi prosesin bütün variantlarında erməni barmağı olmamış deyildi.

Ermənistandakı azərbaycanlı ziyalılar bir ucdan sıxışdırılır, gözümçıxdıya salınır, ya tutulur, ya da biryolluq aparatdan uzaqlaşdırılırdı. Əvvəllər Krasnoselo və Basarkeçər rayonlarının birinci katibi işləmiş Yunis Rzayev bacarıqlı,qabiliyyətli bir kadr, rəhbər işçi kimi ermənilərin xoşuna gəlmədiyindən bütün Ermənistan ayağa qalxmışdı. Onlar tələb edirdilər ki, Yunis Rzayev həbs olunsun. Bunun üçün ermənilər qabaqcadan böhtan və şər əməliyyatı hazırlamışdılar. Güclü bir kələkdən canını qurtarmaq istəyən Yunis Rzayev Ermənistandan başını götürüb çıxmaq məcburiyyətində oldu.

Məhz savadlı və yetkin rəhbər işçi olan Əli Həsənov və başqaları da belə bir acınacaqlı tale ilə öz dədə-baba yurdunu dünən-srağagün İrandan gəlmiş erməni rəhbərlərinə verib oranı tərk etməli oldular.

Təkcə rəhbər işçilərin deyil; həkimlərin, müəllimlərin, mühəndis işçilərinin öz aqibəti belə kədərli sonluqla yekunlaşırdı.

Azərbaycan xalqına qarşı yürüdülən düşmənçilik siyasəti zəncirvari reaksiya şəklində davam etdirilirdi. Mətbuat, radio və televiziya qatı millətçilik toxumu səpməkdən yorulmurdu. Bu iş çox məharətlə aparılırdı. 1948- 1952-ci illərdə ermənilərin

azərbaycanlılara qarşı pərdəli və qəddar düşmənçilik siyasəti Sovet hökumətinin əli ilə həyata keçirildi. SSRİ Nazirlər Soveti Ermənistan SSR-in 23 rayonundan 150 min azərbaycanlının köçürülməsi barədə bədnam, humanizmə uyğun gəlməyən qərar verdi. Yük vaqonları böyük bir kütləni öz dədə-baba yurdundan uzaqlaşdırdı. Stalinin və A.Mikoyanın məkrli siyasəti ilə Ermənistanda azərbaycanlıların başına açdığı bu oyun 1988-ci il hadisələrinə qədər davam etdi.


Nizami Orucov

Əllinci illərdəki köçürmə əslində sürgün idi. Dağ adamlarını birdən-birə isti aran rayonlarına tökməklə bu işin təşkilatçıları bilirdilər nə edirdilər. Odur ki, külli miqdarda azərbaycanlı qırğına getdi.

1950-ci ilə kimi Ermənistanda azərbaycanlı yaşayış məntəqələri bir-biri ilə əlaqəli idi. Demək olar ki, mahallar biri digərinə söykənirdi. Köçürmə siyasəti bu işdə çox ciddi iş aparmalı oldu. Elə plan tərtib edildi ki, gərək azərbaycanlıların mövcud əlaqələri kəsilmiş olsun. Məsələn, Göyçə gölünün sağ sahili boyunda yaşayan (Kamo və Martuni rayonları) azərbaycanlıları köçürməklə Dərəçiçək, Gərnibasar, Dərələyəz mahalları ilə sol sahil Göyçənin əlaqəsi kəsildi. Qəmərli əhalisi köçürülməklə Zəngibasarla Vedibasarın, Gümrü köçürülməklə Ağbaba ilə Pəmbək və Dağ Borçalının rabitəsi qırılmış oldu. Bu dövrdə təşkil olunmuş köçürmə siyasətində Talin, Artik, Əştərək və Oktemberyan rayonlarında yaşayan azərbaycanlılar tamamilə çıxarıldılar.

Bu yollar 1965-ci ildə birləşməli idi. Çünki həmin vaxt 1915-ci il qondarma erməni qırğınının (əslində deyilən qədər erməni qırılmamışdır, həqiqi mənada iki millət arasındakı münaqişələrdə azərbaycanlıların tələfatı daha çoxdur) əlli illiyini ermənilər qeyd etmək üçün hazırlıq görürdü. Bu dövrdə qaniçən Andronikə bağlı mahnılar oxunur, ermənilər azərbaycanlılarla düşmənçiliyə çağrılırdı.

Durğunluq illəri deyə söydüyümüz bu illərdə ermənilərin qurduqları hiylələr qan tökməyə tərəf can atsa da buna nail ola bilmədilər. Mərkəz bu iyrənc əməliyyatdan xəbər tutan kimi ”iki saat vaxt’ vermişdi. Günahkarlar məsuliyyətə cəlb edilməli idilər. Belə bir tapşırıq yerlərə çatan kimi öz gücünü göstərdi. Dərhal Krasnoselo rayon Daxili İşlər Şöbəsinin rəisi Qaleçyan özünü intihar etmişdi.

Yerli-yersiz özlərindən razılıq hissi ilə söz açan, əsası olmadan lovğalanan ermənilər ruslara qarşı da açıq ürəklə məhəbbət göstərmirlər. Ermənistanda yaşayan ruslar da həmişə sıxıntılara məruz qalırlar. Belə ki, adi mağaza işçisi rusdilli hər hansı bir nəfərə rusca cavab vermir ki, bura Ermənistandır, ermənicə danışmalısan. Əsaslı səmimiyyət hiss etməyən ruslar ona görə də Ermənistanda az yaşayırlar.

Sual oluna bilər ki, əgər başqa xalqlara qarşı Ermənistanda beynəlmiləlçilik hissi zəifdirsə, bəs onda kürd dilində qəzet çıxması, radioda verilişlər aparılması nədən irəli gəlir?

Bu sualın cavabını erməni siyasətinə və daha doğrusu, ”erməni barmağına” bələd olan hər bir adam dərhal dərk etməmiş olmaz. Məlum həqiqətdir ki, ermənilərin kürdlərə olan rəğbətindən heç kəs ürəkdolusu danışa bilməz. Burada kürd dilində qəzet buraxılması özü yalnız Azərbaycana qarşı yürüdülmüş yüzlərlə qərəzli

siyasətdən biridir. Azərbaycanda heç bir ayrı-seçkiliyə məruz qalmayan, əslində azərbaycanlılarla qaynayıb-qarışmış kürdlər yaxşı bilirlər ki, bu "hörmət" hansısa mənfur məqsədə tərəf "erməni barmağıdır'!

Yetmişinci illərdə Azərbaycana qarşı bir qədər üstüörtülü və gizli təcavüzkar planlar hazırlanırdı. Lakin özlərinin dediyi kimi, Sovet dövlətinin varlığı dövründə ermənilərdən ötrü yetmişinci illərin əvvəlindən ta səksəninci illərin ortalarına kimi olan dövr könülaçan olmamışdır. Daha doğrusu, Azərbaycanın başına gətiriləcək fəlakət planını həyatda tətbiq etmək imkanından uzaq olublar... Məhz buna görə də nə eləsələr gülə-gülə eləyiblər həmin günlərdə.

Mərkəzləşmiş xəstəxanalar yaratmaq adı altında azərbaycanlı kəndlərində olan xəstəxanalar bağlanır, 30-40 kilometr rayon mərkəzindən aralıda yerləşən kəndlərin əhalisinin tələb və istəyi nəzərə alınmır, yeri gəldikcə azərbaycanlıların tibbi xidmətdən istifadə etmələri probleme çevrilirdi. Həm də xəstəxanaların kəndlərdən götürülməsi azərbaycanlı həkimlərin işsiz qalmasına və başını götürüb harasa getməsinə səbəb olurdu.

Bakıdan çəkilmiş qaz kəmərləri çox yerdə azərbaycanlı kəndlərinin içindən keçib erməni kəndlərində şölələnirdi.

İdarə və müəssisələrdə azərbaycanlıları süründürməçiliyə salır, saatlarla gözlədirdilər. Əlbəttə, bütün bunlar bürokratiyadan deyil, şovinist millətçilikdən irəli gəlirdi.

Azərbaycanlı mütəxəssislərə Ermənistanda iş verilmədiyinə görə, ali və orta ixtisas məktəblərini bitirən gənclər ya Azərbaycanda qalır, ya da ölkənin digər rayonlarına səpələnirdilər. Azərbaycanda ermənilər çox rahat, ev sahiblərindən qat-qat üstün yaşadıqları halda Ermənistandakı azərbaycanlıların adi sosial imkanları belə,

qənaətbəxş deyildi.

Son zamanlar bacarıqlı və işgüzar azərbaycanlı kadrlar daha çox "gözümçıxdıya" salınırdılar. Xüsusilə, sovxoz direktorları və kolxoz sədrləri (Ermənistandakı azərbaycanlılar üçün bu vəzifələr ən böyük vəzifə sayılırdı) tez-tez dəyişdirilir, daha səriştəli adamlar bir vasitə ilə ləkələndirilir və onlar ermənilər üçün daha sərfəli olan satqın adamlarla əvəz olunurdular.

Bütün iclas və yığıncaqlarda Dağlıq Qarabağın nə vaxt Ermənistana birləşdirilməsi haqda müzakirələr gedirdi. Bu məsələ ilə bağlı aparılan ciddi hazırlıq harada aparılmasından asılı olmayaraq, bütün ermənilərə çatdırılır və onlara geniş təlimatlar verilirdi.

Son illər belə bir müddəa irəli sürməkdən çəkinmirdilər ki, H. Əliyev siyasi bürodan çıxarılan kimi, biz öz məqsədimizə başlayacağıq. Bu, həqiqətən də belə oldu.

1988-ci ilin fevral ayında özülü keçən əsrin əvvəlindən qoyulmuş erməni xəyanətinin daha bir iyrənc variantı ortaya çıxdı. Xəyanətlə birlikdə şər-şamata, böhtan aləmi başına aldı. Əsgəranda qətlə yetirilən iki azərbaycanlının ölümü camaata elan olunana



Şirazlılar Türkiyə sərhəddində

qədər Ermənistan tərəf dünyaya yaydı ki, Qarabağda ermənilərin hüquqları tapdanır, onlar sıxışdırılır və qırılırlar. Üstünə "beynəlmiləlçilik" sözü yazılmış, qəflət balıncından başını hələ qaldırmamış azərbaycanlılar "atılan topların səsinə" diksindilər. Gözlərini açanda gördülər ki, "suveren torpaq"ların üstündə vertolyotlar şütüyür, küçələrində əlisilahlılar dolanır.

Onda tarixin əqrəbi 1988-ci ilin fevralını göstərirdi. Həmin günlər Ermənistan bir nəfər kimi ayağa qalxdı. Dağlıq Qarabağı "Azərbaycandan qoparmaq" yürüşünə başlandı.

Artıq 1987-ci ildə millətçilik çağırışları günü-gündən güclənir, getdikcə açıq şəkil alırdı. Qarabağın Azərbaycandan qoparılması üçün aparılan iş daha da dəyişirdi. Bütün törədiləcək təxribatların planı hazırlanırdı. Xaricdə və SSRİ-də olan ermənilər bütövlükdə gələcək hadisələrə hazırlanırdı. Hər bir erməni bu işdə yüksək səviyyədə iştirakı təbliğ olunurdu. Xüsusilə mətbuat, radio və televiziya işçilərinin çevikliyinə böyük diqqət yetirilirdi. "Daşnak" partiyası daha fəal mövqedə dayanır, bütün sahələrdə Azərbaycana endiriləcək zərbələrin kompleks planını yayırdı. Moskvadakı qəzet, jurnal və televiziya işçiləri "Qarabağ hadisələri"ndə ermənilərin mövqeyini müdafiə etməyə cəlb olunurdu. Ermənistanın zavod və fabriklərində mitinq mədəniyyəti öyrədilir, ermənilər gələcək döyüşlərə hazırlanırdı. Ermənistan mətbuatı, radio və televiziyası öz millətçi çıxışları ilə erməni xalqını Azərbaycanlıların üzərinə hücuma səfərbər edirdi.

Zavodlarda, fabriklərdə, idarə və müəssisələrdə Qarabağın Azərbaycandan ayrılıb Ermənistana birləşdirilməsi barədə əhalidən imzalar toplanırdı. Hətta belə bir həyasızlıq azərbaycanlılardan da gizlədilmir və onlardan da imza toplamağa can atırdılar. Təbii ki,

onlar buna nail ola bilmirdilər.

Ermənistan televiziyası Azərbaycanlılar haqda əks təbliğat aparmaqdan nəinki yorulmur, gündən-günə verilişlərin sayını və təsir gücünü artırırdılar. Ermənistanda yaşayan azərbaycanlılar bütün bu millətçi çıxışları hər gün görür və duyur, erməni millətçilərinin hər iki xalqı bəlaya sürüdükləri günün yaxınlaşdığını Moskvaya və Bakıya qatdırsalar da fikir verən tapılmırdı.

Erməni millətçilərinin məsuliyyətsiz çağırışları elə bir səviyyəyə çatmışdı ki, 1987-ci il iyulun 25-də keçirilən Ermənistan KP MK plenumunda **R.S.Demirçiyan** öz məruzəsində bu məsələyə xüsusi narahatçılıqla toxunmuşdu:

***-“Burjua ideologiyasına qarşı ardıcıl və hücumçu mübarizə təşkil etməklə birlikdə bundan sonra da daşnak təbliğatına qəti cavab vermək, onun hər cür təzahürlərinin insanların şüuruna təsir etməsinin qarşısını almaq gərəkdir və millətçilik toxumları yayan daşnak təbliğatına qarşı əks-təbliğatı gücləndirmək gərəkdir.***

***Ayrı-ayrı adamlar öz çıxışlarında, məqalələrində bəzən saxta vətənpərvərlik göstərir, milli hisslərdən alverçilik məqsədilə istifadə edirlər.***

***Lakin vaxtında onlara cavab verilmir. İş o yerə gəlib çatır ki, günün günorta çağı kollektivlərdə yalançı, çağırılmamış mühazirəçilər peyda olur, müxtəlif məktublar üçün imzalar toplayırdılar. Onlar təəccüb doğuran şübhəli nəşrlərin üzünü çıxarıb yayırlar”.***

Demək qarşıdan gələn erməni xəyanətini K.S.Demirçyan da təsdiq edirdi. Çox təəssüf ki, bu ocağın tüstüsünü Azərbaycan rəhbərliyi görə bilmirdi.

Bəzən ermənilərin dilindən “Qarabağ məsələsi”nin hələ

yetişmədiyi eşidilirdi.

Çox operativ təşkilatçılıq işi aparan “Qarabağ komitəsi”nin fəaliyyət proqramında olan belə bir müddəanı tez-tez eşitmək olurdu. Danışılırdı ki, SSRİ Nazirlər Soveti Sədrinin birinci müavini H. Əliyev Siyasi büronun tərkibindən çıxarılmayınca Dağlıq Qarabağ məsələsi yubadılacaqdır.

İllərdən bəri aparılan hazırlıq işləri çox böyük səbirizliklə hadisələrin başlanacağı günlərə gətirib çıxardı. Artıq fevralın 20-də gərgin günlər başladı. Çoxları gözləyirdi ki, Qarabağda baş verən hadisələrlə hər şey yekunlaşacaq. Ancaq Ermənistandakı azərbaycanlı ziyalılar bilirdi ki, hadisələrə Yerevan da qoşulacaq. Çünki Qarabağ hadisələrinə Yerevan rəhbərlik edirdi.

Bu və ya digər hadisələr ildırım sürətilə yayılırdı. Dağlıq Qarabağda çoxlu ölüm hadisəsi olduğu danışılırdı. Ancaq rəsmi məlumatlara görə sonralar iki nəfər azərbaycanlının öldürüldüyü və bir neçə nəfərin yaralandığı aşkar edildi.

Artıq bu günlərdə Ermənistan televiziya və radiosu bütün verilişlərini məhz Dağlıq Qarabağ hadisələri ilə bağlayırdı. Demək olar ki, siyasi və iqtisadi məsələlər təmamilə unudulmuşdu. Eşitdik ki, Bakıda da nümayişlər keçirilmişdir. Bu nümayiş “Azərbaycan torpağı verilməyəcəkdir” şüarı altında keçmişdi.

Bundan sonra Yerevanda uzunmüddətli nümayişlər başlandı. Nümayiş çox qəzəblə və ehtirasla Dağlıq Qarabağın Ermənistana birləşdirilməsini tələb edirdi. Bu tələb mütləq yerinə yetirilməyincə zavod və fabriklərin işləməyəcəyi də bildirilirdi. Əmək kollektivlərindən işçilər nümayişə çox vaxt güclə aparılırdı. Hər kəs nümayişdən boyun qaçırdığı təqdirdə ona əmək haqqı yazılmayacağı bildirilirdi. Eyni zamanda həmin adam millətin təəssübünü çəkməməkdə və qeyrətsizlikdə təqsirləndirilirdi. Hətta

məktəbliləri də zorla nümayişə getməyə sövq edirdilər. Nümayiş planlı şəkildə elə təşkil edilmişdi ki, avtobuslar, taksilər yalnız bu işə xidmət edirdilər. Nümayiş iştirakçılarını şəhərin mərkəzinə aparıb qaytarırdılar. Nümayiş vaxtı adamlarda elə güclü emosiya və ehtiras yaranmışdı ki, onlar milliyyətindən asılı olmayaraq rast gəldikləri hər adamdan nümayişə getməyi tələb edirdilər.

Artıq Ermənistanda nümayişlər başlayan dəqiqədən azərbaycanlılara qarşı münasibət tamamilə dəyişmişdi. Gözə görünən azərbaycanlını açıq-aşkar təhqir etməkdən çəkinmirdilər. Vurur, itələyir, söyür, "Ermənistandan rədd ol" deyə üstünə hücuma keçirdilər. Buna isə heç bir inzibati işçi fikir vermirdi. "Kim sənə nə eləyib, yalan danışma"-deyə başlarından rədd edirdilər. Azərbaycanlılar mat-məəttəl qalmışdılar. Bilmirdilər neyləsinlər. Birdən-birə bu nə idi? Hamı öz işində-gücündə... Hamı əməklə məşğul ikən bu hoqqanı kim çıxardı? Hələ nümayişin gücünü təsdiq edirmiş kimi iki milis nəfəri gəlib azərbaycanlı kəndlərində guya göyərçin vurmaqla məşğul olur, əslində isə silahını nümayiş etdirmişdi. Bir vertolyot isə fevralın 21-dən 25-dək hər gün azərbaycanlı kəndlərinin üstündə fır-fır fırlanırdı. Bunlar əhalini təşvişə salmaqdan özgə, yekəxanalıq iddiasında olmaqdan başqa nə ola bilərdi?!

Ancaq bunlara baxmayaraq televiziyada, radioda və mətbuatda nümayişlərin çox "ağıllıca" keçdiyi iddia olunurdu. Heç bir kəsin mənəviyyatına toxunulmadığı bildirilirdi. Ancaq bir şey unudulurdu:

-Bəs qonşu Azərbaycan xalqının torpağını istəmək (özü də belə təkəbbürlə) görəsən bu xalqın mənəviyyatına toxunmurdumu? Yoxsa azərbaycanlılar Z. Balayanın dediyi kimi öz xeyrini, şərini anlamağa da qadir deyillər. Əgər belədirsə "biz kimə neyləyirik"

fəlsəfəsi ilə yatmış bir xalqın başına hər oyunu açmağa nə var?!

Fevralın üçüncü ongünlüyü hər iki respublikanın xalqları üçün olduqca ağır keçirdi. Xüsusilə, Yerevandakı nümayiş günləri Ermənistanda yaşayan azərbaycanlılar üçün ən dözülməz, çətin anlar idi. Bir tərəfdən "Qarabağ bizimdir" çağırışını eşidib dözə bilməmək, digər tərəfdən törədilən sıxıntılar və nəhayət "sizə kim neyləyir" fəlsəfəsi... Bu tədbirlər çox ustalıqla həyata keçirilirdi. Daxilən odla-alovla qarşılaşan azərbaycanlılar, zahirən yalandan "şayiə yayanlar" adı ilə damğalanırdılar. M. F. Axundov adına Yerevandakı orta məktəbin binasına od vurulub tez də keçirilmişdi. Ancaq şayiə yayılmışdı ki, guya məktəbin direktoru Adil Süleymanov özü məktəbə qəsdən od vurmuşdur.

Tez-tez dəstə-dəstə gənclər məktəbin həyətinə toplaşıb azərbaycanlı şagirdlərə sataşırdılar. Erməni dilində "Qarabağ merna" deyə onları təhqir edib, hövsələdən çıxarmağa çalışırdılar. Bir dəfə də belə edərkən Axundov məktəbinin oğlan və qızları birlikdə Azərbaycan dilində "Qarabağ bizimdir"-deyə cəsarətlə cavab vermiş və döyüşə hazır olanlarla döş-döşə gəlmişdilər.

Bu günlərdə Yerevandakı müsəlman məscidinə də od vurulmuşdu. Qanı götürməyən iki nəfər azərbaycanlı oğlan əllərindəki bıçaqla od vuranların üstünə atılmışdı. Lakin yanğın tez söndürülüb, yanan yerlər düzəldilib rənglənmişdi.

Şəhərin küçələrinə azərbaycanlıların çıxması olduqca çətinləşmişdi. Hər addım başı müxtəlif hadisələrlə üzləşməli olurdular. Hətta panel daşıyan maşını bir neçə adam çevirmək istərkən xilas etmişdilər. Yenə də nümayişin çox mədəni keçdiyi iftixarla qeyd edilirdi.

Gündən-günə hər şey çətinləşirdi. Azərbaycana gediş-gəliş kəsilirdi. Yollarda təhlükə artırdı. Hətta yazılan məktublar ünvanına

təsadüfən çatırdı. Xüsusilə yuxarı təşkilatların ünvanına göndərilən məktublar aradan çıxarılırdı.

Fevralın 24-də Ermənistan televiziyası ilə çıxış edən I Vazgen erməni xalqını tamamilə itiləyib, məqsədə nail olmağa səslədi. Xaricdən çoxlu məktub aldığını, onların da havadarlığını dönə-dönə xatırladı. Erməni xalqının tarixdə həmişə qeyrətli, qorxmaz xalq olduğunu söylədi. Necə olur olsun Qarabağ bizim olmalıdır dedi.

Bu çıxışın səhərisi nümayiş daha da gücləndi. Şayiələr də baş alıb mənzilinə sığışmadı. Artıq azərbaycanlı əhali mağazalara çıxmağa, iş dalınca getməyə çətinlik çəkirdi. Təsəvvür edin, nə qədər evə qapılıb qalmaq olar...

Nümayiş iştirakçılarına hər cür qayğı göstərilirdi. Onlara ayaq üstə su və yemək paylanırdı. Hər şey düşünülmüş, ölçülüb bişilmiş qaydada həyata keçirilirdi. Hətta ssenari elə tərtib edilmişdi ki, su paylayan hər gün suyunu, limonad paylayan limonadını, peçeniye paylayan isə peçenyesini paylayırdı. Hamı üzünü Moskvaya tutub haqq-ədalət gözləyirdi. Nəhayət Fevralın 26-da M. S. Qorbaçovun Azərbaycan və Ermənistan zəhmətkeşlərinə, xalqlarına müraciətini hamı böyük maraqla dinlədi. Müraciətdə hər iki xalq ağıla, kamala çağırılırdı. Əslndə Sövet dövlətinin başçısı ermənilərə “Dur!” deməliydi. Ondan ötrü ki, ermənilər Azərbaycan torpaqlarını ələ keçirmək üçün ayağa qalxmışdılar. “Dur” deyilmədi, çünki ssenari müəllifi rus dövlətinin başçıları özləri idi.

M. Qorbaçovun müraciətini biz onda Krasnoselo Rayon Soveti İcraiyyə Komitəsinin sədri vəzifəsində işləyən Mahal Əliyevlə birlikdə onun evində dinlədik. Müraciət qurtaran kimi televizorun ekranında V.İ.Leninin rolunu aparan artist erməncə dedi: ***“jama-***

***naq aşxaduma mer hoktn"***, yəni vaxt bizim xeyrimizə işləyir.

Çox təəssüf ki, Baş katib millətlərarası münaqişəyə birdəfəlik son qoymadı, konkret söz demədi. Son hadisələr göstərdi ki, bu, azərbaycanlıları ayağa qaldırmaq, onların hisslərini qızışdırmaq üçün atılan bir addım imiş. Azərbaycanı da oyuna qoşmaq və yaxasından tutaraq suçlamaq lazım idi.

* * *

Əvvəlcə dünyanın ən "qüdrətli" sosialist ölkəsində millətlərarası iğtişaşa inanmaq olmurdu. "Qardaş xalqların mehriban ailəsində" yaşayan iki qonşu millət arasında yenidən nifaq salmaq o qədər də asan görünmürdü. Yetmiş il idi ki, Vətən deyəndə böyük Sovet İttifaqı nəzərdə tutulurdu. Əgər belə olmasaydı Böyük Vətən müharibəsində SSRİ xalqlarının hamısı eyni məqsəd, eyni amal uğrunda ölüm-dirim mübarizəsinə qoşulmazdı. Belə birliyə, belə amala inanan Azərbaycan türkləri erməni fitnəsinin bir-iki gün içində nəinki yatırılacağına, hətta onu törədənlərin dərhal həbsə alınacağına ümid bəsləyirdilər. Necə deyərlər, sən saydığını say, gör Qorbaçov nə sayır...

Yerevanı və respublikanın digər şəhərlərini mitinqlər bürüdü. Hamı bir nəfər kimi əl-ələ verib küçələrə atıldı: "Qarabağ merna" (Qarabağ bizimdir) - deyə ağız-ağıza verib qışqırmağa başladı. Televiziya, radio, qəzet və jurnallar bu günlərdə emosiyaları hər cür qızışdırmaq üçün yalanı yalana calayır, minbir iftira və böhtana əl atırdı.

Azərbaycanlılara qarşı kütləvi fitnəkarlığa başlandı. İş dalınca maşın sürən sürücülər döyülür, maşınlar əzilir, az-çox vəzifədə olanlar təhqirlərə məruz qalırdılar. Səbəb də o olurdu ki, guya Qa-

rabağda ermənilər öldürülür.

Ssenarinin hazırlanmasında iştirak edən respublika rəhbərliyi günahsız azərbaycanlıların qanuni hüququnu adi səviyyədə belə, qorumağa meyl göstərmirdilər. Hətta kənd rəhbərləri yuxarı təşkilatlara məhz törədilən azğınlıqlar barədə şikayət edəndə onları şayiə yaymaqda ittiham edir, ara qızışdırmaqda təqsirləndirirdilər.

Bir gün sonra Ermənistan televiziyası ilə çıxış edən şair Silva Kaputikyan erməniləri itiləyib qana çağırdı.

Təkəbbürlü və lovğa bir əda ilə Baş katiblə bir saat beş dəqiqəlik görüşlərini və M. S. Qorbaçovun onlara "mənim erməni xalqına böyük hörmətim var. Təmkinli hərəkət edin, hər şey yaxşı olacaq", - deyə verdiyi ümid dolu sözü ermənilərə çatdırdı. Sonra da qeyd etdi ki, "uzun illərdən bəridir ki, Azərbaycan rəhbərliyi və alimləri bizi başa düşmək istəmirlər. Biz öz halal torpağımızı ***(görəsən bu xanım şair hansı "halal torpaqdan" danışır? Məgər bu günkü Ermənistan qədim oğuz- türk yurdu olan İRƏVAN xanlığının ərazisi deyilmi?- E. İsmayıl.)*** tələb edirik. Daha səbrimiz qalmayıb. Bu gün nümayişlərdə iştirak edən oğullarımıza baxıb fəxr edirəm. Biz onlarla birlikdə hər şey edə bilərik".

Ermənistanda yaşayan Azərbaycan türklərinin başına minbir oyun açılmaqda davam edilirdi. Qafandakı fitnəkarlıqların məqsədi Azərbaycanda emosiyalara təkan verməkdən ibarət idi. Sumqayıt hadisəsi də beləcə yarandı, hadisələri video-kasetlərə almaq hazırlığı əvvəlcədən aparılmışdı. İş o yerə çatdı ki, erməni evlərinə gəncləri çəkib aparan ermənilər oldu. Qriqoryan adlı birisi yeddi nəfər erməninin öldürülməsində iştirak etmişdi...

Sumqayıt Bakının qulağının dibində olsa da, Bakı bu hadisədən xəbər tutunca Yerevan Sumqayıt hadisələrini "Rossiya" kino-teatrında nümayişə başladı. Tələm-tələsik Amerikadan belə yaydılar.

Elə erməni millətçilərinə də bu lazım idi. "Ey xristian qardaşlar, azərbaycanlılar vəhşidirlər, onlar erməniləri diri-diri yeyirlər", - deyə dünyanın qulağını qut etdilər.

Əslində nə xristiana, nə müsəlmana, nə yəhudiyə ürəyində zərrəcə məhəbbət hissi olmayan ermənilər işi dara düşəndə, kömək lazım olanda xristian olur, rus xalqının qardaşına çevrilir. Amma yeri gələndə ruslara qarşı da kinini bildirməmiş olmur. Bütün dünya bilir ki, Rossiya mehmanxanasının, Moskva metrosunun partladılması işində, dövlət bankının oğurlanmasında və neçə-neçə casusluq işlərində erməni əli olmuşdur.

Sumqayıt hadisəsindən sonra Ermənistanda yaşayan azərbaycanlıların həyatında faciələrlə dolu yeni mərhələ başladı. Az vaxtda xarici agentliklərə çatdırıldı ki, Sumqayıtda üç yüzə qədər erməni öldürülmüşdür. Əslində Sumqayıt hadisələrində cəmi iyirmi altı nəfər erməni öldürülmüşdür ki, onun da əvvəlcə dediyimiz kimi, yeddisinin qatili ermənidir. Bəs nəyə görə ölüm iyirmi altı nəfər olduğu halda söhbət üç yüzdən gedirdi? Çünki Azərbaycan xalqı öz dinc əməyində ikən onu günahkarlandırmadan torpaq istəmək çətinləşirdi. Ona görə də hər addım-başı Azərbaycan xalqının başından böhtan yağışı yağdırmaq planının vacibliyi ermənilər üçün olduqca sərfəli idi. İstər-istəməz adam düşünməli olur; İlahi, gözümüzün qabağında baş verən ölüm hadisəsini on bir dəfədən çox şişirdən bu şərbazlar görəsən, genosid deyə qışqırdıqları 1915-ci ildə baş verən qırğını neçə dəfə artırmışlar? Axı, həmin ölümü dəqiq hesaba alan heç bir dövlət komissiyası işləməmişdir...

Mart ayının 3-dən etibarən Ermənistanda gərginlik daha da dərinləşdi. Kəndlərə silahlı basqınlar başlandı. Müqavimət göstərməyə, öz şərəfini qorumağa cəhd edən azərbaycanlılar dərhal həbs olunurdular. Ermənilər isə əlisilahlı cövlan edirdilər. Onsuz

da on ildən bəri idi ki, azərbaycanlıların silahı yığılır, hətta ovçular cəmiyyətinə də üzv yazıla bilmirdilər.

İqtisadi blokada getdikcə ciddi xarakter alırdı. Kəndlərə ərzaq məhsulları göndərilmir, pal-paltar almaq üçün heç yana çıxmağa imkan verilmirdi. Xəstəxana, məişət xidməti təmamilə dayandırılmışdı. Bir sözlə, camaat ev dustağına çevrilmişdi. Ancaq belə bir ləyaqətsiz hərəkət nə mərkəzi mətbuatda özünə yer tapırdı, nə də Azərbaycan mətbuatında. Lakin hamını bir məsələ düşündürürdü; dişinə qədər silahlanmış quduz düşmənə qarşı acizlik göstərməmək, sayıq olmaq, insan tələfatına yol verməmək...

Yerevanın beş addımlığında olan Masis (Uluxanlı) rayonunun camaatı böyük müsibətlə üzləşməli olmuşdu. Bir milyonluq şəhər camaatı ilə döş-döşə durmaq, özü də əliyalın mübarizə aparmaq o qədər də asan deyildi. Erməni millətçiləri rayonun əkin sahələrinə neft məhsulları tökərək əkini korlayır, yollarda ələ keçəni döyüb ölümcül hala salır, aramsız hücumlar təşkil edərək təhlükəni artırırdılar. Belə bir vəziyyət hərbçilərin gözü qabağındaca törədilir, nəticədə bir cinayətkar cəzalandırılmırdı. Buna baxmayaraq, gecəsi-gündüzü olmayan zəngibasarlılar cəsarətlə müdafiə olunurdular. Eyni zamanda Zəngilər və Sarvanlar kəndinə çəkilən hücum vaxtı erməni millətçiləri dəfələrlə layiqli cavablarını almalı olmuşlar...

Ermənistanın hüquq-mühafizə işçiləri təkcə quldurların havadarı kimi deyil, bir çoxları bu dəstənin qatı iştirakçıları rolunda çıxış etməkdən çəkinmirdilər. Avtomatla atəş açan ermənilərə daş atan azərbaycanlı yerindəcə həbsə göndərilirdi.

Azərbaycanlılar Gürcüstan və Azərbaycan ərazisindən Moskvaya hər gün yüzlərlə teleqramlar göndərir, nəticə gözləyirlər. Necə deyərlər, Moskva da öz işindədir, ermənilər də...

Aşkarlıq və demokratiyadan istifadə edən ermənilərin siyasi avantürizmə keçmək cəhdi zaman etibarilə ələ düşmüş fürsətdir. Mərkəzdə isə bu işə güclü rəvac verənlər, rəhbərliyin birtərəfli mövqeyi quldurları daha da şirnikdirir. Çoxdan bəri arzusunda olduqları ”türksüz Ermənistan” əməliyyatının əsl vaxtıdır. Məhz buna görə də yüksək dərəcədə sivilizasiyalı erməni respublikası yaratmaq fürsətini əldən vermək olmaz.

Deyək ki, belədir. Bəs onda törətdikləri bu vəhşiliklərdən, insan qırğınına səbəb olan qeyri-insani hərəkətlərdən sonra ermənilərə nə ad vermək olar?!

Gəlin, onda 1988-ci ilin fevralından sonra ermənilərin Ermənistan deyilən respublikada (əslində bu respublikanın əzəli sakinləri türklər olmuşlar) azərbaycanlıların başına açılan dəhşətli kələkdən, müsibətli hadisələrdən az da olsa söz açaq. Yox, təkcə söz açmayaq, oba-oba gəzək, gözümüzlə gördüklərimizi danışaq. Danışaq ki, gələcək nəsillər bilsin, görsün onun dədə-babalarının başına nə bəlalar gətirilib. Xalqımız öz dost və düşmənini tanısın. Tanısın ki, bir gün indiki bəlanın törədiciləri haçansa yenə bu xalqa müsibət gətirməyə hazırdır. Qiyamət o gün qopar ki, millətin gözü bəsirət yuxusundan kənar  mürgü vura, düşmənin qələbəsini və xəyanətini görə bilməyə.

Sumqayıt hadisələrini törətməkdə başlıca məqsəd tüstüsü təzəcə çıxan korun bir ocağa benzin atıb alovlandırmaq idi. Bu ocağın alovu getdikcə güclənməli və nəhayət, iki respublikanı bürüməli idi. Xüsusilə, Azərbaycan ərazisi qaynar qazana çevrilməli, fövqəladə vəziyyət rayonu kimi əsgərlərin tapdaq zonası olmalı idi. Talanlar, qarətlər, qətllər törədilməli və beləliklə, Azərbaycan xalqı dünyaya vəhşi kimi tanıdılmalı idi. Demək olar ki, erməni millətçiləri bu mənfur planların hamısına müəyyən mənada müvəffəq oldular.

Azərbaycanda qarışıqlıq salmaq üçün, ilk növbədə, Ermənistandakı azərbaycanlılara divan tutmaq əsas məsələlərdən biri idi.

Heç təsadüfi deyildir ki, mart ayında ilk kütləvi qaçqınlar yarandı. Bakıda rəsmi idarələrin, MK və Nazirlər Soveti binalarının önü qaçqınlarla dolu idi. Moskvanın nümayəndələri Bakıya gəlib yağlı vədlər verir, onların qayıtmasını məsləhət görür və əmin-amanlıq yaradacaqlarından danışırdılar. Qaçqınların məsələsini həll etmək əvəzinə, onları avtobuslara doldurub Ermənistan sərhədlərinə yola salır, yenidən od içinə atırdılar. Ermənilərin rəsmi dövlət və partiya rəhbərləri, milis işçiləri isə əllərində silah azərbaycanlılara divan tuturdular. Yazılan qalaq-qalaq ərizə və şikayətlərə baxan yox idi. Evlər yandırılır, adamlar güllləbaran edilirdi.

Faciəmizin yeni mərhələsi bu cür başlandı...

# ÖLÜM VAR ÖLÜM KİMİ, ÖLÜM VAR ZÜLÜM KİMİ...

Martın əvvəllərində güclü mitinqlər dalğası Ermənistanı başdan-başa bürüdü. Bu vaxt qana-qan çağırışları ərşə bülənd olmuşdu. Yollarla keçən azərbaycanlı maşınlarına və kəndlərə yaxından-uzaqdan güllələr atılırdı. Bütün hadisələr eyni mərkəzdən güc aldığına görə - gecələr kəndlərə soxulub ucqar evləri yandırmaq, əhaliyə xəsarət yetirmək bütün Ermənistanda eyni şəkildə həyata keçirilirdi.

Açıq-aşkar şəkildə azərbaycanlılara meydan oxunurdu ki, Novruz bayramınızı qara gətirəcəyik. Kəndlərdən kənara çıxmaq son dərəcə ağırlaşmışdı. Bayramlıq etməyə mağaza və dükanlarda heç nə tapılmasa da, hamı bayramı yaxşı keçirməyə can atırdı. Çünki belə bir vəziyyətdə Novruzu keçirməmək düşmən qabağında əyilmək olardı.

Mart ayının 20-si günü Krasnoselo rayonunun Şorca bölgəsində olan kəndlərin rəhbərləri Şorca dəmiryol stansiyasının binasında keçiriləcək müşavirəyə çağırıldılar. Amma heç kəs bilmirdi ki, müşavirə nə məqsədlə və hansı təşkilat tərəfindən təşkil olunmuşdur. Dəmiryol vağzalının qabağına toplaşan kənd rəhbərləri bu "müşavirə"yə şübhə ilə yanaşdılar. Bu vaxt şorcalı qadınların

kənardan ”içəri girməyin, qəsd hazırlanıbdır”- çağırışları ara vermirdi. Xeyli söz-söhbətdən sonra aydın oldu ki, guya Moskvadan general gələsidir. Və o, azərbaycanlılarla görüşmək niyyətindədir. Səbəbi odur ki, elektrik qatarına Krasnoselonun və Basarkeçərin ərazisində basqınlar təşkil olunduğuna görə qatarın maşinistləri işdən imtina edirlər.

Bu məsələdən hali olan rayon partiya komitəsinin birinci katibi dəmiryol vağzalına gələrək bildirir ki, belə çağırış təxribat ola bilər. Qatara hücum məsələsi isə kökündən yalandır. Ona görə ki, bu qatarlarla gedib-gələnlər azərbaycanlılardır. Necə ola bilər ki, onlar özlərinə xəyanət etsinlər...

Katib tapşırdı ki, rayon partiya komitəsindən və icraiyyə komitəsindən rəsmi çağırış olmadan heç bir iclasa və heç bir toplanışa icazə verilmir.

Sonra aydınlaşdı ki, bu, terrorçuluq məqsədilə “Qarabağ komitəsi” tərəfindən hazırlanmış təcavüz imiş. Bu xəbər tezliklə hər tərəfə yayıldı ki, azərbaycanlılara qarşı hazırlanan qəsd baş tutmamışdır. Deməк, daha ehtiyatlı olmaq lazım gəlirdi. Hər cür fitnəkarlıq üçün zəmin yaradılırdı. Gecə-gündüz keşik çəkməkdən başqa çarə qalmamışdı. Vəziyyət göstərirdi ki, rus hərbçilərinə bel bağlamaq avamlıqdan başqa bir şey deyil.

Sumqayıt hadisələrindən sonra Azərbaycandan Ermənistana gəlmiş ermənilər çox istiqanlıqla yerləşdirilir. Onların əzab-əziyyət çəkməməsi üçün şərait yaradılır. Mən buna qibtə edirəm, ona görə ki, millət arasında ayrıseçkilik yoxdur.

Fikrimi təsdiq üçün aşağıdakı sitatı çəkməyi lazım bilirəm:

Ermənistan KP MK-nın birinci katibi K.S.Demirçyan 1988-ci ilin 22 martında televiziya ilə çıxışında demişdir:

-“Respublika hökumətinin qərarı ilə Sumqayıtdan gələn ailələrə

lazımi maddi və başqa yardım göstərilir, onların tələblərinin ödənilməsi üçün müvafiq tədbirlər ələ alınır”...

Martın 22-dən sonra Azərbaycan mətbuatı, radio və televiziyası həmişə olduğu kimi dostluqdan, zəkanın qalib gələcəyindən, qardaşlığın gücündən yazırdı. Ermənistan mətbuatında isə qızışdırıcı yazılar, xalqlar arasında düşmənçilik toxumu səpmək kimi qərəzli məqalələr çıxırdı. Guya Sumqayıtda erməni uşağının başını kəsib futbol oynayıblar....

Hasdisələr aramsız olaraq gərginləşirdi. Erməni millətçiləri radio, televizya və mətbuat vasitəsilə əhalini daha da qızışdırıedılar. Qızışdırırdılar demək azdır. Açıq- aşkar düşmançılığa çağırırdılar. “Ya Qarabağı alacağıq, ya da qırğın törədəcəyik”!- Deyə radio- televizya bar-bar bağırırdı.

Azərbaycanlılar SSRİ Ali Sovetinin 23 mart (1988) tarixli qərarına ümid bəsləsələr də, bir nəticə hasil olmadı. Partiya və dövlət sənədlərində sərhəd toxunulmazlığı haqqında öz əksini tapan qərarlar millətçi elementlər üçün az da olsa təsir gücündə deyildi. Azərbaycanlılara “çıxın, rədd olun gedin” - deyə meydan oxunurdu. Televiziyadakı çıxışlarda açıq-aşkar azərbaycanlıların Ermənistanı tərk etməsinin vacibliyi az qalırdı elmi dəlillər səviyyəsinə yüksəldilsin. Söhbət ondan gedirdi ki, onlar (yəni azərbaycanlılar) nə qədər ki, bizim içimizdən təmizlənməyiblər hərtərəfli inkişafımız mümkün deyil. Bu təqdirdə sirrimizi qapalı saxlamaq imkanından məhrumuq.

Ermənilərin quldurluq məqsədilə törətdikləri dalğalar aprel ayında daha da genişlənib, təlatümə çevrildi. Sumqayıt hadisəsi ilə bağlı qisasçılıq daha da qızışdırılırdı. Demək, Sumqayıt hadisəsi deyilən təxribat məhz azərbaycanlılarla münaqişəni dərinləşdirmək üçün əldə tutalğac idi. Və bu məqsədlə də erməni lobbisi tərəfindən dü-

şünülmüş şəkildə səhnələşdirilmişdi...

Aprelin 24-də və 28-də azərbaycanlılara qarşı törədiləcək qırğınlar gözlənirdi. Artıq bu camaata havadarlıq edən yox idi. Azərbaycanlıların erməni təcavüzünə məruz qalmasına zərrə qədər əhəmiyyət verilmirdi. Masis, Qafan, Gorus, Vedi, Kirovakan azərbaycanlıları sinəsini düşmən gülləsinə hədəf edib uşaqları, qadınları və qocaları düşmən təcavüzündən qorumaq üçün nələr etmirdilər...

Daşnaklar tərəfindən zaman-zaman dağıdılmış, od vurulub yandırılmış Vedi torpağı nələr görməyib? Bu torpaq daşnakların dəfələrlə günahsız axıtdıqları qanların şahidi olmuşdur. Amma heç vaxt, heç vədə namərd düşmənin zərbəsini cavabsız qoymamışdır. Quduz Andronikin dəstəsinə Abbasqulu bəyin endirdiyi qəti zərbə daşnak ünsürlərinin yadından çıxmayıb və çıxmayacaq da. Ona görə də onlar Vedini Azərbaycan türklərindən təmizləmək üçün növbəti xəyanət dövründəki planlarına terrorçuluq (terrorçuluq onların qan yaddaşının əsas canıdır) əsas vəzifə kimi daxil edilmişdi.

# VEDİ HADİSƏLƏRİ

## Vedi qəsəbəsinin sabiq sakini Qumru İslam qızı

**Orucova sevimli həyat yoldaşı Nizaminin başına açılan oyunu belə təsvir edir:**

*-Otuz iki yaşlı Nizami Politexnik İnstitutunu bitirmişdi. Buna baxmayaraq, Vedidə ona ixtisası üzrə iş verən olmadı. Əlacsız qalıb 2 nömrəli avtobazada sürücü işləməli oldu. 1988-ci ilin fevralından sonra digər azərbaycanlılar kimi Nizamiyə də ermənilər tez-tez "ultimatum" verirdilər ki, Vedini tərk etməlisən! Əks təqdirdə...*

May ayının 6-da belə bir ultimatum alan Nizami heç nəyə əhəmiyyət vermədən işə çıxır. Həmin gün saat 12-20 dəqiqədə mənə xəbər verdilər ki, Nizamini təkər açarı ilə vurublar. Mən tez qohumlarıma xəbər verdim. Biz hadisə yerinə çatanda Nizami yerdə uzanmışdı, özündən xəbəri yox idi. Qardaşımla birlikdə onu həkimə apardıq. Xəstəxananın baş həkimi Edik Arzumanyan xəstənin adını və familiyasını soruşdu ki, anket doldursun. Mən "Orucov Nizami" deyəndə elə bil həkimə od vurdun. Dəli kimi əlləri əsdi, gözləri hədəqədən çıxmaq dərəcəsinə çatdı. Cod bir səslə qışqırdı:

- Hələ siz utanmayıb bura xəstə də gətirmisiniz?! Götürün

xəstənizi də, itilin gözümüzün önündən. Elə itilin ki, Sumqayıt bəri yanınızda qalsın.

Mən özümü itirməyib, ona tüpürüb dedim ki, Sumqayıt hadisəsini də siz eləmisiniz. Sən həkim adı alıb Hippokrat andı içəndə ancaq erməniləri müalicə edəcəyinə and içmişdin eləmi?!

Əlacsız qalıb Nizamini evə gətirdik. Lakin o dözə bilmirdi, ağrılar onu əldən salırdı. Getdikcə vəziyyətinin ağırlaşdığını görüb biz onu Naxçıvana aparmaq qərarına gəldik. Naxçıvanda həkimlər çox böyük qayğı ilə işə girişdilər. Həyatla ölüm arasında gedən gərgin mübarizə gözlərim önündən bu gün də çəkilmir. Ancaq nə etmək olardı... Namuslu millət oğulları ilk növbədə həkim kimi, yaxşı adam kimi nələr etmədilər... Ürəklərinin odu, hərarəti ilə Nizamini sağaltmağa çalışırdılar. Amma ölüm ölüm kimi yaşayır... Xain erməni əli bu pəhləvan cüssəli oğlanın ömür çırağını birdəfəlik söndürdü. Həyatda onun üç balası qaldı. Gözləri həmişə qapıya baxan, ata yolu gözləyən üç bala... Bu üç bala ömrün gənclik dövrünə qədər atalarının yolunu gözləyəcək, bundan sonra isə atalarının günahsız qanını almaq üçün ömrün sonuna kimi misri qılınca dönəcəklər...

Abbasqulu bəy, Kərbəlayı İsmayıl və onlarca, yüzlərcə mərd oğullar yetirmiş Vedi torpağının bir şahin oğlu da erməni qəddarlığının qurbanı oldu. Vedidə doğulub boya-başa çatan Nizami Beyləqan torpağında uyumalı oldu.

Qoy Nizaminin ruhu xəbər tutsun. Mən yenə onun həyat yoldaşı, uşaqlarının anasıyam. Onun balaları atasızlıq çəksə də, dolanmadan korluq çəkməyəcəklər. Ömrüm boyu Nizaminin düşmənlərinə qarşı qılovlu xəncər olacağam.

Məndən sonra isə Nizaminin balaları düşmənə türkün türklüyünü, türkün intiqam hissini çatdıracaqlar.

# ŞİRAZLIDA BAŞ VERƏNLƏR

Mayın əvvəllərində Vedibasarda vəziyyət lap gərginləşdi. Aydın məsələ idi ki, təlatüm dalğası yaxınlaşmaqdadır və nə vaxtsa bu qədim torpağın əsl sahiblərini bürüyəcəkdir. Açıq hiss olunurdu ki, öz avantürist hərəkətlərini cilovlamaqdan uzaq olan ermənilər qan axıtmalı olacaqlar. Nəhayət, **may ayının 11-də Şirazlı hadisəsi düşünülmüş tərzdə həyata keçirildi.** Yüzlərlə erməni cavanları əlindəki daş-kəsək və dəmir parçası ilə şirazlıların üstünə hücuma keçdilər. İllərlə qonşuluq etmiş, duz-çörək kəsmiş ermənilər indi utanmadan azərbaycanlı evlərini daşa-kəsəyə basır, evləri dağıdır, adamları döyür və öldürürdülər. Kəndin azərbaycanlılar yaşayan məhəllələrinə tərəf irəliləyən xüsusi hazırlanmış dəstələr viranedici zərbələr endirirdilər. Bu xəyanət torpaq iddiasına düşmüş ermənilərin başlanğıc akkordları idi.

Həmin gün kəndin hörmətli adamlarından olan **Ağamir Əsədovun** evi "daş-dəmir yağışına" məruz qaldı. Təxminən 150-200 adam eyni vaxtda evin üstünə daş-kəsək çırpırdı. Belə bir vəziyyətdə 18 yaşlı Dilbər köməyə yetdi. O, evdən qoşalüləni götürüb özünü həyətə atmağı ilə nişan almağı bir oldu. Anası Kövsər xanım çatıb tüfəngin lüləsini bir anlığa yuxarı qaldırdı. Gurlayan tüfəng quldurların başı üzərindən ötərək qonşu evin üstündəki şifer parçalarını ermənilərin başına dağıtdı. Anasının əlindən çıxıb ikinci gülləni namərd qonşuların topuna boşaltmaq istərkən onlar artıq yoxa çıxmışdılar. Lakin artıq gec idi. Kənd alt-üst olmuş, evlər-eşiklər dağılmış, vir-viran edilmişdi.

Qasırğa kimi qəfildən qopan bu fəlakət nəticəsində Ağamirin əmisi İqbal Miryaqub oğlu Nağıyev aldığı ağır zərbədən keçinmiş,

Əkbər adlı kişinin ikiaylıq uşağı ayaq altda çığnanmışdı. İqbal ağanı Şidli kəndinin qəbristanlığında dəfn edən şirazlılar Türkiyənin sərhəddinə toplaşmalı oldular.

İki ay yarımdan artıq sərhəd məftilləri ilə döş-döşə dayanan şirazlıların nümayəndələri dəstə-dəstə mərkəzə şikayətə getməli oldular.

Təəssüflər olsun ki, bu faciə də rəhbərliyi yerindən tərpətmədi. Atalar demişkən: "əli ilə qoyan, Allahdan irəlidi". Şirazlıların düşündüyünün əksinə olaraq Moskva hər şeyi hamıdan yaxşı bilirdi. Erməni lobbisinin hazırladığı ssenari M.S.Qorbaçovun işarəsi ilə həyata keçirilirdi.

Ümidini Moskvaya bağlamış, lakin Moskvanın əli ilə döyülən Şirazlı camaatı uzun müddət açıq havada qaldığına görə onlardan bir çoxu xəstələndi və yatağa düşdü.

Körpə uşaqlar arasında sarılıq xəstəliyi yayıldı.



**Abbas Mürsəl oğlu Əliyev**

# GÖYÇƏDƏ ERMƏNİLƏR ƏLEYHİNƏ MİTİNQLƏR

**İyun ayının 15-də Ermənistan SSR Ali Sovetinin sessiyası keçirilməli və bu sessiya Azərbaycan SSR Ali Sovetindən Dağlıq Qarabağın Ermənistanın tərkibinə keçməsi barədə "xahiş" etməli idi.**

Artıq səbri tükənmiş xalq məngənə arasında olsa da partlamağa hazırdı. Həmin gün Göyçə mahalında ermənilərin son dərəcə yaramaz hərəkətlərinə qarşı azərbaycanlılar öz etiraz səslərini qaldırmalı oldular. Krasnoselo rayonunun Şorca və Gölkənd kəndlərində on min əhalinin mitinqi keçirildi. Səhərisi gün Basarkeçər rayonunun Şişqaya və Nərimanlı məntəqələrində də azərbaycanlılar mitinqlərə çıxdılar. Bu mitinqlər həm də tətil xarakteri daşıyırdı. Azərbaycanlılar heyvandarlıqda sağımı tamamilə dayandırmışdılar. Bu vaxt mitinqlərdə iyirmi min adam iştirak edir və erməni millətçilərinə, xüsusilə respublika rəhbərliyinə qarşı qəzəblərini bildirir, bir çox tələblərlə birlikdə Göyçə mahalına muxtariyyət tələb edirdilər.

Yaranmış vəziyyətlə əlaqədar olaraq dərhal qoşun hissələri gətirilib erməni kəndlərinin yaxınlığında yerləşdirildi.

İyirmi mindən artıq adamı birləşdirən bu nümayişlərin etiraz dalğası Ermənistanı lərzəyə gətirdi. Sessiyanın gedişi vaxtı nümayişlər keçirilən məntəqələrə dərhal hökumət adamları göndərildi. Xalq heç kəsə inanmır, heç kəslə razılaşmaq istəmir, yalnız mərkəzdən səlahiyyətli nümayəndə tələb edirdi. İndi ermənilər arasında belə bir şayiə yayılmışdı ki, guya Azərbaycandan Göyçəyə

silah keçirilmişdir.Elə bil ki, nümayişlərin belə coşqun şəkil alması da deyilənləri təsdiq edirdi. Krasnoselo və Basarkeçər erməniləri çox böyük təşviş və narahatçılıq keçirir, hətta imkanı olanlar ailə üzvlərini Yerevana, Sevana və başqa şəhərlərə aparırdılar. Bəs xalq nə tələb edir və nə istəyirdi? Bu sual özü-özlüyündə aydındır: **haqq, ədalət!**

Ədalətsizliyə qarşı üsyan səsini qaldıran xalq qəzəblə Ermənistan hökumətinə bildirirdi ki, vaxtı ilə 4 min kv. kilometrə yaxın ərazisi olan Göyçə mahalı bir quşun tay qanadı kimi qalmışdır. İndi isə Basarkeçərin Şorca kəndindən tutmuş İcevan rayonunun "Çayqarışan" (Haqqıxlı kəndi) körpüsünə qədər 150 kilometrlik ərazidə azərbaycanlılar yaşayır. Nə üçün bizim muxtariyyətimiz, sosial problemlərimiz yada düşmür, Dağlıq Qarabağda yaşayan ermənilərin problemsiz "problemləri" dünyanı ağzına alır?!

**Nümayişdə aşağıdakı tələblər irəli sürülmüşdü: *-Ermənistan hökuməti Azərbaycanda torpaq iddiasına son qoysun!***

***-Ermənistanda yaşayan azərbaycanlıların təhlükəsizliyi təmin olunsun!***

***-Azərbaycanlı kəndlərinə qarşı yürüdülmüş iqtisadi blokada aradan götürülsün, qarşıdurmaya aparan qüvvələr ləğv edilsin!***

***-Göyçə mahalına muxtariyyat verilsin!***

Nümayiş iştirakçılarının əllərindəki plakatlara yazılmışdı:

**"Göyçə mahalına muxtariyyət",**

**"Torpaqdan pay olmaz",**

**"Qarabağ Azərbaycanın ürəyidir",**

**"Azərbaycan xalqına eşq olsun",**

**"Göyçə oğuz yurdudur" və sair.**

Mitinqdəki çıxışlar ermənilər üçün gözlənilməz idi. Əvvəllər müxtəlif vəzifələrdə işləmiş Cil kənd sakini Məsmə Abbasovanın, şairə qız Fazilə Yəhya qızının odlu nitqi sanki Göyçə gölünün ayna sularına dəyib qayalarda əks-səda verirdi:

***- Göyçə oğuz yurdudur, bu torpaqda erməni yaşamamışdır. Siz minbir kələklə bu müqəddəs torpağı Ermənistan xəritəsinə qatdırmısınız. Gün gələcək ki, haqq qələbə çalacaq. Dağlar-daşlar dindiriləcək. Onda hər qaya parçasının, hər qərib cığırın, hər əlçim torpağın dodağından qopuz sədası qopacaq, bayatılar yağışı yağacaq.***

***Mən bütün övladlarımı verərəm ölümə, ancaq Qarabağın bir daşını yada vermərəm!***

Müəllim Allahverdi Sadıqovun, Cəlal Yusifovun, Abbas Hacıyevin, Təvəkkül Nəsibovun, Şirin Məmmədovun (Qaraqaya) və başqalarının çıxışları erməni millətçilərinə tutarlı cavablar idi.

Bir həftə davam edən nümayişlər Basarkeçər və Krasnoselodan Noyemberyana keçmişdi. Bu, Ermənistan hökumətini narahat etməyə bilməzdi. Azərbaycanlıların etiraz mitinqləri bütün respublika boyunca yayılmasın deyə dərhal hiyləyə əl atıldı. Camaatı inandırmağa çalışırdılar ki, bu işlər bir qrup ekstremistin işidir və buna tezliklə son qoyulacaqdır. Hətta bizi tez ələ almaqda mahir olan ermənilər bu vaxt Bakıdan gəlib xalqı "ağıla-kamala" çağıranların da fəaliyyətindən irişə-irişə istifadə edirdilər.

Nümayiş və mitinqlər dayandırıldıqdan sonra bu işin təşkilatçıları əlaltından öyrənilib "məhşər ayağına" çəkilməli olurdu. Gətirilmiş rus əsgərləri deyirdilər ki, erməniləri sizdən qorumağa gəlmişik...

Bu mitinqlər coşqun bir dağ seli kimi özünü daşa-qayaya çırpa-çırpa axıb nehrə töküldü. Yağışın kəsməsi ilə sel qurtardı. Çünki bu sel başlanğıcını bulaqların gözündən almırdı, çaylara arxalanıb,

şəlalələrə söykənmişdi...

Bu dövrdə hər hadisəyə şayiə deyən Azərbaycan rəhbərliyi Göyçədə keçirilən mitinq və nümayişlərin qulağına barı "biz burdayıq" sözünüsə deyəydi. Onda xalqın əzmi bu qədər qırılmazdı. Xalqın taleyinə bu etinasızlıq noyabr hadisələrində çılpaqlığı ilə üzə çıxdı. On aya qədər davam edən bu mübarizə təkləndi, müasir silahla təchiz edilmiş və rəhbərlik tərəfindən inadla müdafiə olunan ermənilər dörd bir tərəfdən Göyçəyə hücuma keçdi. Nəticədə Ermənilər tərəfindən öldürülən 217  günahsız insandan 70 nəfəri Basarkeçər və Krasnoselo  əhalisi oldu.  Yalnız bundan 48 nəfəri dağlarda borana düşdü. Qara Elləzovun (Nərimanlı) meyidi 4 gündən, gənc Şahin Əliyevin Şişqaya meyidi isə 4 aydan sonra tapıldı. Uşaq üstə ölən analardan, bu günə kimi itkin düşənlərdən danışmırıq. Tüstüsü burula-burula ərşə qalxan evlərdən, talan olan var-dövlətdən söhbət açmırıq...

Zərurət nəticəsində yaranan mitinqlər vaxtında müdafiə edilsəydi özündə mənəvi gün toplayıb namərd düşmənə qarşı xalq son nəfəsinə qədər vuruşacaqdı. Onun əzmini İrandan, Türkiyədən, Suriyadan gəlmiş yadellilər qırıb oğuz ellərinə ayaq qoya bilməyəcək idi. Təəssüf ki, arxasızlıq...

# ŞƏHİD TAHİRƏ ORUCOVA VƏ...

İndi ermənilərin ümidi 28 iyunda keçiriləcək XIX partiya konfransına qalmışdı. Ermənilər açıq-aydın deyirdilər ki, Kreml rəhbərliyi Dağlıq Qarabağın Ermənistana verilməsinə söz vermişdir.

Konfrans keçirildi. Nəticə yenə erməniləri qane etmədi. Yenə böyük ərköyünlüklə ayaqlarını yerə döyüb - ”ver deyirəm, ver” - deyə qışqırmağa başladılar. Azərbaycanlılara verilən əzab-əziyyət gündən-günə artırdı.

Radio və televiziyada azərbaycanlıların ünvanına böhtan yağdırmaqdan usanmırdılar. İyulun 4-də Ermənistan televiziyası ilə çıxış edən bir nəfər erməni görkəmli Azərbaycan yazıçısı **Anar** haqqında güclü iftiraya keçdi. Hər cür şər-şamatadan sonra məqsədi bu oldu ki, Anar azərbaycanlıları oyadır! Deməli, Anarın “təqsiri” öz millətini oyatması idi! Deməli, Anar ermənilərin başladıqları ”haqq işə” mane olur! Qəribə məntiqdir.

Hətta çıxış edən daşnakın fikrincə, Anar bu əməlinə görə cavab verməlidir. Həmişə qana, qırğına meydan açan I Vazgen iyul ayının 6-da Ermənistan televiziyası ilə çıxış edərək bildirdi ki, torpaq bizim olacaq, haqlı bizik. Ancaq düşünülməmiş hərəkətə yol versəniz, düşmənləri sevindirə bilərsiniz. Mübarizəmiz davam eləyir. Hələ qarşıda 18 iyulda keçiriləcək SSRİ Ali Sovetinin iclası durur.

İndi ermənilər SSRİ Ali Sovetinin həmin iclasından nicat gözləyirdilər. Bu da səbəbsiz deyildi. Çünki erməni başbilənləri deyirdilər ki, Qorbaçov yoldaş bizə söz verib, Azərbaycanın da başbilənləri deyirdilər, ay canım, hər deyilənə inanmayın, Qorbaçov yoldaş deyib ki, sərhədlər toxunulmazdır. Həqiqətdə də belə olub... Hər iki tərəf “gözləyin, yaxşı olar” sözünü az eşitməyiblər...

İstər ermənilərin, istərsə də azərbaycanlıların intizarla gözlədikləri 19 iyul günü gəlib çatdı. Hamı televiziya qarşısında əyləşib iclasın gedişini izləyirdi. Yenə elan olundu ki, Qarabağ Azərbaycanındır. Amma SSRİ Ali Sovetinin sədri ilə üz-üzə gələn ərköyün erməni millətçilərinə "gözün üstə qaşın var" deyən olmadı.

Arxalı ermənilər tərəfindən bu qərar da bəyənilmədi. Hər şey aydın idi. Deməli, belə qərarların sayı yüzə də çatsa xeyri yoxdur. Çünki qərarı çıxaran öz qərarının arxasında durmaq fikrində deyildi.

İyul ayının 20-də İcevan rayonunun Alaçıqqaya kəndində iyirmi iki yaşlı, iki uşaq anası **Tahirə Fərhad qızı Orucova** erməni terrorçuluğunun qurbanı oldu. Səbəb o idi ki, Tahirənin atası Fərhad iki gün əvvəl ermənilərə deyib ki, iyulun 18-də keçiriləcək SSRİ Ali Sovetinin iclası Qarabağın Azərbaycan torpağı olduğunu təsdiq etdiyi təqdirdə quzu kəsəcəyəm.

Bu sözdən kinlənmiş ermənilər Fərhadı öldürmək qərarına gəlirlər. Onun evinin ətrafında hərlənir və onu görə bilmirlər. "Əliboş" qayıtmamaq məqsədilə Tahirəni güllə ilə vurub iki körpəsinin arasında yerə sərirlər.

Hadisə yerinə gələn hüquq-mühafizə orqanlarının işçiləri Qoş kəndindən olan caniləri yaxalamaq əvəzinə, azərbaycanlıları dindirir və onları cinayətə çəkmək üçün cəhd göstərirlər. Hər şey aydındır; Ermənistanda törədilən cinayətlərin heç biri aşkara çıxarılmır, azərbaycanlılara qarşı cinayət yapan erməni, cinayətkar yox, qəhrəman kimi qəbul olunur.

Tahirənin vəhşicəsinə ölümü bütün xalqı hiddətləndirmişdi. Mərkəzi orqanlara göndərilən şikayət məktublarının sayı-hesabı yox idi. Lakin mərkəz bu şikayətlərə başdansovdu cavablar verməklə işini bitmiş hesab edirdi. Əsasən şikayət məktubları mərkəzdən Ye-

revana göndərilir. Yerevanda isə istehza ilə qarşılanan bu şikayətlərə məhəl qoyan olmurdu. Olsa da, cavab vermək xatirinə hər sözün canından erməni saxtakarlığı yağırdı.

**Yerevan İstintaq idarəsinin prokuroru Q. Məlik-Sarkisyanın 5 aprel 1989-cu il tarixli, 15-239/88 nömrəli cavab məktubunda oxuyuruq:**

***"Mingəçevir şəhəri, Puşkin küçəsindəki 14/2 nömrəli evin 10-cu mənzilində yaşayan***

***Orucov Fərhad Əmir oğluna***

***SSRİ Ali Sovetinin Rəyasət Heyətinə, SSRİ prokurorluğuna və başqa orqanlara qızınızın ölümü barədə göndərdiyiniz teleqrama cavab olaraq bildiririk ki, cinayətlə əlaqədar olaraq SSRİ prokurorluğu ilə Dilican şəhər prokurorluğu birgə istintaq aparırlar.***

***Hal-hazırda istintaq davam edir. İstintaqın gedişi SSRİ və Ermənistan SSR prokurorluğunun nəzarəti altındadır. Müsbət nəticə alınanda sizə təcili məlumat veriləcəkdir".***

Əlbəttə, bütün bu hdisənın arxasında duran Sovet hüquq mühafizə orqanları yalan məlumat yayırdı. Digər hadisələr kimi heç bir məlumat verilmədi. Əgər Azərbaycan xalqına qarşı Ermənistan hökumətinin özü qəsdlər hazırlayırdısa, bu qəsdləri SSRİ hökuməti ört- basdır edirdisə onda istintaqa çəkiləcək canini kim üzə çıxarmalı olacaqdı...

Ermənilər əlaltından mütəşəkkil qaydada silahlandırılırdılar. Bu gün Gədəbəy rayonu üçün barıt çəlləyinə çevrilmiş köhnə Başkənd[3] (sonradan Arzvaşen) kəndinə "doludağıdan" toplar göndərilir və silah da yeridilirdi. Ermənistanın hər yerində bu qəbildən olan toplara ehtiyac artmışdı. Hələ əkməmişdən, səpməmişdən əvvəl

3 ***1992-ci ildə Başkənd Azərbaycan ordusu tərəfindən dağıdılmışdı.***

bu ”ağıllı qonşular” dolunun qarşısını almaq haqda düşünürdülər. Amma nədənsə Azərbaycanda bunlar həyəcan təbilinə çevrilməyə qadir deyildi. Çünki Azərbaycana rəhbərlik edənlər Moskvanın burnu- qulağı noxtalı nökərləri idilər.

Ermənistandakı cəhənnəm əzabını hər dəqiqə, hər saat öz gözləri ilə görən azərbaycanlılar yəqin etmişdilər ki, ermənilər onları dədə-baba yurdlarından çıxaracaqlar. Moskvanın mövqeyi, ermənilərin təcavüzkarlığı bu fikri təsdiqləyirdi. Belə bir vəziyyət dəfələrlə baş vermişdi. Ermənilərin yaşadığı bu günkü Ermənistan beləcə bərqərar olmamışdımı? Məhz belə bir şəraitdə bunu görüb duymamaq ən azı siyasi naşılıqdan başqa bir şey deyildi. Ona görə də Ermənistandakı azərbaycanlıların nümayəndələri Ağdama, Şuşaya gedərək Dağlıq Qarabağ Muxtar Vilayəti ərazisində yerləşdirilmələrini yerli əhalidən və Azərbaycan hökumətindən xahiş etdilər. İnsafən yerli əhali (azərbaycanlılar) bu təklifi bəyəndilər və müdafiə etdilər. Onsuz da həmişə başsız başçılardan ziyan çəkmiş millət yenə də tarixlər boyu yaddan çıxmayacaq siyasi naqisliyin şahidi oldular. Rəhbərlik Ermənistandan gəlmiş azərbaycanlıları görən kimi aman Allah, ”daş atıb başını tutdu ki, elə şey olar?!. Hardan gəlibsiniz, tez oraya da qayıdın”, - dedilər!

Əslində belə bir təklifin həyata keçirilməsi iki nöqteyi-nəzərdən əhəmiyyətli idi. Birincisi, Ermənistan hökumətinin etirazı bu vaxt əsassız olacaqdı. Çünki Ermənistandan çıxarılan əhalinin Qarabağda yerləşdirilməsinə Ermənistan hökumətinin qarışdığı təqdirdə Azərbaycan hökuməti tutarlı cavab verə bilərdi ki, siz istəmirsiniz onlar Ermənistanda yaşasın, onlar da Azərbaycanın bu guşəsində yaşamaq istəyirlər.

İkincisi, azərbaycanlılar Qarabağda yerləşdirilməklə bu ”ilan yuvası” gələcəkdə məhv olmalıydı. Lakin Ermənistandan

azərbaycanlılar çıxarıldı və Dağlıq Qarabağda yerləşdirilmədi. Bu baxımdan bağışlanılmaz tarixi səhvə yol verildi. Və bu da siyasi meydanda açıq-aşkar uduzmaq demək idi.

Deyirlər, tarix təkrar olunur. Xüsusilə, ermənilər köhnə ssenarilərindən bu gün də səmərəli istifadə edirlər. 1918-ci ildə azərbaycanlıların başına açdıqları müsibət bu gün də həmin xətt ətrafında cərəyan edir. Bu baxımdan azərbaycanlıların öz doğma ocaqlarından çıxarılmasını qış fəslinə salmaq ideyası da təzə deyildi. Onlar yaxşı bilirlər ki, yolları bağlayıb camaatı dağlardan aşırmaq əsl qırğın silahıdır. Bu silahdan məharətlə istifadə etmək, xalqı kütləvi qırğına məruz qoymaq deməkdir. Yeri gələndə həyasızlıqla ”biz neyləmişik, özləri küyə düşüb qaçıblar” deməkdən ötrü əməllərinə bəraət qazandırmaq üçün yer saxlayırlar.

1988-ci ilin sentyabr, oktyabr aylarında erməni millətçiləri ardı-arası kəsilməyən mitinqlər keçirir, türklərin çıxarılmasını tələb edirlər. Evlərə od vurulur, adamlar işgəncə ilə öldürülür, qadınların sinəsinə xaç çəkilir, uşağa, qocaya rəhm edilmir. İqtisadi blokada insafsızcasına davam etdirilir. Çöllərdə çobanlara hücumlar çəkilir, mal-qara oğurlanır, qoyun-quzu aparılır, şikayət isə keçmir. Mərkəz görməməzliyə vurur. Belə qəddarlıq önündə yenə azərbaycanlılar təqsirkardırlar... Bəs bu yazıq millət dərdini kimə deməlidir?!

Çox təəssüflər olsun ki, Bakıdan göndərilmiş yoldaşların bəziləri xalqa mənəvi dayaq olmaq əvəzinə, milliyyətcə erməni olan rəhbər işçilərlə “şirin söhbətdən sonra” görüşüb geri qayıdır və “əşi, şayiələrə inanmayın”- deyə bütün Azərbaycanı aldadırdılar. Qəribədir, dünən başımıza gələn bəlalara ”şayiə” deyib, ”şayiə” yazanlar, bu gün imzasına baxıb, görən əməlinə nə qiymət verir?

Nəhayət, şayiə dediyimiz həqiqət aşkar şəkildə meydana çıxdı; yüzlərlə günahsız insanın öldürülməsinə, minlərlə qocanın,

uşağın və qadının mənəvi və fiziki şikəstliyinə səbəb olan noyabr hadisələri...

Minillik tarixi yerlərindən cəmi yeddi gün ərzində vəhşiliklə çıxarılan azərbaycanlıların yandırılan evləri, əşyaları, talanan mal-qarası, nəhayət qaçqınlıq taleləri...

Bütün bu günahları kim işləmişdir? Məgər onlar bilmirmi torpaq üstündə qan axmalıdır? "Genosid", - deyə qışqıran canilərin, insan qanına susamış erməni qəsbkarlarının noyabr və dekabr aylarında törətdikləri vəhşiliklər bəşər tarixində ən böyük genosiddir. Biz imkan daxilində, şahidlərin ifadəsi ilə, heç bir artırıb-əksiltmə olmadan erməni quldurlarının həyata keçirdikləri yırtıcılığı göstərməyə çalışacaq, az da olsa oxucularda bu haqda təsəvvür yaratmağa səy göstərəcəyik.

Noyabr ayının əvvəllərində Ermənistandan azərbaycanlıların çıxarılması üçün son hazırlıq işlərinə başlandı. Söhbət belə gedirdi ki, aylardan bəridir **"türksüz Ermənistan"** məsələsi ortaya atılır, amma əməli heç bir iş görülmür. Ona görə də bu mühüm tədbir hər şeydən əvvəl yerinə yetirilməlidir. Bu vaxt məlum məsələ idi ki, qırğın törədiləcəkdi. Hansı rayon rəhbəri qırğın törə-

dilməsinin əleyhinə idisə, saqqallılar dərhal həmin rəhbər işçinin daşıdığı vəzifədən kənar olunması tələbini qoyurdular.

Krasnoselo rayon Partiya Komitəsinin birinci katibi S. Nazinyan öz millətçi mövqeyini əlindən verməsə də, insan tələfatına razı deyildi. Azərbaycanlılarla həmişə "canbir qəlbdə" olan, əmək fəaliyyətinə Cil kəndində müəllimliklə başlayan və bu camaatın daim xeyirxahlığını görən, azərbaycanca azərbaycanlı kimi danışan ikinci katib Hamlet Dallakyan saqqallılara söz verdi ki, əgər o birinci katib olarsa bu işin öhdəsindən gələ bilər.

Hamlet Dallakyan dərhal birinci katib seçildi və bir neçə gündən

sonra başlanacaq müsibətin məsuliyyətini üzərinə götürdü.

Respublikanın hər tərəfində belə bir qeyri-sağlam vəziyyət yaranmışdı. Onsuz da gərginlik içində sarsılmış Masis (Uluxanlı-Zəngibasar) camaatına qarşı öz cinayətkar əməllərini gizləyə bilməyən vəzifəli qəddarlardan rayon daxili işlər şöbəsinin rəis müavini İsgəndəryan, rayon İcraiyyə Komitəsinin sədri Qoven Gevorkyan, rayon səhiyyə birliyinin baş həkimi Nəsibyan, xəstəxananın cərrahı Qrişa Manukyan heç bir insaf və mürvət gözləmədən hər cür alçaqlığa əl atır, azərbaycanlıların qırğınını təşkil etməkdə cəllad rolu oynayırdılar.

Məhz bu adamların (təkcə bu adamlarınmı?) ciddi səyi altında qədim **Uluxanlı məscidi** yandırılıb, qəbristanlıq isə darmadağın edildi. Mövcud abidələr məhv olundu.

Basarkeçərdə birinci katibi dəyişməyə ehtiyac olmadı. Çünki Razmik Yenqoyan ikinci katib Aşot Akopyanla birlikdə həyata keçirilməkdə olan fitnəkarlıq hərəkatının başında dayanmışdılar. Rayon daxili işlər şöbəsinin rəisi Bahar Boxyan, Torf İstehsalat Birliyinin direktoru Qurgem Harutyunyan, Çaxırlı sovxozunun direktoru Arkadi Petrosyan, quşçuluq fabrikinin direktoru Albert Petrosyan da **”türksüz Ermənistan”** uğrunda başlanan avantürist kampaniyanın aparıcı ünsürlərindən biri idilər.

Bu kommunistlərin ***(erməni hər yerdə ermənidir.- E.İ)*** rəhbərliyi sayəsində qədim göyçəlilər gəlmə ermənilərin əli ilə qarlı-boranlı dağlarla Azərbaycana ”yola salındılar”. Onlarla azərbaycanlı döyülüb, ağır yara aldı və dağ yollarında həlak oldu. Maşını vurdurulan, çovğunlu-şaxtalı aşırımlarda ölənlərin sayı hələ də düzgün bilinmir. Onlarla köç maşını yandırıldı, yaxud sahibinin əlindən alındı. Nə qədər evlərin tüstüsü buludlara qalandı... Təkrar-təkrar öz qanlı sifətini göstərmiş erməni “mədəniyyəti” yenidən öz vəhşi simasını

belə biruzə verdi.



**Süleyman Məmmədov**

# ŞAHİDLƏRİN İFADƏSİNDƏN:

***PƏMBƏK KƏND SOVETİNİN SABİQ SƏDRİ YUSİF ƏHMƏDOV:***

-Noyabrın sonuncu günü idi. Bütün ermənilər ayağa qalxmışdı. Yaraqlıların əlindən tərpənmək olmurdu. Yollar boyu dağıdılmış maşınların, talanmış köçlərin, odlanmış pal-paltarın külünə baxanda adamın ürəyi

suya çəkilirdi. Mən ev əşyalarımı va mal-qaramı çıxara bilməmişdim. Düşünürdüm ki, rayonda vəzifəlilər hamısı məni tanıyır. Bəlkə də...

Dekabrın 5-də gəlib Gəncədən yük maşını apardım ki, köçümü aradan çıxarım. Krasnoselonun içindən keçəndə maşınımıza bir neçə güllə atdılar. Bu barədə Cil kəndinin altında postda dayanan hərbçilərə məlumat verdik. Lakin bizim şikayətimizə heç məhəl qoyan olmadı. Hər şey məlum idi. Sovet hərbçiləri də ermənilərin faşist mövqeyini müdafiə edirdilər. Bu ümid yerimiz də qırıldı... Deməli, bu qurğu yaman qurulub. Bacarıb canını bu fitnəkar məngənədən qurtarmaqdan başqa özgə işıq yolu görünmədi... Kəndimizə çatanda məni iki “Jiquli” qarşıladı. Kənd artıq ermənilərə qalmışdı. Altı nəfər yaraqlı qabağımı kəsib öncə kəndi tərk etməyimi tələb etdilər. Nədənsə sonra köçü yükləməyimə razılıq verdilər. Arxamca evə daxil oldular. Beş dəst yorğan-döşək, iki xalça, telefon aparatını və ov tüfəngini götürdülər. Evin əşyalarını səhərə kimi yükləyib aradan çıxa bilmədim. Həmin quldurlar səhər tezdən gəldilər. Bu dəfə onların arasında olan Vanik Hunanyanı görüb sevindim. Çünki

Hunanyanla duz-çörək kəsmişdik. V. Hunanyan “dostluğumuza”

görə məni öldürməyəcəyini dedi. Lakin onun əmri ilə 16 baş qoyun, 1 baş inək və 1 baş dananı əlimdən alıb əvəzində 100 manat pul uzadıb dedi ki, götür korluq çəkərsən. Mən pulu götürmədim...

***ŞƏFƏQ KƏND SAKİNİ ŞAHBAZ YUSİFOV :***

-1988-ci il noyabr ayının 24-də günorta saat 13 radələrində ermənilər kəndə hücum etdilər. Onlar ilk növbədə rayon Soveti İcraiyyə Komitəsinin sədri vəzifəsində işləyən həmkəndlim Müseyib İmaməliyevin evini yandırmaq istəyirdilər. Kənd sakinləri müqavimət göstərəndə erməni quldurları qaçmağa başladılar. Kəndin qurtaracağında yolun kənarındakı üç evə və mənim ot tayama od vurdular. Yanğını söndürə bilmədik. Kəndimizin sakini İsa Cavadovun evi tamamilə yandı. Gecdən-gec yanğınsöndürən maşınlar gəldi. Lakin yanğını söndürmədilər.

Rayon ət tədarükü məntəqəsinin işçiləri 2 inəyi, 1 düyəni, 1 dananı, 6 qoyunu ət tədarükü adı ilə apardılar, əvəzində bir qəpik də olsun pul vermədilər.

# BÜTÜN ERMƏNİSTAN AYAĞA QALXMIŞDI

Ermənistan respublikasının hər yerində hadisələr təxminən eyni şəkildə inkişaf edirdi. Bu avantürist siyasətin başında, əsasən, rayon partiya komitələrinin birinci katibləri dururdu.

Noyemberyan rayonunda azərbaycanlıların sayca azlığına baxmayaraq rayon partiya komitəsinin birinci katibi Sayad Petrosyan, rayon daxili işlər şöbəsinin rəisi Martik Qalumyan, rayon dövlət təhlükəsizliyi komitəsinin sədri Hrand Vartanyan, OADKYC (Orduya, Aviasiyaya, Donanmaya Könüllü Yardım Cəmiyyəti) rayon şöbəsinin rəisi Arutunyan, "Zeytun" sovxozunun direktoru, respublika Ali Sovetinin deputatı Suren Arutunyan, Baqrataşen kənd Sovetinin sədri Qrişa Kspoyan va başqalarının rəhbərliyi altında onlar 3 gün ərzində zorla öz yurdlarından çıxarıldılar.

Qonşu Gürcüstanın (Sarvan rayonunun) Sadaxlı, Qasımlı, Gorarxı, Saral, Baydar və s. kəndlərinin igid əhalisi olmasaydı, yəqin ki, Ləmbəli və Körpülü camaatını sağ-salamat buraxmayacaqdılar. Camaat 8-10 ay müvəqqəti olaraq bu kəndlərdə yerləşdi.

Şəmkir rayonunun Çardaxlı kəndindən gələn ermənilərin Körpülüdə yerləşdirilməsi planı qabaqcadan hazırlanmışdı. Hər şey həmin plana uyğun şəkildə həyata keçirildi.

İstər-istəməz belə bir fakt həqiqətə uyğundur ki, hər hansı bir dövlətin ərazisində yaşayan kiçik xalqlar yalnız həmin dövlətin hakimiyyət orqanları tərəfindən qorunub saxlanmalıdırlar. Bu baxımdan Ermənistan rəhbərliyi təəbəsində olan azərbaycanlıların müdafiə olunmasına nəinki biganə qaldı, hətta onların böyük faciələrinin təşkilatçıları oldular.

Noyabrın 25-də qəti bir ultimatumla elan edildi ki, Ermənistan ərazisini türklər təmamilə tərk etməlidirlər. Həm də bu vaxt "özünümüdafiə dəstələri" azərbaycanlıların qırğınını təşkil etmək üçün yaradılmışdı. Həmin hərbi dəstələr qətllər və talanlar törətməkdə az iş görmədilər.

Camaatın öz doğma yurdundan asanlıqla çıxmayacağını hiss edən rayon rəhbərləri kənd-kənd gəzib bildirirdilər ki, təşkil olunmuş hərbi dəstələrdən biz sizi qoruya bilməyəcəyik. Hər kəs öz başının çarəsini vaxtında qılmalıdır. Rəhbərlər bununla həm öz vəzifələrini "bitmiş" hesab edir, həm də türklərin bu torpaqları tərk etməsi üçün öz xalqı qarşısında xidmətini yerinə yetirirdilər.

Bundan sonra erməni yaraqlıları silahlı qırğına keçdilər. Hər yan alışıb-yanır, insan fəryadından qulaq tutulurdu. Bir vaxt iki qotur keçi oğrusunu yerində yaxalayan Moskva heç nəyi eşitmir, guya hər şeydən "xəbərsizdir".

Azərbaycanlılar döyülür, öldürülür, yandırılır, başı kəsilir, maşınla vurdurulur, göydən asılırdı. Əsgərlər seyrçi mövqeyi tuturdular.

# MASİS- ZƏNGİBASAR HADİSƏLƏRİ

**Uluxanlı (Masis) rayonunun sabiq sakini, Yerevan (İrəvan) Pedaqoji İnstitutunun müəllimi BAHADUR QAFAROV bizə təqdim etdiyi izahatda yazır:**

On aydan bəri ardı-arası kəsilməyən erməni təcavüzü Zəngibasar camaatını cana yığmışdı. Bu müddət ərzində cəhənnəm əzabını diri gözlə görən azərbaycanlıların başına nələr gəlməmişdi... Tarixi abidələr dağıdılıb, məscid və qəbristanlıqlar yerlə-yeksan edilmişdi. İlk həmlələrdən birindəcə Cəfərabad kəndində (İrəvana söykənmişdi) XV əsrdən qalmış tarixi abidə də erməni xəyanətinə məruz qaldı. Rayonda əllidən artıq ev yandırılmış, xeyli adam öldürülmüşdü. Ağır zədə alanların sayı isə hədsiz dərəcəyə çatırdı.

Vəziyyət bütövlükdə noyabrın 20-dən sonra dəyişdi. Birdənbirə əsl qanlı qırğınlar başladı. İrəvan kimi nəhəng şəhərin bir addımlığında olan Zəngibasar əhalisi bir milyona qədər ermənininin ayağı altda çığnanırdı. Vəziyyətə nəzarat etməli olan hərbçilər ermənilərin silahını əlindən almaq əvəzinə, azərbaycanlıların yerdən əyilib daş götürməsinə belə imkan vermirdilər. Bizi ölümdən çox arxasızlıq sıxırdı. Yurdumuzdan, yuvamızdan çıxmaq istəmirdik. Əslində bu torpağın sahibi biz idik. Ermənilər buraya əsrin əvvəllərində və əllinci illərdə gəlib dolmuşdular. Arxalandığımız Sovet hökümətindən ümidimiz üzülmüşdü. Qədim Uluxanlı - Zəngibasar torpağını tərk etməli idik. Vətəni yadlara verib getmək isə ölümdən betər idi. Nə etməli? Artıq başını götürüb getmək özü də müşgül məsələyə çevrilmişdi. Yağı düşmən elə bir qəddarlıqla hərəkət edirdi ki, uşaqları bu fəlakətdən qurtarmaq bəxtə-taleyə

qalmışdı.

Hər tərəfdən erməni içində olan zəngibasarlıların heç nəyə inamı qalmamışdı. Yalnız sərhəd zonadan Türkiyə ilə həmsərhəd olan bu mahalın camaatı bir an imkan olsa sərhədi belə, keçməkdən çəkinməzdilər. Ancaq buna da imkan olmadığından, yolların büsbütün yaraqlılarla bağlandığından ölümlə əlbəyaxada yola çıxmalı olurdular.

Saqqallıların geniş, bol at oynatdığı bir şəraitdə kimi köçünü yükləyir, kimi yaralısını sarıyır, kimi maşın gəzirdi... Nalədən qulaq tutulurdu. Bəşər tarixində görünməmiş bir vəhşiliklə üzləşmiş azərbaycanlılar böyük, yaraşıqlı dədə-baba evlərini dolu qoyub çıxırdılar. Yüklənən maşınlar silah altda aparılıb özgə yerdə boşaldılır, elə də olurdu ki, od vurulub yandırılırdı. Amma son günlər evlərin yandırılması xüsusi tapşırıq əsasında dayandırılmışdı. Saqqallılar evlərə dolur, gözədəyimli xalça və palazları götürür, qızıl üzük və boyunbağıları dartıb alır, nəhayət, qarşısına çıxan qoca, uşaq, qadın olmasına baxmayaraq tüfəngin qundağı ilə sinəsinə, başına vurub çıxırdılar.

Ermənilər tərəfindən vəhşicəsinə döyülmüş bir çox zəngibasarlı ya yollarda, ya da Azərbaycana çatandan bir neçə gün sonra ölürdü. Bir həqiqəti də demək yerinə düşər ki, bu cinayətlərin başında rayonun məsul işçiləri durur, ancaq hər şeyi saqqallıların adı ilə bağlayırdılar. Gözü ilə görüb, qulağı ilə eşidənlər:

**GÜLSABAH VƏLİ QIZI ZEYNALOVA**:

-Qanlı-qadalı noyabrın sonları idi. Başımıza od yağırdı. Masisin (Uluxanlı) özündə yaşadığımıza görə çətinliklərimiz daha çox idi. Əhalisi ermənilərlə qarışıq olan rayon mərkəzində “dostla” düşməni seçmək olmurdu. Artıq qapıbir yaşadığın qonşular da xəyanətə

keçmişdi. Doğrudur, onlar öz əlləri ilə etməsələr də (edənləri də çox idi) işin təşkilatçıları kimi fəaliyyət göstərirdilər.

Belə bir vəziyyəti düşünəndə insanların dönüklüyü, etibarsızlığı adamı dəli olmaq dərəcəsinə gətirirdi. İllər boyu dostluq etdiyin adama qarşı xəyanəti ağlına gətirmək olmur. Amma gözümüzlə gördüyümüzə, canlı şahid olduğumuza görə əlimiz yerdən, göydən üzülür. İstər-istəməz düşünməli olursan; ey İlahi, bu ermənilər hansı kişilik meyarına əsaslanıb “dostluq” etdiyi yerdə dönüb düşmən kəsilirlər...

Vallah, biz belə dönüklüyü bacarmarıq. Hələ qonşuluq o yana dursun, uzaqdan-uzağa tanıdığımız adama da kələk gələ bilmərik! Mən Bakıda azərbaycanlıların erməniləri necə vicdanla müdafiə etdiyini görüb, millətimizin ürəyiaçıqlığına qibtə etdim.

Ancaq Masisin özündə elə bir qarışıqlıq yaranmışdı ki, heç nədən baş açmaq mümkün deyildi. Elə bil ki, bütün şəhər əhalisi bu yaşayış məntəqəsinə dolmuşdu. İynə atsan insan əlindən yerə düşməzdi. Tüfəng səsi, daş-kəsək şaqqıltısı bir-birinə qarışmışdı. Evlərin aynabəndini çilik-çilik eləyən daş-dəmir yalamasının vıyıltısından qulaq tutulurdu. Yaraqlanmış ermənilər küçələr boyu sel kimi axır, insan qanı içirdilər. Mən öz evimdə tənhalıqdan qorxaraq körpələrimi götürüb tez atamgilə tərəf yollandım. Düşünürdüm ki, bəlkə atamgildə xatadan sovuşa bildik... Küçədə bu vaxt başımıza daş yağmağa başladı. Hərəmiz bir tərəfə dağıldıq. Altı yaşlı qızım **Səfa (Cəfərova Səfa Novruzəli qızı)** birdən-birə torpağa sərildi. Namərd düşmən bu körpə qızın başından daşla vurmuşdu. Qan onu aparırdı. Ana ürəyi... Belə bir çətin vəziyyətdə başı kəsilmiş toyuq kimi partdayan Səfanı tez götürüb xəstəxanaya çatdırdım. Kaş çatdırmayaydım. Axı, kimin yanına aparırdım bu körpə balamı?! Sağ əldən sol ələ şikayətmi edirdim? Yox, şikayət etmirdim.

Yalvarırdım balamı qurtar deyə! Bala dərdindən naqis düşmənə yalvarırdım! Soyuq baxışlar üzümə nifrət qırovu çiləyirdi. Səfanın başından qan gedir, rəngi avazıyırdı.

Balam gözümün qabağında getdikcə saralırdı...

Mən sıxılmışdım. Gözümü açanda gördüm ki, atam və qohumlarım da buradadırlar.

Səfanın başını tənziflə sarımışdılar. Bu haqsız dünyaya baxmaqdan doyubmuş kimi getdikcə gözlərini qapamağa çalışan Səfanı qollarımız üstündə evə qaytardıq. O, babalarının tikdiyi evin divarına, tavanına göz gəzdirdi və iki damla yaş axıdandan sonra əbədiyyətə qovuşdu.

**MARİYA YEFİMOVNA:**

***Masis rayonunun Sarvanlar kəndindən qaçqın düşmüş, hal-hazırda Bakı şəhərindəki 21-ci Dağlıq küçəsi, ev 44, mənzil 46-da yaşayan, milliyyətcə rus Pyatova Mariya Yefimovnanın məktubundan sətirlər:***

-"Tambov vilayətinin Ozersk kəndində doğulub boya-başa çatsam da, taleyin hökmü ilə öz həyat yolumu azərbaycanlılarla birgə keçməyi müəyyənləşdirdim. Buna görə taleyimdən razı qaldım. Təkcə gəlini olduğum ailə deyil, eyni zamanda bir kəndin, elin timsalında Azərbaycan xalqının yüksək insani keyfiyyətləri ilə tanış oldum və bu nəcibliyə vuruldum.

Evində xoşbəxtliyimi tapdığım Abbas Mürsəl oğlu Əliyev Masis rayonunun Sarvanlar kəndindən idi. Bu evdə və bu kənddə ömrümdə bir dəfə də olsun xətrimə dəyən olmadı. İstər sarvanlılar, istərsə də həyat yoldaşım Abbasın qohum-əqrəbası tərəfindən soyuqluq görmədim. Bu mehriban ailədə dörd uşaq böyütdük-qanlarında Vətən sevgisi, insanlığa məhəbbət.

Gözəl güzəranımız, halal əməyimizlə məşğul olarkən erməni

millətçiləri birdən-birə böyük Vətən sevgisi və insanlığa məhəbbət hissini millətçilik "toxmağı" ilə çilik-çilik eləyib ayaqlar altına tökdülər.

Fevral hadisələri sübut etdi ki, onlara beynəlmiləlçilik adı altında şovinist millətçilik, daha doğrusu, faşist ruhu hakim imiş. İnsafən desək azərbaycanlıların qonşuluq taleyinə mayası millətçiliklə yoğrulmuş xəyanət düşmürdü.

Erməni vəhşiliyi camaatı cana gətirmişdi. Həyasızlıq həddini aşmışdı. Şər-böhtan danışmaqdan, tutduqları işi ört-basdır etməkdən çəkinmirdilər. Qəribə orasıydı ki, döyüləni, öldürüləni utanıb-qızarmadan belə, azərbaycanlıların adına yazırdılar. Azərbaycanlılar çox ağır günlər keçirirdilər. Şikayətləri keçmir, silahları yığılır, dinəni həbsə alınırdı...

Yuxarıdan gələn əmr hamıya aydın idi: **"Bir neçə gün ərzində Ermənistanı türklərdən təmizləməli!"** Əslində ermənilər buraya gəlmə idilər, buradan onlar təmizlənməli idi!

Belə bir ciddi danışıqdan sonra əhaliyə necə qanlı divan tutulduğunu gözünüz önünə gətirin...

Erməni millətçilərinin bu quduz hərəkəti bizim ailədən də yan ötməməli idi. Hadisələrin inkişafı bunu göstərirdi. Nəhayət, noyabrın 30-da gecə qapımız döyüldü. Beş nəfər yaraqlı qapının ağzını kəsmişdi. Tələb edirdilər ki, qapını açın, içəri daxil olaq. Biz onları içəri buraxmayanda quldurlar bildirdilər ki, səhər gəlib qapını sındıracaq və sizi tikə-tikə doğrayacağıq.

İnsan qanına susamış cəlladlar itiləndən sonra qərara gəldik ki, səhər tezdən, yəni dekabrın 1-də sərhəd zonasında olan əsgərlərin yanına qaçaq. Atalar deyib ki, sən saydığını say, gör fələk nə sayır. Yox, burada fələyi qınamıram. Bu canavar dişli insanlara çörək verib, onlara havadarlıq edənləri qınayıram!

Səhər tezdən həyat yoldaşım Abbas çölə çıxdı. Mən də evi yır-yığış edib onun ardınca yollandım. Dörd tərəfə boylandım, Abbas görünmürdü. Sümüyümə üşütmə düşdü. Dizlərim əsə-əsə sağa-sola yüyürdüm. Evimizin qırx metrliyindən ötən kanalizasiya arxına çatanda Abbası suyun içində gördüm. Məsələ aydın idi... Hər dəqiqə bizi izləyən quldurlar pusquda durmuş, Abbas bayıra çıxan kimi ona ağır zərbələr endirmiş və sürüyüb arxa atmışdılar. Əlimlə onu yoxladım, gördüm hələ sağdır. Həkimə demək olmazdı. Çünki həkimlər də bu yola qulluq edirdilər. Tələsik hərbçilərin üstünə qaçdım. Nəhayət, onların köməkliyi ilə Abbası hərbi qospitala qoya bildim. Lakin aldığı son dərəcə ağır zərbədən sonra onu xilas etmək mümkün olmadı. Həkimlərin ciddi səyinə baxmayaraq, mənim üçün dünyada hamıdan əziz olan bir insan- ömür-gün yoldaşım Abbas dekabrın 2-də gözlərini əbədi yumdu.

Erməni hiyləsinin və qəddarlığının yüzlərlə qurbanlarından biri də Abbas oldu. Ömründə heç kəsə yamanlıq etməmiş bir insan...

Çox pis vəziyyətdə qalmışdım. Ərimin meyidini və ev əşyalarımızı aradan çıxarmaq lazım idi. Tələsik evə yollandım. Ev talanmışdı, 6 min manat pulumuz, xeyli qızıl üzük, boyunbağı və zinət şeyləri aparılmışdı.

Mənə Abbasın meyidini ya Gəncəyə, ya da Naxçıvana aparmaq lazım idi. Onun qohumları və yaxın adamları bu şəhərlərdə yaşadığına görə dəfn işi asan olsun deyə, məhz belə qənaətə gəlmişdim. Hər gün Masis rayon Daxili İşlər şöbəsində olur və rəis müavini İskəndəryandan xahiş edirdim ki, bu işdə mənə köməklik etsin. Hər dəfə milis işçisinə yaraşmayan, kobud, ürəyində zərrəcə mərhəmət hissi olmayan bu adamın sərt cavabını eşitdikcə elə bil ürəyimə xəncər saplanırdı.

Düz altı gün daxili işlər şöbəsinə gedib-gəldim. Heç kəsdən,

heç kimdən əlacsız adamlara zərrəcə yaxşılıq görmədim, hətta mən bunu onların sifətində də hiss etmədim. Bir daha ermənilərin nə qədər qəddar və amansız olduqlarını yəqin etdim.

Mən Abbasın meyidini, nəhayət, əsgərlərin köməkliyi ilə dəfn edə bildim. Bəli, ağızşirinliyimizi ermənilər belə pozdular!”

# BİR AİLƏNİN FACİƏSİ

**MASİSDƏ ÇIXAN "YENİ YOL" QƏZETİNİN SABİQ ƏMƏKDAŞI HƏBİB MAHMUDOV**:

Erməni daşnaklarının qırğın törətmək siyasəti təkcə güllə atıb adam öldürməklə bitmirdi. Onlar müxtəlif səpgidə, müxtəlif tərzdə qırğınlar törətməkdən bacarıqla istifadə edirdilər. Bu cür ölüm üsullarından biri də yollar boyu azərbaycanlılar olan avtomobilləri təqib etmək, sürücüləri karıxdırmaq və nəhayət, qəza törədilənə kimi qovmaq... Son anda isə vurdurmaq, nəticədə qan tökülənə qədər əl çəkməmək... Başkəsən erməni millətçiləri bu minvalla qan axıtmaqdan doymurdular.

Onlarla ailənin başına gətirilən bu müsibətdən yalnız biri haqda söz açmaq istəyirəm. Alovlanan Ermənistanın odu azərbaycanlıları yandırıb külə döndərirdi. Bu odun-alovun içindən can qurtarmaq, qadınları və uşaqları götürüb aradan çıxmaqdan başqa çıxış yolu qalmamışdı. Hər kəs özünü oda-közə yaxırdı ki, ailəsini quduzlaşmış erməni quldurlarının qaynar qazanından birtəhər uzaqlaşdıra bilsin. Lakin bu, hər vaxt, hər dəqiqə hər bir adama nəsib olmurdu.

Belə vəhşiliyin qurbanı olan, mənim söz açmaq istədiyim ailələrdən biri, Mehmandar kəndindən olan Cəfərovlar ailəsidir.

Heydərəli Cəfərov da öz uşaqlarını (mənim əmim oğlu) aradan çıxarmaq qərarına gəldi. Eldarla (qardaşım) birlikdə iki uşağını da götürüb Qazağa tərəf yola düşdü. Lakin Qazağın milis postunda onların geri qayıtmasını tələb etdilər. İnsafsız milis işçiləri imkan vermədilər ki, uşaqları Qazağa çatdırsınlar. Təkidlə geri qaytardılar. Yollar çox qorxulu idi. Hadisə hadisə dalınca törədilirdi. Heydərəligil Masisə qayıdıb Naxçıvana keçməyi qərara aldılar. Onlar Masis-

Artaşat yoluna düzələn kimi təqiblər başlandı. "ZİL" markalı yük avtomobili Artaşat şəhəri yaxınlığında az qaldı ki, həmin maşının üstündən keçsin. Bundan sonra açıq-aşkar qovhaqov başlandı. Sanki ölüm bu bədbəxt ailəni addım-addım izləyirdi. Kiçik Vedini ötüb Şirazlının səmtinə çathaçatda maşını gülləyə tutdular. Və bundan sonra hadisənin necə cərəyan etdiyi haqda məlumat yoxdur. Yalnız o aydındır ki, Heydərəligilin "Jiquli"si (maşını Eldar idarə edirdi) Naxçıvan MSSR ərazisinə daxil olmağa az qalmış qəzaya uğramışdır. Maşında olan dörd nəfərin hamısı həlak olmuşdur: **Cəfərov Eldar Allahyar oğlu (1955), Cəfərov Heydərəli Həsən oğlu (1953)** və **Heydərəlinin iki uşağı Cəfərova Ruhiyyə Heydərəli qızı (1976), Cəfərova Samurə Heydərəli qızı (1978).** Öz ata-baba yurdunu ürəkağrısı ilə qoyub qaçan, öz minillik torpağından bir qəbir götürə bilməyən bu günahsız azərbaycanlılar Şərur rayonunun Xanlıqlar kəndinin qəbristanlığında torpağın dərdinə, yarasına çevrildilər. Min illər də ötsə bu qəbristanlıqdakı başdaşılar buludlardan nəm çəkəcək, göz yaşı axıdacaq. Bu göz yaşları için-için hıçqırtısı eşidilən dörd qərib məzarın harayını nəsillərə çatdıran mürəkkəbə çevriləcək. Bu qəbristanda uyuyan ruhlar ziyarətə gələnlərə pıçıldayacaq:



**Eldar Cəfərov**

- Ey insanlar, siz bizi ağlamayın! Ölüm hamı üçündür, biz də öz vaxtımızı yaxşılı-yamanlı başa vurmuşuq! Gəlin birlikdə ağı deyək,

birlikdə ağlayaq! O qərib, günahsızlara uyuyan dörd qəbrə yas tutaq! Biz onları elə ağlayaq ki, bu ağı gələcək nəsillərin qulağından dünya boyu getməsin!

Bu qəbristandakı qəbirlərdən birinin başdaşında belə bir bayatı ürək yaxıb, qəlb dağlayır:

**Eləmi naşı ağlar,**
**Gözünün yaşı ağlar.**
**Qəbri qərib olanın**
**Qəbrinin daşı ağlar.**



**Bəşir**

# ELƏ DƏ ÖLÜM OLAR?..

**RƏİS DADAŞOVUN** verdiyi məlumatdan:

1988-ci il noyabrın 27-də öz ailəm ilə birlikdə **Müşfiqin** (bacımın əri) ailəsini də Masis rayonunun Dostluq kəndindən götürüb Qazağa gətirdim. Məqsəd uşaqlarımızı ermənilərin hücumundan xilas etmək idi. Müşfiq isə noyabrın 28-də köçünü Kuybışev şəhərindən olan sürücü Nikolay Petroviç Belyankinin yük maşınına yığıb yola düşür.



**Müşviq Tağıyev**

Yolda baş verən hadisələr **N.P.Belyankinin** aşağıda verdiyi məlumatda şərh edilmişdir.

Müşfiqin ermənilər tərəfindən vəhşicəsinə öldürülməsi haqda Ermənistanın Sevan şəhərindən müstəntiq **Nizamovun (tatar)** vurduğu teleqramı 1988-ci il dekabrın 4- da Tərtərdə aldım.

Nizamovla telefonla danışıq əlaqəsinə girəndən sonra dekabrın 10-da İcevanın (Ermənistan SSR) DAM (Dövlət Avtomabil Müfəttişliyi) postuna gəldim. Nizamovla xəstəxananın qabağında görüşdüm. Onun qovluğunda (gizlətməyə çalışsa da) Müşfiqdən başqa 130 nəfərin adını gördüm. Xəstəxananın qabağında dayanmış maşında mənə Müşfiqin meyidini verdilər. Biz onu Goranboy rayonunun Qaradağlı kəndinə gətirib orada dəfn etdik.

Onu da deyim ki, Müşfiqin əl və ayaq barmaqları sındırılmış,

başının arxa tərəfi balta ilə çapılmış, bədəni xaç şəklində yarılmış və qolları ilə üzünün bir hissəsi yandırılmışdı.


**Müşviq Tağıyevin işgəncəli cəsədi**

Cinayət törədənlərin adları məlum olduğu halda, heç biri cəza almamışdır. Müşfiqin öldürülməsində iştirak edənlər adları aşağıda göstərilən canilərdir: Sarıbekyan Hraçik Artaşoviç-milis kapitanı, Barseğyan-DAM mayoru, əsas canilər isə Qriqoryan Lyova və Xaçatryan Robert Vazgenoviç. Əlimizdə olan digər bir məlumat:

Kuybışev şəhərinin sakini, sürücü **NİKOLAY PETROVİÇ BELYANKİN** verdiyi şahidlik izahatında (izahat 1989-cu il yanvarın 25-də yazılmışdır) yazır:

"Mən, Belyankin həlak olan Tağıyev Müşfiq haqqında onun qohumlarına və qardaşı Zeynal Tağı oğlu Tağıyevə məlumat verirəm.

Müşfiqlə birlikdə Dostluq kəndindən yüklü maşınla saat 15-00 da çıxdıq. Yerevandan kəsə yolla keçib Abovyana çatdıq. Abovyanda bizi yol-nəzarət şöbəsinin işçiləri–dispetçerlər saxlayıb, sənədlərimizi yoxladılar. Sonra yolumuza davam etdik. Sovakuğ kəndinə çatmamış oraya şlaqbaum qoyulduğunu və çoxlu adamın toplaşdığını gördük. Müşfiq məndən maşındakı yataq yerinə çıxmağa icazə istədi. Mən razılaşdım. Bir az sonra maşınımızı yenidən dayandırdılar. Bir nəfər mənə yaxınlaşıb bildirdi ki, maşını yoxlamaq üçün kənara çəkməliyəm. Sənədlərimi istədilər. Sonra furqonu açmağa məcbur etdilər. Mən kabinədən çıxanda artıq ayaq

yerində bir neçə adam dayanmışdı. Onlar maşını boşaltdılar və yenidən yükləyib kənara çəkdilər. Orada yenə də çək-çevir getdiyi vaxtda "Volqa" maşınında DAM işçisi gəlib çıxdı. Bir nəfər mayor mənə yaxınlaşıb onunla Sevana getməyi tapşırdı. Yanımda bir nəfər cavan oğlan oturandan sonra Sevana tərəf qayıtdıq. Sevana çatmamış maşını dayandırdılar. Həmin oğlan düşdü, onun yerinə bir nəfər milis işçisi oturdu. Yolumuza davam etdik. "Sevan" yol göstəricisinin yanında ocaq yanırdı. Buraya xeyli adam toplaşmışdı. Onların yanında bir "MAZ" özüboşaldan yük maşını dayanmışdı. Həmin maşınla qabağımızı kəsdilər. Dəstə ilə yeriyən adamlar hücum edib kabinəni açdılar. Məni döşümdən geri itələdilər. Müşfiq kapitanla birlikdə kabinədə idi. Səs-küy qalxdı və getdikcə partlayışa çevrildi. Bu vəziyyət beş dəqiqə çəkməli oldu. Adamlar kabinəni iki tərəfdən döyəcləməyə başladılar. Sonra mayor yaxınlaşıb məni "Volqa" da oturdub ratsiya ilə danışdı. DAM postuna gəldik. Xeyli sonra əsgərlər gəlib çıxdılar. Milis işçisi bildirdi ki, hadisə yerinə getməliyik. Biz oraya çatanda artıq maşın görünmürdü. Yoldan bir qədər kənara çıxanda şüşələri sınmış maşınımı tanıya bildim. Kabinəyə qalxıb oturdum. Müşfiq Tağıyev orada yox idi. Bir milis işçisi də yanımda oturub əmr etdi ki, milis maşınının arxasınca sürüb posta getməlisən. DAM işçisi ilə Yerevana tərəf – Abovyan (Ellər) postuna qayıtmalı oldum. Milis yolda mənə dedi ki, Müşfiq həlak olmuşdur. Abovyanda isə yükü qeydə almalıdılar. Dekabrın 5-də məni maşınımla Sevana gətirdilər. Və yükü orada avtomüəssisənin mənzillərindən birinə boşaltdıqdan sonra prokuraturaya gedib izahat verməli oldum. Hadisə yerində gördüyüm adamlar burada idilər. Dekabrın 7-də məni buraxdılar. Bundan sonra Kuybışev şəhərinə, evimizə qayıtdım".

Milliyyətcə rus olan Belyankinin ifadəsi erməni millətçilərinin

başkəsən əməllərini təsdiqləyən möhür deyilmi?! Sağa-sola çırpınan milis işçilərinin cani rolunda məharətli çıxışları bu şahidin ifadəsində öz əksini tapa bilmişdir.

**ELDAR SABİROĞLUNUN "MÜŞFİQ DƏRDİ" məqaləsindən:**

"... El pərən-pərən düşmüşdü. 1988-ci il noyabr ayının sonlarında Ermənistanda yaşayan azərbaycanlılara qarşı törədilmiş vəhşilik hərəni bir yana salmışdı. Ata baladan, bala anadan ayrı düşmüşdü. Uluxanlı camaatının bir hissəsi Qaraqışlaq kəndinin əkin sahələrində altı gün on dərəcə şaxtanın altında gecəli-gündüzlü haray qopardı. Ananın qucağında ikiaylıq körpəsi dondu, neçəsi sağalmaz xəstəliyə tutuldu. Düşmən nə cavana, nə qocaya baxırdı. İndi də o faciəli anı xatırlayanda bədənim titrəyir. Bu qəddarlıqdan canını qurtarmaq üçün Müşfiq də çöllərə düşmüşdü. Hiyləgər düşmən onu Göyçə gölünün sahilində yaxalayıb qanına qəltan etdi. Cəlladlar papirosları yandırıb odlu kötükləriylə nəfəssiz Müşfiqin bədəninə neçə yerdən dağ basmışdı, gözlərini çıxartdıqdan sonra sifətini yandırmışdılar... "

Həyat yoldaşı iki körpəsi ilə Müşfiqin yolunu gözləyirdi. Kimdən soraqladısa xəbər verən olmadı, talesiz ana balalarının əlindən tutub Müşfiqini axtarmaq üçün qapılara düşdü, "bel bağlayıb" Moskvaya son qəpiyinəcən xərcləyib neçə-neçə məktub, teleqram göndərdi. Daha bilmirdilər ki, bu həsrət onların gözlərində əbədi qalacaqdır. Nəhayət, çox üzüntüdən sonra Müşfiqin ölüm xəbəri gəldi. Erməni quldurları meyidi vermək üçün kəsmət qoydular. Valideynləri məcbur olub balasının meyidini dörd min manata satın aldılar.

Zəngibasar torpağı yaş odunla qalanmış tüstülü ocağa bənzəyirdi. Vaxtilə, əsasən, azərbaycanlılar yaşayan bu torpaqda indi yağılar at oynadır, qan tökürdülər. Zəhmət kəndinin sakini 38 yaşlı Qənbər

Cəmil oğlu Qasımov itkin düşdü. Əslində itkin düşmədi...

Sarvanlar kəndinin sakini 30 yaşlı Bəxtiyar Məmməd oğlu Abbasovu noyabrın 28-də Naxçıvana gedərkən yolda maşınla vurdular. Ağır vəziyyətdə olan Bəxtiyarı Naxçıvan xəstəxanasına çatdırmaq mümkün olmadı. Bu günahsız cavanı qohumları Sabirabadın Həşəmxanlı kəndinə gətirib orada dəfn etdilər.

## ÖLMƏYƏ VƏTƏN YAXŞI...

“Vətən səsi” qəzetinin müxbiri **Bilal Ənsər** Məhərrəm haqda yazdığı yazıya məhz bu başlığı vermişdir. Yaxşı başlıqdır. Ölməyə Vətən yaxşıdır... Bəs Vətən yad əlində olsa necə? Vətəndə qismətinə bir qəbir payı belə verilməsə necə? Vətəndəki qəbirlər buldozerlə kürünsə necə?



**Məhərrəm Quliyev**

Nə isə mətləbdən uzaq düşməyək. Məhərrəmin faciəsi ilə tanış olaq.

Demokratiya və aşkarlıq işığında ortaya çıxan ”Türksüz hayastan” şüarından od yağırdı. Camaat öz canından da bezmişdi. Təhqirlər, təqiblər, işdənqovmalar ara vermirdi.

Belə bir zamanda, yəni 1988-ci il noyabrın 19-da Məhərrəm Bakıya gəldi. Bacısı Ziba və dayısı Səməddinlə görüşdü. Evini dəyişmək üçün sənədlər hazırladıqdan sonra, 8 nəfərlə Ermənistana döndü. Masis stansiyasında pusquda dayanan 200-ə qədər erməni ekstremisti quzğun kimi Bakıdan gələn qatarın üstünü kəsdi. 15-

20 nəfər erməni azərbaycanlıları tək-tək dövrəyə aldı: "Sizi göydə axtarırdıq, yerdə əlimizə düşmüsünüz",-dedilər.

Yolkəsənlər Məhərrəmin qollarını bağladılar, gözlərini sarıdılar, Səməddinin qolunu dəmirdən hazırlanmış oxla deşdilər. Alnından aldığı güclü armatur zərbəsi isə onu daş parçası kimi asfalta sərdi. Dayısının iniltisini eşidəndə Məhərrəm yaralı pələngə dönsə də aldığı zərbə imkan vermədi ki, onun dadına çatsın...

Noyabrın 29-da Zəngilər kəndində əsl qarmaqarışıqlıq düşdü. Kəndin əhalisi bir-birinə dəydi. Əliyalın azərbaycanlılar əlacsız qalıb Türkiyə sərhəd zonasına yığışdılar. Azərbaycanlı podpolkovnik Şirinovun təşəbbüsü ilə xalqın təhlükəsizliyi qismən təmin olundu.

Səməddin gözünü Yerevan-Bakı qatarında açdı. Özünə gələn kimi "Bacım oğlu hanı?"-deyib vaqondan atılmaq istədi. Ağrıları ona imkan vermədi. Öyrəndi ki, onunla gələn 8 nəfərdən 3-ü yoxa çıxıb. Dekabrın 4-də Səməddin Məhərrəm haqqında olan məlumat və şəkli Azərbaycan DİN-nə və Nərimanov rayon DİŞ-in cinayət axtarışı qrupuna təqdim etdi. Ümidlərini itirməsələr də, günləri cəhənnəm əzabından betər keçirdi. Zibanın göz yaşları qurumaq bilmirdi. Nəhayət, 1988-ci il dekabrın 10-da Azərbaycan DİN-dən çağırış vərəqəsi aldılar.

DİN-də podpolkovnik H.Y.Sultanovun kabinetində Məhərrəmin dəhşətli şəkillərini (sağ gözü çıxarılmışdı) görəndə dayıları Məhəmmədlə Səməddinin gözlərinə qaranlıq çökdü. Bu mənzərə dəhlizdə dayanmış Zibanın ürəyinə xəncər kimi sancıldı.

Səhəri gün SSRİ DİN-nin milis mayoru R.A.Şestakov və Azərbaycan SSR DİN-nin milis podpolkovniki H.Y.Sultanov tərəfindən Məhərrəmin qohumlarına arayış verdilər ki, onlar cənazəni gətirə bilsinlər. Anası Validə, atası Adoş, Əfqanıstanda

qulluğunu yenicə başa vurmuş qardaşı Mürşüd, kiçik oğulları və həyat yoldaşı Bəsti Məhərrəmin ölümündən xəbərsiz idilər. Ona görə də qohumlar Naxçıvana getməli oldular. Atası böyük qaynı Fazil və oğlu Mürşüd ilə birlikdə 5 əsgər və 1 zabitin müşayiəti ilə Ermənistana - Masis rayonuna yollandılar. Dədə-baba həyətində onları "ev sahibi" erməni qarşıladı. Məhərrəmin burada olmadığını öyrəndikdən sonra milis idarəsinə getdilər. Cənazəni götürməyə icazə vermədilər. Ehtiyatlı olmaq lazım idi. Yeni faciə baş verə bilərdi.

Naxçıvana qayıtdılar. Naxçıvan komendantının xüsusi tapşırığı ilə bir hərbi maşın, 13 əsgər və 2 zabit ayrıldı. Adoşun qohumları da həmin maşınla Ermənistana getdilər. Sərhəddə Adoşdan başqa bütün qohumları maşından düşürdülər. Maşın Masis rayonu DİŞ-nin qarşısında dayandı. Onları qarşılayan tanış müstəntiq Adoşu görən kimi dedi: Biz hələ Sumqayıtın əvəzini çıxmamışıq. Adoş dözdü. İcazə vərəqəsini alıb əsgərlərlə qəbristanlığa getdi. Cənazəni çıxaranda Adoşun dizləri titrədi, gözləri qaraldı. Rayon milis işçilərindən bir neçəsi dedilər ki, heyf, çox heyf, siz bu meyidi salamat aparırsınız.

Adoş bir yanında dayanan ermənilərə, bir də onu müdafiə edən avtomatlı əsgərlərə baxdı. Fikirləşdi ki, düşmən önündə alçalmaq olmaz. Ona görə də heç nəyə baxmadan cavablarını verdi.

Ermənilər hər vəchlə cinayəti gizlətməyə çalışırdılar. Zərərçəkənlərin isə şikayət məktubları göndərməkdən başqa heç nəyə imkanları olmadı. SSRİ Baş prokurorluğuna, Ermənistan SSR Ali məhkəməsinə, SSRİ Ali məhkəməsinə, Ermənistan SSR Masis rayon prokurorluğuna, Yerevan şəhərinin Orconikidze rayon xalq məhkəməsinə, Azərbaycan Vəkillər Komissiyasının Rəyasət Heyətinə və s. başqa əlaqədar təşkilatlara dönə-dönə ərizələr,

şikayət məktubları və teleqramlar göndərilmişdir. Nəticə isə...

**1989-cu il aprelin 4-də N18/67121-89 tarixli SSRİ prokurorluğu axtarışlar bölməsinin baş müstəntiqi A.İ.Ryabkonun imzası ilə Məhərrəmin ailəsinə bir məktub göndərilmişdir. Orada deyilir ki, Quliyev Məhərrəm Adoş oğlunun ölümündə müqəssir sayılan S.S.Sahakyan həbs edilmişdir.**

SSRİ prokurorluğundan alınmış bu cavabı oxuyanda adamı heyrət bürüyür. Necə ola bilər ki, boylu-buxunlu, pəhləvan cüssəli Məhərrəmin işgəncəli ölümündə bircə nəfər iştirak edib. Halbuki Məhərrəm aldığı 7 çapıq yaradan sonra da düşmənlərə asanlıqla baş əyməmişdir. Çapıqların 3-ü başından, 4-ü isə qol və qıçlarından idi.

Quliyev Məhərrəm Adoş oğlu Ermənistanda öldürülən yüzlərlə azərbaycanlılardan biridir. Beləliklə, düşmənlərimiz yeni bir ocaq da söndürmək istədilər. Ancaq o ocağın alovu müvəqqəti söndü. O ocaqda üç oğul böyüyür. Alovu sönmüş ocağın ətrafa nur paylayacaq üç gözü vardır - Əlisi, Raqifi, Coşqunu. Onlar böyüyəcək, nə üçün qaçqın olduqlarını, atalarının müqəddəs Vətən torpağı uğrunda öldürüldüyünü dərk edəcək, haqqı nahaqdan seçə biləcəklər.

Ən dəhşətli hadisələrdən biri yenə də Sevan şəhəri yaxınlığında - magistral yolda baş vermişdir. Bu hadisə eyni ilə gənc Müşfiqin başına gələn faciəyə bənzəyir. Çünki sevanlılar həmin dövrdə Yerevan-Bakı yolunun üstündə lövbər salıb türklərə bu cür divan tuturdular.

Belə bir müsibət ata-oğul Sabirlə İsgəndərin də bədbəxt taleyindən yan ötməmişdir.

**Nizami kəndinin sakini Cavad Qurban oğlu Azərbaycan Qaçqınlar Cəmiyyətinə verdiyi məlumatda yazır (məlumat "Azərbaycan" qəzetinin 29 iyun 1990-cı il tarixli nömrəsində**

**də getmişdir):**

*"1988-ci il noyabrın 28-də Masis rayonunun Nizami kəndindən Bakıya gələrkən qardaşım Sabiri, oğlu İsgəndəri Göyçə gölü yaxınlığında bir qrup saqqallı erməni saxladı. Türk olduqlarını öyrəndikdən sonra köməksiz ata və oğulun üzərinə hücum edirlər. Hadisə yerində Ermənistan milis orqanlarının nümayəndələri də vardı.*

*Sabirin şəxsi maşınını yandırdılar, 3 min manat pulunu, 14 min manatlıq əmanət kitabçasını və sənədlərini götürdülər.*

*Hadisə yerinə çatan bir mayor yarımcan ata və oğulu Sevan xəstəxanasına gətirir. Xəstəxanada onlara nəinki xəstələr, hətta tibb işçiləri də işgəncə verməyə başlayırlar. "Hippokrat and"lı tibb işçiləri İskəndər Mehdiyevin alnında yod şüşəsi sındırıb, gözlərini yodla doldururlar. İskəndər su istəyərkən tibb bacısı deyir:*

*"Bizdə türklər üçün su yoxdur". Bir milis işçisi isə İskəndərdən protokola qol çəkməyi tələb edir. İskəndər: "orada yazılanları görmürəm"-deyəndə milis işçisi ona bildirir ki, maşınınız aşıb, siz də qəzaya uğramısınız, protokol belə tərtib edilib, anladın! İskəndər qol çəkməkdən boyun qaçıranda milis onun qulağını kəsməklə hədələyir və sol qulağını yarıyacan bıçaqla kəsir.*

*Tamamilə köməksiz və müqavimətin mənasızlığını duyan, eyni zamanda eyibli və həqarətlə yaşamaqdansa ölməyi üstün tutan İskəndər protokola imza atıb huşunu itirir. Bundan sonra onu bir rus mayoru şəhər hərbi xəstəxanasına çatdırır.*

*Daşnaklar tərəfindən vəhşicəsinə döyülən, işgəncədən tanınmaz hala düşən Sabir dekabrın 4-də vəfat edir. Dekabrın 6-da isə bir möcüzə ilə sağ qalan İsgəndər Naxçıvan MSSR-in xəstəxanasına göndərilir. Dekabrın 7-də Sabirin meyidi Naxçıvanda təzədən yarılır. Və ekspertlər tərəfindən müəyyən edilir ki, ölümün səbəbi yol qəzası yox, güclü bədən xəsarəti, ağciyərdən qanaxma, beyinin zədələnməsi və başqa zədələr*

*olmuşdur.”*

Bəli, torpağımıza, daşımıza əvvəlki gündən beləcə sahib olublar. Erməni ayağı dəyməyən müqəddəs yurdlarımızı bu cür hiylə ilə əlimizdən çıxarıblar. Masis deyəndə adamın dili od tutub yanır. Babalarımızın minillər yaşadığı Uluxanlı erməniləşdirilib Masis olub.

Başı minbir bəla çəkmiş Uluxanlı... Övladları niyə belə fağır olub Uluxanlının? Nəyə görə onu düşmənə verib çıxıblar?

Erməni millətçiləri tarixi saxtalaşdırmaqda məşhuri-cahan olduqlarını yenə nümayiş etdirərək yazacaqlar: “Mərd və igid erməni oğulları türkləri qədim Masis torpağından qovub çıxardılar!”

Milli təəssübkeşlik bilməyən (çox təəssüf) Azərbaycan oğulları isə həqiqəti yazacaqlar: ”Sən ey namərd qonşu, məni o torpaqlardan öz hünərinlə deyil, qucağında oturduğun rus şovinizminin köməyi ilə çıxardın! Sən onun-bunun kölgəsinə sığınaraq, özünü yazıq xristian dərisinə bükərək, cəllad əllərini qanıma bulamısan! Sən babama da, atama da, mənə də bu qurğunu qurub, bu kələyi gəlmisən! Hələ bununla da dünyaya səs salmısan ki, qoymayın, türklər bizi qırdılar! Kor olmuş vicdanının qurumuş dili bir dəfə pıçıldamamışdır ki, axı türklərin canını boğazına yığmayınca bizə dəyib-dolaşmamışdır! Genosid deyib qışqırmısan. Gah yarım milyon, gah milyon yarım, gah da iki milyon erməni qırğınını artıra-artıra ”ağlamısan”. Bilirik, hələ bu rəqəmi çox artırmalı olacaqsan! Səni qınamıram. Çünki sən həqiqəti desən arxanda duran olmaz. Amma kişiliyin çatsaydı bir az da həqiqətdən söz açardın. Deyərdin ki, öz qəddarlığımı, vəhşiliyimi, namərdliyimi, vicdansızlığımı türklərin ayağına yazmışam. Deməyibsən, deməyəcəksən də. Çünki sən haqqın gözünə güllə atan, xörək yediyin qaba tüpürən, ayaq qoyduğun ocağa xəyanət edənsən!

Xəyanətkarsan! Yadına sal ki, Böyük Vətən müharibəsi illərində-

Rusiya-Almaniya müharibəsi zamanı Azərbaycan torpağı və onun ürəyiaçıq övladları səni özündən ayırmadı. Ancaq sənin qarnın doyan kimi...

# PƏMBƏKDƏ NƏLƏR BAŞ VERİRDİ

Kirovakan ətrafı rayonlarda azərbaycanlılara qarşı xüsusilə, Quqark rayonunun Vartana kəndində tarixdə misli bərabəri olmayan dəhşətli bir cinayət, müdhiş bir faciə törədildi. Lakin erməni lobbisinin əli ilə Moskvadan Azərbaycana göndərilmiş Mərkəzi Komitənin birinci katibi Ə. Vəzirov xalqımızın tarixinə ən dəhşətli qırğınlardan biri kimi daxil olacaq bu böyük müsibətlərin ört-basdır edilməsi üçün ermənilərdən də böyük canfəşanlıq göstərirdi. Azərbaycanlıların dərdi-səri təmamilə gizlədilir, nəinki dünya xalqlarına çatdırılmır, hətta azərbaycanlılar belə erməni vəhşiliyindən xəbər tuta bilmirdilər. Azərbaycanın bu rəhbərliyi "zəka qalib gələcək" deyə aləmə car çəkir, hər bir azərbaycanlının göynərti və sızıltısını şayiə adlandırırdı. Öz alçaq niyyətlərini həyata keçirmək üçün ermənilərə bundan qiymətli ərməğan ola bilməzdi. Ə. Vəzirovun erməni qardaşlarının "məkr, xəyanət və ölüm dəyirmanı"na axıtdığı bu sularda axtarmq lazımdır. Bu gün yüz minlərlə soydaşımızın nakam taleyini xarabazara çevrilmiş kənd və şəhərlərimizin müsibətlərini doğrudan da öz məkrli siyasətini həyata keçirmək üçün Azərbaycan rəhbərliyinin susmasından əlverişli nə ola bilərdi?! Sumqayıt hadisəsini dünyaya car çəkən ermənilər Quqark hadisəsini ört-basdır etməklə ən ağır cinayətin üstünü örtdülər. əlbəttə, digər hadisələr kimi Quqark, Masis hadisələri də Azərbaycan rəhbərliyinin kütlüyü, xəyanətkarlığı ucbatından gizlədilirdi. Beləliklə də torpağı alınan, öldürülən, yurdundan-yuvasından didərgin salınan azərbaycanlılar dünyaya vəhşi kimi təqdim edilirdi.

# ZÜLM ƏRŞƏ DAYANAN YERDƏ

**Barını bağlar tutar,**
**Tutmasa ağlar tutar.**
**Pəmbək eli dağılıb,**
**Yasını dağlar tutar.**

Dağlardan aşmaqla canını namərd düşməndən qurtarmağa çalışan azərbaycanlı qaçqınların şəklini çəkən ermənilər mətbuat səhifələrində car çəkirdilər ki, baxın, vəhşi qonşular əzabkeş qonşuların başına nə oyun açır... Yəqin ki, tarixdə misli bərabəri olmayan dəhşətli Quqark hadisələrini də lentə alıb deyəcəklər: "Baxın, ey insanlar, biz fəqir erməniləri azərbaycanlılar belə məhv edirlər. İnsafsızcasına yandırır, başını kəsir, tikə-tikə doğrayırlar".

Amma boğazından dara çəkilsə də, zülmün əli ilə ağzı qapansa da haqq bir gün qara buludların arxasından günəş kimi sıyrılıb çıxacaq. Çıxacaq və deyəcək: -Ey müdrik insanlar, insan qanına susamış ermənilər öz əməllərini dinc, rahat Azərbaycan türklərinin ayağına yazır. Bütün qəddarlıqların təşkilatçısı erməni millətçiləridir. Quqarkda (əslində Kirovakanda) azərbaycanlıların başına açılan faciələr bəşər tarixində yeni hadisədir.

Kirovakan şəhəri ətrafında yaşayan azərbaycanlılara qarşı törədilən cinayət hadisəsi yalnız insani duyğularını itirmiş Andronikin 1918-ci ildə təşkil etdiyi hadisələrlə eyniləşə bilər.

Kirovakanda baş verən hadisələrin dərinliyinə baş çəkəndə, mahiyyətinə varanda istər-istəməz düşünməli olursan: İlahi, görəsən erməni quldurlarının təşkilatçıları armatur şişlərini nə vaxt düzəltdirmişdilər?! Eyni armaturdan, eyni ölçüdə, eyni

dəmirçixanalarda düzəldilmiş şişlər Sumqayıt hadisələrində **Qriqoryanın** əlində ermənilərə, Kirovakanda isə **Şaumyan (keçmiş Vartana) kənd sovetinin sədri Jora Arakelyanın** əlində azərbaycanlılara sancılırdı.

Kirovakanda təbiət də ağı deyib ağlayırdı. Elə bil ki, ulu tanrı da bu arxasız insanlardan üz döndərmişdi. Quduzlaşmış insanlar bir-birinin ətini yeməyə hazırdı. Daşqəlbli düşməni nə uşaq fəryadı yumşaldırdı, nə hamilə qadın naləsi, nə qoca yalvarışı... Axan göz yaşını bir arxa bağlasan öz yatağına sığmayıb böyük bir çaya çevrilər. Haqsızlıq elə artıbdır ki, artıq zülm ərşə dayanan yerdir...

Dünyaya demokratiya dərsi keçən, insan haqlarından gen-bol istifadə edən xristian dünyası bu soyqırımı görmək istəmir. Çünki qıran xristianlar, qırılanlar isə müsəlmandı. Həm də müsəlman türküdür...

İnsanlıq tarixinin ən dəhşətli, ən qəddar, ən vəhşi bir qətliamı Quqarkda törədildi. Sovet əsgərlərinin gözü qabağında böyük ölçülü dəmir su borularına 72 azyaşlı azərbaycanlı uşaqları doldurub ağzını qaynaq edib bağladılar. Bu zülmü rus əsgərlərinin müşaiyəti ilə erməni faşizmi törədir, dünya isə susurdu. Çünki bu, böyük bir planın- xristan dünyasının məqsəd və amalı idi. Necə ki, hazırda hər gün dünyada tonlarla müsəlman qanı axır (İraqa, Əfqanıstana, Suriyaya, Misirə, Liviyaya, Tunisə, Fələstinə və digər müsəlman ölkələrinə bax).

Quqarkda baş verən bu hadisələrə heç olmasa insanı nöqteyi- nəzərdən, heç olmasa vicdan baxımından dinən olmadı. Əksinə böyük dövlətlər, demokratiya, insan haqları deyib dünyanı silkələyən xristian dövlətləri bu hadisələri eşitməz və görməz olmuşdu. Əksinə, guya məzlum ermənilər azərbaycanlılar tərəfindən sıxışdırılır, incidilir, qətliama məruz qalırdılar. Qərb mətbuatı bu haqsız, ədalətsiz savaşda açıq- saçıq ermənilərin

tərəfində dayanmışdı. Azərbaycan xalqı sahibsiz, təklənmiş, suçlu kimi boynuburuq qalmışdı...

# ODDAN-ALOVDAN ÇIXMIŞ ŞAHİDLƏR

**GÜLƏR BAĞIROVA** - Bakının Buzovna qəsəbəsində anadan olub. Pedaqoji İnstitutu bitirib. Quqark rayonunun Şaumyan (Vartana) kəndinə gəlin köçüb. 1974-cü ildən 1988-ci ilə kimi həmin kənddə müəllim işləmişdir. Hazırda isə Bakı şəhərindəki 254 saylı məktəbin müəllimidir.

**GÜLƏR BAĞIROVANIN GÜNDƏLİYİNDƏN:**

Qara buludlar Kirovakan (keçmiş Qarakilsə) şəhərinin göylərində daha çox dolanırdı. Hiss olunurdu ki, sahibsiz və köməksiz azərbaycanlıları burda hər cür fəlakət gözləyir. 1988-ci ilin fevralından keçən on ay ərzində düşdüyümüz müsibətlər az imiş kimi, noyabrda daha müdhiş, daha dəhşətli vəziyyət yarandı.

Hələ də Moskvaya ümid yerimiz kimi baxırdıq. Sən demə, qurğu elə Moskvadan qurulubmuş.

Bəli, noyabrın 20-dən sonra az-çox hardasa bir güvənc yerimiz vardısa o inamımız da xəzan dəymiş yarpaq kimi solub töküldü.

İş o yerə çatdı ki, milliyyətcə azərbaycanlı olanlara mağazalarda ərzaq satılmırdı. İş yerində "ərizəni yaz, xoşluqla çıx get",-deyə ciddi tələblər irəli sürülürdü. Rahatlıq göyə çəkilmişdi. İsti ocağa, evə həsrət qalmış camaatın günü meşələrdə, dağlarda keçirdi. Hər an qəfil hücum gözlənilirdi.

Gündən-günə vəziyyət ağırlaşır, imkansızlıq artırdı. Qadınlar, uşaqlar və qocalar bir yerə toplaşır, kişilər isə "dayandoldurum" ov tüfəngləri ilə silahlanmış vəziyyətdə daşların, divarların, çəpərlərin, çöldə qayaların arxasında səhəri dirigözlü açırdılar. Günlər keçir, heç yandan bir ümid işığı görünmürdü. Şaxtalı noyabr günlərində dağların soyuğuna, hər şeydən əvvəl haqsızlığa tab gətirməyən

körpələrin, qocaların son məkanı-məzarı dağlar olurdu. Dağlar da kimini ölümdən xilas edir, kimininsə ölümünə özü fərman verirdi... Nifrin dolu qarğışlar tük ürpədirdi.

Kömək gözləməyin, nəyəsə ümid etməyin mənasız olduğunu, getdikcə vəziyyətin daha da ağırlaşdığını başa düşənlər vaxtında, itkisiz doğma ocaqlarını tərk etməli oldular. Lakin partiyanın qüdrətinə, Sovet dövlətinin yenilməzliyinə inananlar böyük fəlakətlərə düçar oldular.

Fevralın 25-də basqın gözlənilirdi. Axşam məhəlləmizin adamları qonşumuz Gülməmmədin evinə toplaşdı. Saat 20 radələri olardı. Yerevan televiziyası yenə öz təcavüzkar mövqeyinə qulluq etməkdə idi. Yenə türklərin erməniləri minbir vəhşiliklə qırdıqlarından söz açan filmi göstərməkdə məqsəd aydın idi. Yaranmış vəziyyət ilə əlaqədar olaraq düşmənə sonsuz nifrət, son dərəcə amansızlıq hissləri aşılanırdı. Kim idi bu mərdimazarlıq toxumu səpən yaramazlara baxan... Hamının fikri-zikri başımıza gətirilən oyunun son ucunda idi.

Mənim əlim-ayağım şişmiş, vəziyyətim ağırlaşmışdı. Evimiz hündür təpənin başında olduğundan kəndimiz ovuc içi kimi görünürdü. Saysız-hesabsız maşın karvanının ağzı kəndə tərəf açılanda kişilər arvad-uşaqla cəld meşəyə və dağlara çəkilmək qərarına gəldilər. Ömrümdə ilk dəfə idi ki, özümə tanrıdan ölüm istəyirdim. Yeriyə bilmirdim. Məni addım-addım izləyən və yanından buraxmayan həyat yoldaşım Məmmədhəsənə və oğlanlarım Vüqarla Elçinə deyirdim siz geri qalmayın, ermənilər sizi öldürər. Vüqarın hıçqırıqlar içində “tez ol ana, maşınlar çatır” sözü məni elə bil yuxudan ayıltdı. Cəld qaranlıqda tikanlıqlar arasında gizləndik. Maşından tökülən ermənilərin vəhşi bağırtıları gəlirdi. Lakin azərbaycanlıların qaranlığa qərq olmuş evlərinə soxulmadılar. Av-

tomatlardan açılan güllələr ağacların budaq yarpaqlarını biçərək yerə tökürdü. Hiss olunurdu ki, silahlı olduğumuzu ehtimal edərək qorxub geri çəkildilər.

Bir gün sonra axşam saat 22-30-da atışma başlandı. Yenə də tikanlıqlara pənah gətirmişdik. Mənim işim daha çətin idi. 8 aylıq Elvini kiritmək mümkün deyildi. Bir azdan göylərdə şimşək tək parlayan alovun dilləri ilə birlikdə insan fəryadı ürəkləri titrətdi. Sümüyə işləyən şaxtanın dəhşətini unudaraq heç olmasa uşaqları aradan çıxarmaq barədə düşünürdük. Bir neçə gün əvvəl olub-qalan silahlarımızı yığmışdılar. Silahını təhvil verməyənlər də vardı. Onlar daha ciddi cəzaya məruz qalmışdılar. Alim Cəfərov, Şahmurad Bayramov, Həmid Cəfərov bu iş üstündə möhkəm döyülmüş, evləri yandırılmışdı. Nəhayət, İsmayıl ilə Şahmuradı həbs etmişdilər. Qurbanovlar ailəsi də belə bir haqsızlığa məruz qalmışdı. İlk dəfə kəndimizin erməni uşaqları əllərində olan daşla, ağacla, armaturla azərbaycanlıların evlərinə hücuma keçdilər. Elə həmin gündən kəndə tanımadığımız adamlar gəlib-getməyə başladılar.

Artıq maşın tapıb, aradan çıxmaqdan başqa özgə əlacımız qalmırdı. Noyabrın 26-da Quqark rayon Partiya Komitəsinin birinci katibi Baqdasaryan, rayon İcraiyyə Komitəsinin sədri Kazaryan, Daxili İşlər Şöbəsinin rəisi Abovyan, prokuror Markaryan və başqaları bizim kəndə gələrək camaata bildirdilər ki, yük maşını verəcəyik, ev əşyalarınızı yükləyəndən sonra sizi milis işçilərinin köməyi ilə Qazağa çatdıracağıq. Əlbəttə, bu sözlərin özündən də ifritələrin yeni bir kələyinin qoxusu gəlirdi. Bu kələkdən necə qurtaracağdıq onu Allah bilirdi. Necə deyərlər, bir Allahdan başqa ümid yerimiz qalmamışdı.

**MƏMMƏDHƏSƏN MƏMMƏDOVUN (Gülər Bağırovanın həyat yoldaşı) dediklərindən:** Kirovakan rayonu ərazisində yaşayan azərbaycanlılar dar məngənə arasında qalmışdılar. Əlaltından bir erməni azərbaycanlı dostuna gizli yolla çatdırmışdı ki, mənim kömək eləməyə imkanım yoxdur. Bacarsa uşağını aradan çıxarsın. Azərbaycanlıların kütləvi qırğını barədə plan hazırlanmışdır. Həmin qırğın, əsasən Kirovakan şəhəri ətrafındakı rayonlarda həyata keçiriləcəkdir.



**Süleyman Məmmədov**

Belə bir vəziyyəti eşidəndən sonra qardaşım Süleyman mənə dedi ki, sənin uşaqların körpədir. Özün də ermənicə yaxşı bilirsən. Nə qiymətə olur-olsun bir erməni maşını tap, uşaqları Qazağa çatdırmağa çalış. Mən elə də etməyi qərara aldım.

Qorxa-qorxa Kirovakana gəlib bir taksi sürücüsü ilə min manat pula razılaşdıq. Həmişə 25-30 manata getdiyimiz yolu indi min manata getməli idik. Lakin məni düşündürən bu deyildi. Barı uşaqları sağ-salamat bu cəhənnəm odundan xilas eləyə bilim.

Ailə üzvlərimi taksi maşınına mindirib yola çıxdıq. Şlaqbaum olan yerlərdə sürücü deyirdi: başınızı əyin görən olmasın. Beləliklə, Kirovakan ərazisindən çıxıb Dilican şəhərini ötəndə bir rahatlıq hiss etdim. Rahatlığım uzun sürmədi. ”Çayqarışan” deyilən yerdə milis işçiləri, saqqallılar və əsgərlər maşınımızı dayandırdılar. Pasportlarımızı yoxlayıb, azərbaycanlı olduğumuzu biləndən sonra bizi geri

qaytardılar. Səbəbi o idi ki, guya Krasnoseloda yeddi yaşlı erməni qızını azərbaycanlılar baltalayıblar. Ona görə İcevana çatan kimi sizi öldürəcəklər. Nə etməli idik... Geri qayıtdıq. Deməli, ölümə qayıdırdıq. Əgər kəndə girsək sağlığımıza güman yox idi. İçimdən qara qanlar axır, üzdə isə körpələr qorxmasın deyə, gülümsünürdüm. Sürücüyə dedim ki, Hallavar kəndi bütün azərbaycanlılardır, bizi oraya apar. Kəndimizin yanından keçəndə heyrət məni bürüdü.

Yolların kənarında ev əşyaları yanır, əzilmiş maşınlar yanı üstə düşüb. Məsələ aydın idi. Deməli, kənd viran edilmişdi. Qorkidən gəlmiş milis dəstələri cərgə ilə yolun qırağını tutmuşdular.

Hallavar kəndinə çatıb qohumlardan birinin həyətində maşından düşdük. Hallavarlılar başımıza yığıldılar. Bizi sorğu-suala tutdular. Başımıza gələn əhvalatı və kəndimizdə nə isə baş verdiyini bildirdim.

Ürəyim partlamağa gəlirdi. Qardaş-bacılarımdan, qohum-əqrəbamdan, daha doğrusu, doğma kəndimdən xəbər tutmaq istəyirdim. Uşaqlarımı və həyat yoldaşımı Hallavarda qoyub Vartanaya qayıtmalı oldum. Yolda Vaço adlı tanış erməninin idarə etdiyi maşına oturdum. Vaço qonşumuz idi. Aramızda heç vaxt narazılıq baş verməmişdi. Ondan kənddəki vəziyyəti soruşdum. O dedi ki, İsgəndərov Mehrəlinin 16 yaşlı oğlu Alim bir erməni öldürmüşdür. Bundan əlavə o, mənə heç nə demədi. Vaçonun maşını ilə əvvəlcə Arcut kəndinə gəldim. Burada kəndçilərimi görüb, onlara yaxınlaşdım. Baş verən əhvalatı təfsilatı ilə öyrəndim. Aydın oldu ki, kəndimiz darmadağın edilmiş, çoxlu adam öldürülmüşdür. Lakin bu adamlar mənə qardaşım Süleymanın öldürülməsi barədə heç nə demədilər.

Öyrəndim ki, yolların kənarında yandırılan ev əşyaları raykom katibinin aldadıb maşınlara yüklətdirdiyi 12 ailənin köçü imiş.

Sonra başa düşdük ki, əşyanı bayıra çıxarıb yandırmaqda məqsəd evləri qoruyub saxlamaqdan ibarət olub. Çünki evlər ermənilərə qalacaqdı.

Ermənilərin silahlı basqınına qarşı Arcut və Hallavar kəndlərinin camaatı çox böyük iradə və mərdliklə müdafiə olunurdular. Şaumyan (Vartana) kəndi dağıdıldıqdan sonra Kirovakan şəhərinin əhalisi Hallavar və Arcutu gözaltı elədilər. Noyabrın 28-i günü Hallavara soxulmaq qərarına gəlsələr də buna nail ola bilmədilər.

Həmin gün Arcut kəndindən olan Çoban adlı baytar həkimini Hacıqara kəndinin erməniləri xəstə inəyə baxmaq məqsədilə aldadıb aparırlar. Çobanı güllə ilə vurur, sonra da möhkəm döyürlər. Nədənsə o, ölmür. Bundan sonra onu milis idarəsinə aparır və məcburi qaydada yazdırırlar ki, məni bu vəziyyətə salan erməni yox, tanımadığım bir qrup azərbaycanlı idi.

Çobana deyirlər ki, siz türklər nə əclaf millətsiniz... Qarabağı vermədiyiniz bir yana qalsın, bu yandan da gözünüzü Şamxorun (Şəmkir) Çardaxlı kəndinə dikibsiniz? Həmin gözlər çıxarılmalıdır... Bilin ki, bütün Azərbaycan bizim olacaq!

Dəhşətli işgəncədən sonra Çobanı "Jiquli" maşınından gətirib Arcut kəndinin kənarında atıb gedirlər.

Həmin günlərdə Lvovdan gətirilmiş qoşun azərbaycanlıları azçox müdafiə edirdi. Bunu nəzərə alan hallavarlılar əsgərlərə evbaşı bir qoyun verdilər. Onlardan xahiş etdilər ki, camaatın Azərbaycan ərazisinə çıxarılmasına imkan yaratsınlar. Elə bir gərgin vəziyyət yaranmışdı ki, camaat ölüb-itəndən də xəbər tuta bilmirdi. Qardaşım Süleymanın ölüm xəbəri məni sarsıtmışdı. Bu ağır dərd onsuz da əyilmiş qəddimi daha da əymişdi. Nəhayət, qardaşım Süleymanın yanmış maşınını tapdıq və onun meyidini maşına görə müəyyənləşdirə bildik. Əslində biz onun meyidini deyil, külünü

tapa bildik. İki qardaş ürəyimizi boşaldıb külünü götürdük. Bu kül üç uşaq atası, günahsız Süleymanın külü idi.

Süleymanın 10-12 metrliyində Abdulla Əliyevi, Əhməd Əliyevi körpünün altında, Qərib Bayramovu isə suyun qırağında yandırmışdılar.

Erməni qatilləri elə bir faciə törətmişdilər ki, bu mənzərəni təsvir etmək üçün yalnız lentə almaq lazım idi.

Hadisə belə olmuşdur:

# BİR AİLƏNİN FACİƏSİ

Öz namərd, nakəs qonşusu Qaqo Qriqoryan başının dəstəsi ilə Mehrəli İskəndərovun evinə basqın edir. Silahlı basqından xilas olmaq məqsədilə Mehrəli kişi həyat yoldaşı Xanımla meşəyə qaçmalı olur. Bu vaxt doqquzuncu sinifdə oxuyan Alim gəlir ki, ev-eşik dağılıb və heç kim yoxdur. Meşənin qoynundan gələn səsi anasının səsinə oxşadır. Həyətdə gizlətdikləri ov tüfəngini götürüb, cəld səs gələn tərəfə götürülür. Bu vaxt kəndi alt-üst edirdilər. Öldürülən kim, ölümcül döyülən kim, evi talana gedən kim...


**Alim İsgəndərov**

Alim körpünün yanına çatanda görür ki, atasını və anasını ağaca sarıyıb əzab verirlər. O, tüfəngi üzünə götürməklə qatilin birini yerə sərməyi bir oldu. İkinci gülləni atmağa vaxt çatmadı. Avtomat şaqqıldadı... Alim üzü üstə torpağa sancıldı. Ağaca sarınmış Mehrəlinin və Xanımın gözü qabağında Alimin üstünə benzin töküb od vurdular. Zülm ərşə dayanan yer: atanın və ananın gözü qabağında balası yandırılır... Baxın, ay murdar türklər, baxın, yaxşı baxın... Sizə bu da azdır...- deyə tüfəngin qundağı ilə Mehrəlinin və Xanımın çənəsinin altından yuxarı qaldırırlar.

Hər cür işgəncədən sonra maşın təkərlərinə benzin töküb bu köməksiz adamların boynuna salır və od vururlar. Tüstü burula-burula göylərə bülənd olur. Bir ailənin bədbəxt taleyi beləcə sona

çatır. Ancaq belə bir haqsızlıqla barışmaq olmur ki, Mehrəli ilə Xanım xala bu müdhiş ölümlə çarpışarkən onların Alimdən böyük oğlu əlində avtomat sovet ordusunda Vətənə borcunu verirdi!

Eh, bu hələ harasıdır... Sən demə, Azərbaycan torpağını canavar dişi ilə parçalayacaqları bir vaxtda onlar müxtəlif ölüm üsulları da hazırlayıblarmış. Və bu cür ölümlərin hamısını öz dədə-baba qonşularının üzərində tətbiq etmək üçün fürsət gözləyirlərmiş. Sən demə, ermənilərin bu "ölüm planlarında" azərbaycanlıları başından ağaca mismarlamaq "üsulu" da varmış. Məhz bir çoxları kimi, Leyli Hüseynovanı da belə əzabla məhv etdilər.

Heç kəsə heç nə eləməmişik,-deyə dünyanın qulağını qut eləyən "əzabkeş və mədəni" ermənilər bax bu "savabın" sahibidirlər.

**MƏMMƏDHƏSƏN MƏMMƏDOVUN** daha bir qeydi:

*Vartana kəndindən on iki nəfər yandırıldı. Bunların yandırılması barədə hadisəni təsdiq edən dövlət sənədləri tərtib edilmişdir. Onlardan birini-qardaşım Süleyman Qənbər oğlu Məmmədovun yandırılmasını təsdiq edən sənədi təqdim edirəm:*

**SSRİ Prokurorluğu istintaq qrupunun rəhbəri kiçik ədliyyə müşaviri A. N. Nijeqrodtsevdən**

***ARAYIŞ***

***Quqark rayonu Şaumyan qəsəbəsinin sakini 1933-cü ildə anadan olmuş Məmmədov Süleyman Qənbər oğlu 27 noyabr 1988-ci ildə kütləvi ixtişaşlar vaxtı öldürülmüş və tamamilə yandırılmışdır.***

***Cinayət-axtarış işi N 33201448***

***9.02.1989-cu il.***

# GÖZ YAŞLARI DİL AÇIR

Bizimlə qabaq-qarşı oturmuş uca boylu, şux qamətli, gözlərində kədər ifadə olunan və danışdıqca qəhərdən boğazı tutulan müsahibimiz cibindən çıxardığı üç şəkli təqdim edir. Sonra da şəkillərdən birini əlinə götürür. Elə bil ki, şəkil onun əlinə yapışmışdır. Əlləri əsir, gözümüzün önündəcə bənizinə saraltı çökür, gözlərində yaş gilələnir... Göz yaşları dil açır, göz yaşları danışır, erməni qəddarlığına qarşı üsyan səsinə çevrilir.

O qəmli baxışlar, kədərli sima dil açıb dərdini danışır. Sevimli balasının şəklini ovcunun içinə sıxan Süleymanın dili deyə bilmədiyini dərd yüklü çöhrəsi danışır...

Biz bir də həmin şəkilə baxırıq. Bu ki, **Süleymanın** gəncliyidir. Bu ki, onun özüdür. Yoldaşlardan biri bayaqdan bəri hökm sürməkdə olan sükut buzunu parçalamaq məqsədilə deyir:

-Süleyman kişi, elə bil ki, bu şəkli gənclikdə çəkdirmisiniz?

-Bəli, o mənim gəncliyimdir. Gənclik dünyam, ciyərparamdı. Namərd düşmən onu qanına qəltan elədi. Nə isə oğul, erməni ömrü boyu bu millətə yağı törəmiş, biz isə üstündən ötüb keçmişik...

-Hadisə necə baş vermişdi?

O, gözünü məchul bir nöqtədən ayırmayaraq, sanki o müdhiş səhnənin içində ola-ola məlumat verirdi:

Quqark rayonunda kütləvi qırğın törətmək əməliyyatı Şaumyan kəndindən başlayıb digər kəndlərə də keçməli idi.

Noyabrın 27-də Kirovakan şəhərinin əhalisi kəndimizin üstünə yeridi. Ən dəhşətlisi o idi ki, kəndimiz ermənilərlə qarışıq idi. Onlar bizim hər birimizi izləyir və cəlladsifət daşnaklara məlumat verirdilər. Müəyyən müqavimətdən sonra camaat qaçıb meşələrə doldu və kənddə qalanların hamısı öldürüldü. Vaqif 9 nəfər

həmkəndlisi ilə birlikdə aradan çıxıb Dilican meşələrinə tərəf üz tutdu. Onlar bilirdilər ki, erməni quldurları meşələrə də daraşıblar. Ancaq çarə yox idi...

Dilican yaxınlığında silahlı erməni quldurları silahsız azərbaycanlıların qabağını kəsdilər. Silahlı ermənilər, silahsız azərbaycanlılar!



**Vaqif**

Məhz belə bir hazırlıqlı cinayət yüzlərlə silahsız azərbaycanlı kimi Vaqifi də məhv etdi. Tutulmuş doqquz nəfər silah altında işgəncə ilə döyülüb, ölüm həddinə çatan vaxt Vaqif qaçmaq istəyir. Quldur Beniamin Asatryanın avtomatından açılan atəş onu yerə sərir.

Minbir əzab-əziyyətdən sonra, hərbçilərin köməyi ilə Vaqifin meyidini aradan çıxarıb Şəmkirin Leninkənd qəbristanlığında dəfn elədim. Hər dəfə körpə Elçinlə Familin “atamız nə vaxt gələcək” sualı altında çəkdiyim iztirabdan dilim tutulur, donub qalıram. Bilmirəm nə deyim, necə deyim ki, siz atasızsınız? Ancaq deyəcəyəm, gec-tez deyəcəyəm! O vaxt deyəcəyəm ki, onlar hər şeyi başa düşəcəklər. Mənim bu gün çəkdiyim iztirabı bilib anlayacaqlar. Onda deyəcəklər: “Baba, niyə sən iztirab çakməliydin? Harda qalmışdı dünyanı lərzəyə salan ”qüdrətli Sovet dövləti?” Biz ki, onun təbəəsindəydik, biz ki, onun vətəndaşıydıq, bəs bizim pəhləvan gövdəli atamızı günahsız yerə qanına qəltan eləyən Zori

balayanları, Silva kaputikyanları niyə məhşər ayağına çəkmirdi?


**Fatma Əliqızı Əliyeva**

- Baba, sən niyə iztirab çəkməliydin? Onsuz da oğul dərdi səni sonsuz iztirablara qərq etməmişdimi? Sən ona görə iztirab çəkirdin ki, çiyərparanın iki yetim balası və onların anası Ofelya məlul-məlul sənin üzünə baxır. Sənin səsin isə heç bir daşürəkli vəzifəliyə yetmir, çünki bizim və bizim kimilərin yetimliyinə birgə qol çəkilibmiş."

Süleyman kişi barmaqlarını daraq kimi ağ, gur saçlarının arasında gəzdirib sakit-sakit sözə başlayır:

Eh, nə deyim! Dərd birdimi, beşdimi? Kəndimizə yaman divan tutdular, qardaş! Bu zülmə bircə nəfər kommunistəm deyən rəhbər işçi heç olmasa üzdə belə, etirazını bildirmədi. Bəzən vazgenləri qınayırlar. Bəs yetmiş ildən bəri inam gətirdiyimiz kommunistlər harada qalmışdılar. Elə qırğının başında duranlar kommunistlər deyildimi?.. Elə rayonun partiya rəhbərlərinin gözü qabağındaca Suren Zöhrabyan səkkiz uşaq anası Fatma Əli qızı Əliyevanı maşının altına salıb əzdirmədimi?!

Xəyanət ermənilərin qanını cövhərini təşkil etdiyinə görə onlar duz-çörək kəsdikləri adamlara da qəsd etməkdən çəkinməzlər. İşləri dara düşəndə and-aman edib aradan çıxar, xəyanətin dəmi çatdı fürsəti fövtə verməzlər. Vartana kəndində **Abdullanı** hamı pəhləvan cüssəli bir igid kimi tanıyırdı. Abdulla həmişə Qrikor Çavuşyan adlı birisi ilə duz-çörək kəsər və onunla ova gedərdi. Bəli,

əslində olan dırnağında göstərməlidir. Bu dar məqamda Qrikor Abdullanın kürəyindən nişan almaqla "pələng türkü" öldürdüyünə görə ermənilərin gözündə birə onqat ucaldı!



**Abdulla Oruc oğlu**

Abdullanın atası Oruc kişini boğazından bıçaqla ağır yaraladılar, anası Gülüsümü isə ölümcül hala saldılar. Gülüsümü ağır vəziyyətdə Bakıya gətirdilər və orada vəfat etdi.



**Ziyad Mustafayev**

İnandığımız sovet hökumətinin qanunları sətəlcəm olmuşdu. Azərbaycan xalqına, onun minillik torpaqlarına qarşı yönəldilmiş təcavüzkar plan sistemli qaydada həyata keçirilirdi. Bunun üçün öncə Ermənistandan azərbaycanlılar bütövlükdə çıxarılmalı idilər.

1988-ci ilin mayından etibarən Quqarkda azərbaycanlılar işdən öz razılıqları olmadan çıxarılmağa başladılar. İşdənçıxarma, yerli-yersiz təqiblər hələ də xalqın öz doğma torpağından getməsinə əsas vermirdi. Bunu dərindən hiss edən ermənilər kütləvi hücum kampaniyasına başladılar. Çox təəssüf ki, bu dövrdə Azərbaycan respublikasının rəhbərliyi Ermənistan rəhbərliyi qarşısında kəskin

məsələ qoymadı.

Rayon rəhbərlərinin tələbləri sayəsində kənd camaatının əksəriyyəti kassaya pul keçirib qəbz aldılar ki, göndərilmiş 20-yə qədər "KAMAZ" markalı maşınlara ev əşyalarını yükləsinlər. Maşınlar yüklənib bir yerə toplandılar. Rayonun məsul işçiləri də burada idilər. Verilən göstərişə əsasən maşınlar yükləri bir yerə boşaltdıqdan sonra od vurub yandırdılar. Bundan sonra camaatı Qazağa aparmaq adı ilə "LAZ" markalı avtobusa mindirdilər. Avtobus kənddən 2-3 kilometr aralandıqdan sonra meşədə avtobusun qabağı kəsildi. Məqsəd hamını məhv etmək idi. Bu vaxt Cəlal Abbasov və Sadıq Sadıqov qaçıb özlərini meşənim dərinliyinə verdilər. Görünür, bundan sonra qırğın törətmək fikrindən vaz keçdilər. Lakin avtobusda olanları döyüb, ölümcül vəziyyətə saldılar.



**Qərib Bayramov**

Kənddə qalan azərbaycanlılar həmin axşam meşədə gecələməli olur və belə qərara gəlirlər ki, səhərisi noyabrın 27-də qarlı-çovğunlu dağlarla 130-140 kilometr məsafəni piyada Qazağa getsinlər. Bu vaxt Qərib Bayramov səhər tezdən kəndə gəlir ki, isti paltar və ərzaq götürüb yola çıxsın...

Elə bu vaxt nadürüstlər, yəni öz qonşuları Hraçik Avakyan, oğlu David, arvadı Anik, Radik Martirosyan, arvadı Arev, Soğomon Soğomonyan, Qriqor Qriqoryan, Apres Qriqoryan və başqaları Qəribin yolunu kəsib evin açarlarını onun əlindən alırlar.

Sonra iki nəfər milis işçisi Qərib kişini aparıb Mehrəli İskəndərovun ailəsinin yandırıldığı yeri göstərib deyir:

-Bax, yaxşı bax! Siz türklərin hamısını biz belə külə döndərməliyik!

Milis işçiləri Qəribi qonşularına verib aralanırlar.

"Biz neylayax, günah saqqallılardadır" - deyən illərlə duz-çörək kəsmiş qonşular Qəribi diri-diri oda qaladılar.

Qərib Bayramovun dəhşətli ölümü ilə əlaqədar olaraq qohumları SSRİ Prokurorluğuna, SSRİ Daxili İşlər Nazirliyinə, nəhayət, Sov.İ KP-yə şikayət məktubları göndərirlər. Hamısından eyni cavab alınır:

-**"Sizin şikayətinizi Ermənistanda yerləşən SSRİ Prokurorluğunun istintaq qrupuna göndərmişik".**



**Qərib Bayramov**

Kirovakan faciəsi ətraf kəndləri tamam bürümüşdü. Təkcə müxtəlif ingəncələrlə adam öldürməkdən başqa, döyüb şikəst eləmək, ömürlük zəlil vəziyyətinə salmaq kimi qeyri-insani cəza tədbirlərinin həddi-hüdudu yox idi. Mal-qara, qoyun-quzu həm oğurlanır, həm də maşınla vurdurulur və zorla aparılırdı. Meyvə ağacları qırılır, ot tayaları yandırılır, itlər güllələnirdi. Minik maşınları dağıdılır və yaxud müsadirə olunurdu. Köçlər yüklənərkən gözədəyimli nə varsa götürülür, o cümlədən xalça-xalılar və çamadanlar açıq-aşkar aparılırdı.

İnsaf və mürvət göyə çəkilmişdi. Qocalar, qadınlar və uşaqlar, həmçinin şikəstlər işgəncə ilə məhv edilirdi. Ən dəhşətlisi o idi ki, gənclər öz ata va analarının gözü qabağında Bakı benzini ilə yandırılırdı. Heç də Arcut camaatının taleyi vartanalıların taleyindən yaxşı olmadı.

Gözümün önündəcə Elləzov Çoban Nəbi oğlunu güllə ilə yaralayıb. UAZ-469 markalı minik maşınını əlindən alıb apardılar. Hərbçilərə şikayətimiz isə küləyə qarşı atılmış kağız parçasına bənzədi.

Quliyev Üsən, Musayev Namaz, Məmmədov Sədi, Cəbrayılov Polad, İsmayılov Elman və bir çox başqaları Bakı və Qazax xəstəxanalarında müalicə olundular. Gözəldərə kəndinin sakinləri Məmişov Qiyas, Şahmalıyev Şəmməd, Daşdəmirov Piri və digərləri ölümün ağzından qoparıldılar. Vaxtında Azərbaycana çatdırılan yaralıların bir çoxları yenidən həyata qayıtdılar.

Ermənilərin qoyun sürülərini aradan çıxarması təzə haqq-hesab deyildir. Həmin günlərdə çoban Əhməd Hacı oğlu Məsimov otardığı 400 baş qoyunla birlikdə yoxa çıxdı. Bir azdan aydın oldu ki, bu işə rayon rəhbərləri rəvac verib, çoban öldürülüb, sürü isə aradan çıxarılıb. Əhmədin meyidini də geri qaytarmadılar.

Güllə ilə öldürülmüş Məmmədəli Musa oğlu Qasımovun, Gülüsüm İsa qızı Xəlilovanın meyidlərini öz dədə-baba qəbristanlıqlarında dəfn etməyə imkan vermədilər. Əlacı kəsilən camaat meyidləri aparıb Gürcüstanın Daştəpə və Qaçağan kəndlərində dəfn etdilər. Hüseyn İsa oğlu Qasımov isə yaralı vəziyyətdə Bakı şəhərinə gəldi və orada vəfat etdi.

Azərbaycanlılar söz götürmürlər. Bir göyçəli qadının bu sözlərini heç cürə unuda bilmirəm: "Aaz, a bajı, Allah heç kimə göstərməsin! Büyün rayona getmişdik, erməni dığaları üzümüzə tüpürdü. Elə

bildik ölüm bizə haxdı. Milisəsi də ordaja durub baxırdı. Bunnan sonra bunnarnan bizimki çətin tutajax”!

Bu sözləri hələ hadisələrin ilk günlərində deyən qadın bütövlükdə azərbaycanlı psixologiyasından, azərbaycanlı mənəviyyatından xəbər verirdi.

Erməni millətçiləri həmin psixologiyanı yaxşı bildiyindən azərbaycanlıları məhv etməyin müxtəlif yollarını müəyyənləşdirmişdilər. Mənəvi təzyiq, mənəvi hücum azərbaycanlıları ürək xəstəliyi keçirmək dərəcəsinə gətirib çatdırdı. Ləkəsi tarixdən heç bir haqla yuyulmağa layiq olmayan erməni “əməliyyatı” Azərbaycan xalqı üçün qurulmuş tələ, yönəldilmiş irtica, axıdılmış qan deməkdir.



**Telman Hüseynov**

Əvvəlki adı Qarakilsə olan Kirovakanın dörd ətrafındakı hər daşa, hər qayaya azərbaycanlı qanı çilənmişdi. Həmin şəhərin sakini Hüseynov Telman Çoban oğlunu öldürən ermənilər çox “xəsis” olublar. Belə ki, Kalaşnikov avtomatının güllələrinə qıymadıqlarına görə Telmanın boğazına tros salıb “ZİL” markalı yük maşınının arxasına bağlayıb sürütdürməklə qanını daşlara dağıtmışdılar. Bu günahsız adamın ölümündən ləzzət alan ”əzabkeş” ermənilər həmin səhnəni maraqla müşahidə edirdilər. Barı bunların arasında bircə nəfər belə, vicdanının səsi ilə hərəkət edən adam yoxdumu? Telmanla durub-oturan “mən ölüm, sən ölmə” deyən kirvələr məgər bu müdhiş

ölüm səhnəsini görmürdülərmi? Əlbəttə, görürdülər, özü də əlləri biləyəcən Telmanın qanına batmış halda...

Telmanın vəhşicəsinə öldürülməsi ilə bağlı SSRİ prokurorluğunun istintaq qrupunun müstəntiqi Qolubev istintaq işi aparırdı. İstintaq vaxtı şahidlər və milis cinayətkarları işi hər vəchlə gizlətməyə çalışırdılar. **Müstəntiq QOLUBEVİN hazırladığı işdə oxuyuruq:**

***"Mən, Hüseynova Gülcahan Çoban qızı, Telmanın bacısı. Telmanın öldürülməsi barədə işlə tanış oldum. Dindirilmə zamanı qatillər ifadə veriblər ki, milis işçiləri onlardan bıçaq və balta götürmüşlər. Lakin milis işçiləri öz ifadələrindən tamamilə inkar etmişlər" (C. 1, şəxsi iş, səh. 200).***

Telmanın bacısı Gülcahan Hüseynova Telmanın vəhşicəsinə öldürülməsi ilə əlaqədar olaraq aylarla Moskvada olmuş, yüzlərlə şikayət məktubu və teleqramı göndərsə də heç bir nəticə əldə edə bilməmişdir.

Daha bir amansız ölüm hadisəsi haqda şahid **ZEMFİRA ƏHMƏD QIZI KƏRİMOVA** belə yazır:

*-"Biz bölük-bölük olub meşəyə çəkilmişdik. Ana oğuldan, uşaq valideyndən, qardaş bacıdan aralı düşmüşdü. İnsan naləsi ərşə bülənd olmuşdu. Ölənlər, yaralananlar çox idi: Mən də iki uşağımla yüzə yaxın adamın içində bir talaya toplaşmışdıq. Əlisilahlı saqqallılar dörd tərəfimizi kəsmişdilər. Bilmirdik ki, bizi nə gözləyir. Ancaq onu bilirdik ki, ölüm bir addımlığımızdadır...*

*Buraya toplaşan azərbaycanlılar Kirovakan ətrafının müxtəlif yaşayış məntəqələrindən olduğuna görə adamların çoxu bir-birini tanımırdılar. Buna görə də döyülən, yaralanan adamları dəqiq müəyyənləşdirmək çətinlik törədirdi.*

*Meşənin qoynunda əsir olmuş azərbaycanlıların həmin vəziyyətinə*

*bənzər səhnəni mən kinofilmlərdə görmüşəm. Erməni quldurlarının amansız qəti tədbirləri alman faşistlərinin əsirlərin başına açdığı oyuna bənzəyirdi. Amma gözü ilə əsirliyi görənlər deyirdilər ki, faşistlər ermənilər qədər insafsız və qəddar deyildilər.*

*Onlar bizi avtomatların qundağı ilə, əllərinə götürdükləri dəyənəklə insafsızcasına döyür, itələyib yıxırdılar. Qarşıda çox da böyük olmayan su sızmasından əmələ gəlmiş palçıqlı göl var idi. Adamları tez-tez vurub suya salır və suyu süzülə-süzülə özünü qırağa verənlərə baxıb gülməkdən doymurdular. Bu zaman nə danışıb, nə qərara gəldilərsə hamilə qadını sürüyüb gölə saldılar. Bu bəyaz üzlü, çatma qaşlı gəlin qurşağına çatan sudan çıxmağa cəhd etdikcə əllərindəki uzun dəyənəklə onu itələyib yenidən suya yıxırdılar. Bu dəhşətli mənzərə getdikcə başkəsən ermənilərin vəhşilik dünyasından xəbər verirdi.*

*Bu zavallı gəlinin son anları idi. O get-gedə haldan düşür, suyun içində çapalayırdı. Bu vaxt qəzəbindən gözləri qan çanağına dönmüş gənc bir oğlan adamların arasından çıxıb özünü boğulmaqda olan gəlinin üstünə tərəf atdı. İstədi ki, onu xilas eləsin. Elə bu vaxt avtomatın gülləsi dolu kimi yağdı. Gölün suyunu göyə qaldırdı. Gənc oğlan gəlinin ikiaddımlığında üzüstə suya düşdü. Boğulmaqda olan gəlini də avtomatın güllələri susdurmuşdu... "*

Gözümüz nələr görməmişdi, İlahi! İnsanın insana törətdiyi bu qorxunc faciələrin təsirindən özümüzə gələ bilmirdik. Yolda eşitdim ki, adı Sara olan həmin hamilə qadın Məhəmməd adlı bir kirovakanlının həyat yoldaşıdır.

## GÜLƏR BAĞIROVANIN GÜNDƏLİYİNDƏN:

"Yarım aydan çoxdur ki, şaxtalı-çovğunlu qış günündə dağlara çəkilmişik. Soyuq əlimizi-ayağımızı dalamış, bir çoxları zökəm olub xəstələnmişdir. Kəndimiz dağıldığına görə Hallavar camaatına qoşulmuşuq. Dağların başında keşik çəkir, tonqal qalayırıq. Erməni yaraqlıları məskən saldığımız yerlərdə nədənsə üstümüzə gəlmirlər. Bəlkə də ehtiyat edirlər. Hər yerlə, o cümlədən qonşu Saral, Arcut, Qursalı kəndləri ilə də əlaqəmiz kəsilmişdir. Dağların başında alovlanan bu tonqallar mühasirədə olan kəndlərlə yeganə əlaqə vasitəsi demək idi. Kişi paltarı geymiş qadınlar hər gecə kişilərlə birlikdə keşik çəkir, yeniyetmə uşaqlar əldədüzəltmə odlu silah gəzdirirdilər.

Yeganə ümidimiz əl radiosuna gəlirdi. Saatlarla radionu dinləyir, nə vaxtsa bizə bir nicat olacağı xəbərini gözləyirdik. Bakıdan ən çox eşitdiyimiz **"zəka qalib gələcək"** sözü idi. Bu söz bizi daha da qəzəbləndirir, avamlıqdan və qətiyyətsizlikdən ortaya atılan bu zəif fikrin "sahiblərinə" ürəkdən acıyırdıq.

Ağıl, zəka neyləsin ki, biz çöllərdə son tikə çörəyimizi qurtarmışıq. Bütövlükdə ərzağımız tükənmişdi. Buna görə son günlər heyvanlar kəsilir, ətindən istifadə olunurdu.

Elə bil bu ərazi dünyaya meydan oxuyan Sovet dövlətinin ərazisi

deyil. Elə bil qətliama məruz qalan insanlar Sovet vətəndaşı deyildir. Bu zülmə, haqsızlığa Sovet hökumətinin başında duranlar göz yumur... Artıq məlum idi ki, ermənilər niyə quduzlaşıblar. Artıq bilirdik ki, bizi bu günə salan Moskvadır.

Səksən yaşlı qaynanam ağı deyib dağa-daşa səs salırdı. Oğlu Süleymanın yandırılması, qohum-qonşunun qırğını, dədə-baba yurdunun viran edilməsi yazıq qadını dəli-divanə eləmişdi.

Aldığımız məlumata əsasən, dekabrın 7-də Hallavarla birlikdə digər kəndlərə də güclü hücum əməliyyatı hazırlanırdı. Buna görə hallavarlılar həmin gün obaşdan silahlanıb bir nəfər kimi dağlara çəkildilər. Bu camaat silahı təhvil verməmişdi. Kənddə yalnız əliuşaqlı qadınlar, əlillər və taqətsiz qocalar qaldı.

Hallavarlılar bilirdi ki, ermənilər imkan tapan kimi onların aqibətini Vartana camaatının aqibətindən pis eləyəcəklər.

Təbiətin səhər nəfəsi hələ ətəyini kənddən-kəsəkdən yığmamış qaynanam iki ağbirçəklə axar çayın üstünə yollanıb, əllərini suya saldılar. Sonra tükürpədici bir səslə üzü qibləyə dedilər: “Ey bizi yaradan, sən bu haqsızlığı yerdə qoyma! Zülm ərşə dayanıb, ey ulu tanrı! Nahaq axan qanların baisinin bəlasını göndər, ey tanrı! Bu nahaq işə bir əncam çək, öz böyüklüyün xatirinə!”

Aylardan bəri Moskva tərəfindən eşidilməyən səsimiz deyəsən bu gün eşidiləcəkdi. Elə bil anaların bu haqq səsi haqq divanını silkələyib oyatdı... Onların yağdırdığı nifrindən qopan haray sanki meşələrin qoynunda uğuldaya-uğuldaya, qayalardan-qayalara ötüb cingiltili bir səslə deyirdi: “Haqq var, haqq ayaq üstədir! Siz görəcəksiniz ki, haqq bir gün günəş kimi sıyrılıb çıxdı!”

Körpə Elvin istilik içində olduğu üçün mən dağdan qayıtmışdım. Saat 11-30 dəqiqədə uğultu ilə birlikdə güclü partlayış səsi eşidildi. Ev himindən yırğalandı. Xəstə Elvin qucağımda özümü eyvana

atmaq istədim. Lakin ev silkələndikcə parça-parça qopub tökülən daşın-torpağın tozundan qapını tapa bilmirdim. Evinə sığındığımız Əlinin qızları da demə o biri otaqda imişlər. Onlardan biri məni bayıra çıxmağa qoymurdu. Əslində içəridə qalmaq daha təhlükəli idi. Mən özümlə birlikdə həmin qızı da sürüyüb bayıra çıxartdım. Küçədə daha dəhşətli mənzərə ilə qarşılaşdım. Ayaqyalın, başıaçıq adamlar əzizlərini axtarırdılar. Toz-dumandan göz-gözü görmürdü. Qorxunc yeraltı gurultudan adamı vahimə basırdı. Uçmuş evlərin altında qalan adamların aman istəyən harayı tük ürpədirdi. Mən də sağa-sola qaçıb Vüqarımla Elçinimi axtarırdım. Sən demə, onlar da bizi gəzirmişlər. Başımı qaldırıb ətrafa baxanda gördüm ki, kənd darmadağın olub. Camaat meşədən kəndə qayıtdı. Çadırlar qurub, bizi onun altına yığdılar. Ölənlər, yaralananlar var idi. Hər yerdən ümidini kəsmiş adamlar Allahdan imdad gözləyirdilər. Üç gün çadırlarda qaldıq. Belə bir vəziyyətdə Kirovakan, Leninakan, Spitak dağılmışdı. Bizim yaşadığımız çadırlara partladıcı qurğu gətirən üç ermənini tutub əsgərlərə verdilər.

Bir rus zabiti onlara dedi: **"Demək siz törətdiyiniz haqsızlıqdan aldığınız payla yenə kifayətlənmədiniz?!"** Həmin günlərdə Azərbaycanın təsibsiz, qorxaq və namussuz rəhbərləri Ermənistana kömək məqsədi ilə bir təyyarə xilasedici göndərdi. Ermənilər təyyarəni partladıb yerə saldılar. Məsələ aydın idi, Azərbaycan idarə olunmurdu.

Dekabrın 10-da vertolyotlar görünəndə camaat ura çəkdi. Demək, xalqımız bizi unutmamışdı: vertolyotlar Bakıdan göndərilmişdi... Əhali çox olduğuna görə vertolyotla daşıyıb qurtarmaq mümkün deyildi. Qaçqınlardan ibarət maşın karvanları təşkil olundu və hərbi maşınların köməyi ilə yola düşdük. Hər yerdə qara bayraqlar asılmışdı. Kəndimizin yanından ötəndə mən avtobusdan boy-

lanıb evimizə, həyət-bacamıza baxdım. İlahi, nə görsəm yaxşıdır... Evimizi ermənilər tələsik zəbt edib, qapı-bacanı silib-süpürürdülər. On altı ildə damla-damla yığdığım var-dövlət, gəlinlik cehizim bir anda sanki əriyib yoxa çıxdı. Əlvida, istisinə-soyuğuna qalandığım, sevincinə-kədərinə daldığım doğma ev, doğma ocaq! Əlvida on altı il ömür sürdüyum, insanları ilə mehribanlaşdığım doğma kənd!

Əlvida oğuzların at oynatdığı yallar, yamaclar! Əlvida sevib-seçdiyim, üstündən keçdiyim dağlar!

**Əzizim belə dağlar,**
**Sinəmi belə dağlar.**
**El köçdü, karvan getdi,**
**Arxamca mələ, dağlar!**

# SPİTAK (HAMAMLI) HADİSƏLƏRİ

## ERMƏNİLƏR XOŞ RƏFTAR SEVMİRLƏR

Tarixi təcrübə göstərmişdir ki, ermənilərlə nə qədər xoş rəftar edilibsə bir o qədər ziyanını, acı nəticəsini görüblər.

Hər şey qarşılıqlı olmadıqda, tərəflər biri digərinə eyni dərəcədə hörmət göstərmədikdə orda dostluq olmur, xeyirxahlıq çatmır. Azərbaycan xalqı "qardaş-erməni xalqı" dediyi vaxtlarda başımıza nələr gəlməyib?!.

Biz şaumyanlara, əmiryanlara, spandaryanlara, osipyanlara heykəl qoyur, adına küçələr verirdik. Əvəzində ermənilər ***Qəmərlini Artaşat, Dəvəlini Ararat, Axtanı Razdan, Basarkeçəri Vardenis, Qaranlığı Martuni, Qarakilsəni Kirovakan, Elləri Abovyan, Allahverdini Tumanyan, Hamamlını Spitak eləyirdilər...***

Bəli, Hamamlını Spitak eləyirdilər, biz dinmirdik. Çünki biz ermənilərin daxili işinə qarışmaq istəmirdik. Ancaq Ermənistan Azərbaycandakı ermənilər üçün hər cür maddi və mənəvi yardım tələbini irəli sürməyə hər dəqiqə hazır idi.

Yenə o qaynar qazanı gözü ilə görənləri dinləyək. Onların bəzəksiz-düzəksiz söhbətinə qulaq asaq. Spitak (Hamamlı) rayonunun Saral kənd sakini **İSMAYIL YUSİF OĞLU İSMAYILOVUN** yazılı məlumatından:

-*"1988-ci ilin fevralında başlayan erməni irticası gündən-günə artaraq, saatbasaat dərinləşərək noyabr ayında öz yüksək epogeyinə çatdı. Bu, təkcə irtica deyildi. Əslində qonşuluğa, duz-çörəyə xəyanət idi. Xaincəsinə qurulmuş fitnəkarlıq, sonu görünməyən bir düşmənçilik idi. İnandığımız Sovet dövlətinin daxilində başımıza belə müsibətlər*

*gələcəyinə inana bilmirdik. Hardan inana bilərdik? Durğunluq deyə tənqid etdikləri illərdə haqsız incidilən bir adamın şikayətinə mərkəz dərhal cavab verər, qanunsuzluqda günahlananın məsuliyyətə cəlb olunmasını tələb edərdi. Hər hansı qatil, yaxud bir baş dana oğrusu da cəzasız qalmazdı.*

*Ancaq demokratiya, aşkarlıq dövründə başımıza gətirilən müsibət və bəla heç bir ölçüyə, heç bir hüquq qaydasına sığışa bilmədi. Zülm həddini aşdı. Dünyaya sülh arzulayan Sovet hö-*

*kuməti boş damdıraya döndü.*

*Noyabr ayının 20-dən sonra Ermənistanda yaşayan bütün azərbaycanlılar kimi Spitak rayonunun azərbaycanlıları da od-alov içində qovrulurdular. Kəndlərin üstündə quzğuntək hərlənən vertolyotlar, bir tərəfdən də evlərin arasına soxulan rəhbər işçilər və milis maşınları camaatı vahiməyə salırdı. Bir-birinin ardınca gələn saqqallıların silahlı dəstələrinin "rədd olun qırılmamış"-deyə təkidli tələbləri xalqı çıxılmaz vəziyyətdə qoyurdu. İndi çıxmaq da çətin idi. Bizə məlum olmuşdu ki, Kirovakan ətrafı rayonlarda azərbaycanlılara qarşı qırğın törətmək kimi fitnəkarlıq kampaniyası gedir. Ona görə də "çıxın" deyənlər heç də bizim sağ-salamat getməyimizi arzu etmirdilər.*

*Noyabrın 30-da rayonun məsul işçiləri təkidlə bildirdilər ki, Saral kəndi üçün maşınlar ayırmışıq, əşyalarınızı yükləyib getməlisiniz. Hər həyətə bir yük maşını yanaşmışdı.Mənim həyətimə göndərilən "ZİL" markalı 78-13 ADO nömrəli maşının sürücüsü Samvel əşyaları yükləməmişdən əvvəl 400 manat pul tələb etdi. Birdən sonra verməzsiniz...-deyə bəhanə irəli sürdü.*

*Evin qiymətli əşyalarını yükləyəndən sonra çəkib yolda əylədi və kabinədə oturmağa icazə vermədi. Hazır dayanmış avtobusu göstərib əlavə etdi:*

*-Hamı avtobusda oturacaq, yük maşınları isə avtobusun ardınca*

*gedəcək.*

*Avtobusun arxasınca 31 yük maşını sıralanmışdı. Biz avtobusda oturandan sonra yola düşdük. Maşınlar da avtobusun ardınca hərəkətə başladılar. Biz Kirovakan yoluna düzələndə artıq maşınlar görünmürdü. Məsələ aydın idi... Deməli, tapşırıq belə verilmişdi...*



**Şahin Balacayev**

*Avtobusumuz Kirovakan şəhərini keçib Həmzəçimən adlı erməni kəndinə çatanda güllləbaran başladı. Günahsız azərbaycanlı körpələrin, qadınların naləsi dağa-daşa səs salmışdı. Avtobusda qan su yerinə axırdı. Son anda hərbçilər özlərini yetirərək güllləbaranı susdurmalı oldular. Qadın fəryadı, qoca iniltisi, uşaq qışqırığı bir-birinə qarışmışdı. Hərbçilər avtobusdakı adamları başqa maşına oturdub, Qazağa gətirməyi öhdələrinə götürdülər. Bu vaxt məlum oldu ki, 12 nəfər ağır yaralanmış, 3 nəfər isə ölmüşdür. Ölənlərin hamısı Balacayevlər ailəsinə mənsub idilər: Teymur və Sürəyya Balacayevlər, Teymurun əmisi oğlu 9 yaşlı Şahin Balacayev.*

*Teymurla Şahin yerindəcə keçinsələr də Sürəyyanı başından yaralı vəziyyətdə Kirovakan şəhərinin xəstəxanasına götürmüşlər. Sürəyyanın üstündə 6 min manat nağd pul və 3 min manatlıq qızıl əşyalar olmuşdur. Bunlardan heç biri ələ gəlmədi. Görünür, bu işdə həkimlərin "əməyi" olmuşdur...*

*Teymur ilə Sürəyyanın üç uşağı yetim qaldı.*

*Əsgərlər bizi bir sutkaya Qazağa çatdıra bildilər. Aldığımız*

*məlumata görə, bu avtobusda olan azərbaycanlılar İcevana qədər tamam məhv edilməli imişlər.*

*Biz Qazağa çatsaq da ürəyimiz kəndimizdə qalmışdı. Camaatımızın bir çoxu hələ meşələrdən gəlib çıxmamışdılar. Onlar düşmən əhatəsində idilər. Həmin adamlar Ermənistanda baş verən güclü zəlzələdən sonra Azərbaycana keçə bildilər. Bir çoxları itkin düşdü, yaralandı, qardaboranda həlak oldular.*

*Təkcə bu müsibət Saral camaatınınmı müsibəti idi? Məgər qursalılar ağ gün içindəmi idilər?! Onların da evləri yandırıldı, var-dövlətləri talana getdi. Qursalılar öldürüldü, döyüldü və şikəst oldular.*

*İki uşaq anası 22 yaşlı* ***Nazı Zülfüqar qızı Paşayeva*** *soyuq noyabr günlərində dağlara-daşlara düşdü, bir çoxları kimi öldürülməsindən öncə ismətini qorumaq üçün canını götürüb Azərbaycana çatmağa can atdı. Ayaqlarını soyuq aldı. Gətirib Bakıya çıxartdılar. Həkimlər hər cür kömək göstərməyə cəhd etdilər. Nəhayət, ayaqlarını kəsmək istədilər. Amma Nazı taleyin verdiyi bu bədbəxtliyi istəmədi. Allahdan ölüm arzuladı. Ölüm özü də bəzən şərəfli olur. Namuslu-qeyrətli adamların ölümü ölümsüzlüklə tamamlanır. Nazının ölümü kimi...*

*Söhbəddin Kosayev də ermənilərin vurduğu zərbədən sonra xəsarət aldı və həmin dərdlə dünyasını dəyişdi. Onu da demək lazımdır ki, zəlzələnin içində də ermənilər azərbaycanlıların öldürülməsini ustalıqla təşkil edir və zəlzələdə ölmüşlərin siyahısına daxil edirdilər. 1931-ci ildə anadan olmuş Şərif Məhərrəm oğlu Mustafayev da belələrindən biri idi.”*

**Spitak rayonunun Qursalı kənd sakini GÜLLÜZAR KOSAYEVADAN (ünvanı: Xutor qəsəbəsi, cərgə 7, mənzil 21) aldığımız bir məktubda oxuyuruq:**

*"Erməni quldurları kəndimizə hücum edəndə əlimizdə heç nə yox idi. Əliyalın nə etmək olardı? Ona görə də gecənin qaranlığında üzümüzü dağa-daşa tutduq. Həyat yoldaşım Əsgərlə mən birlikdə qaçırdıq. Bilirdik ki, erməni saqqallıları meşələrə də yayılıb və orada da ələ keçən azərbaycanlıları öldürürlər. Biz nəfəsimizi çəkməkdən belə, ehtiyat edərək, ayağımızı quş sayıqlığı ilə ataraq koldan kola keçir, dərədən dərəyə adlayırdıq. Məchul bir məkana can atırdıq. Deyəsən yola yaxınlaşmışdıq. Elə bu vaxt bir dəstə əlisilahlı erməni qabağımızı kəsdi. Tərpənməyə imkanımız olmadı. Artıq ölüm ayağı idi.*

*Əsgər astadan pıçıldadı: Gör necə tələyə düşdük... Bizim silahımızı yığdılar, özlərini isə silahlandırdılar. Nə murdar millətmiş bunlar!!!*

*Bizi quş kimi göydə qapdılar. İlk zərbəni qolumda hiss etdim. Hiss etdim ki, qolum sındı. İkinci zərbə deyəsən boynumun ardına dəydi. Bundan sonra heç nə bilmirəm.*

*Səhər açılanda oyandım. Gördüm ki, bədənimi çəkə bilmirəm. Birtəhər ətrafa baş çəkməli oldum. Əsgərin meyidini tapdım. Burada özümdən getmişəm. Gözümü açanda bir neçə azərbaycanlı kişinin başımın üstündə dayandığını gördüm. Onlar da qaçqın idilər. Mənim onları tanımaq imkanım tükənmişdi. Onlar Əsgərin meyidini aparıb basdırdılar. Məni isə Qazağa gətirərək xəstaxanaya qoymuşdular.*

*Sonra qaynım məni müalicə üçün Bakıya gətirdi. Orduda olan oğlum hələ bilmir ki, atası erməni daşnaklarının iyrənc əməllərinin qurbanı olmuş, anası isə şikəstlikdən əzab və əziyyət içindədir."*

# RƏHİM DAŞDƏMİROV MİLİS NƏFƏRİ İDİ

Ümumiyyətlə ermənilərin belə bir xislətə malikdirlər: azlıq təşkil etdikləri yerdə hamıya yaltaqlanıb, könlünü ala bilirlər. "Dişləri batan yerdə isə insafı, mürvəti və yüzillik duz-çörəyi bir anda itirməyə qadirdirlər. Görəsən, bir zaman Kirovakan şəhər Daxili İşlər şöbəsində milis nəfəri işləmiş Rəhim Daşdəmirov 1989-cu ildə qayıdıb Spitaka gedərkən onu heç tanıyan yox idimi? Onun iş yoldaşları olan milis nəfərlərindən biri onu müdafiə edə bilməzdimi? Axı, uzun illər bu sahədə işləyən Rəhim şöbənin ən operativ əməkdaşlarından biri olmuşdur. Bunu onun 1968-ci ildə aldığı "Sovet milisinin 50 illiyi" və 1983-cü ildə layiq görüldüyü "Qüsursuz xidmətlərə görə" medalları və bir sıra digər mükafatları da təsdiq edir.



**Rəhim Daşdəmirov**

Bəs onun taleyi necə olmuşdur?

**Bu suala "Azərbaycan" qəzetində dərc olunmuş "Cəzasız qalmış cinayət" başlıqlı yazıda və onun oğlu Mailin Azərbaycan Qaçqınlar Cəmiyyətinə verdiyi məlumatda (məlumat N 4) oxuyuruq:**

Daşdəmirov Rəhim Cabbar oğlu 1931-ci ildə Ermənistan SSR-in Spitak rayonunun Qursalı kəndində anadan olmuşdur. 23 il Ermənistan SSR-in Kirovakan şəhər Daxili İşlər şöbəsində milis nəfəri işləmişdi. 1988-ci il dekabr ayının 7-də zəlzələ nəticəsində

evi uçduğuna görə, Azərbaycan SSR-in Gəncə şəhərinə köçüblər. 1989-cu il iyunun 9-da öz evinin sığorta pulunu almaq üçün Spitak rayonuna gedib. Saat 13 radələrində şəhərə çatıb. Ancaq RİK-in sədr müavini Fərhad Abucanyan onların işini xeyli çək-çevirə salıb. Saat 14-ə kimi gözlədikdən sonra onları əliboş halda geri qaytarıb. RİK binasından çıxanda iki nəfər onların qabağını kəsib və deyiblər: "Məgər siz bizdən qorxmursunuz ki, buralara da gəlirsiniz?" Rəhim kişi onlara: "Mən burda doğulmuşam, burda da öləcəyəm, 58 ildə heç kəsə bir pisliyim dəyməyib",-deyir. Bu zaman Sergey Petrosyan və Serkey Mədətov arxadan armatur ilə Rəhim kişinin qulağının dibindən bərk zərbə endirirlər. Yıxıldıqdan sonra üç-dörd dəfə də başına armaturla vururlar. Mail şok vəziyyətindən özünə gələndə artıq gec idi. Cinayətkarlar artıq aradan çıxmışdılar.



**Rəhim Daşdəmirov ermənilər tərəfindən bu hala düşmüşdür**

Bütün bu hadisələr Spitak RİK-in binasının qabağında baş verib. Hadisə yerində milis işçiləri də olmuşdur. Lakin onlar heç bir köməklik göstərməyiblər. Sanki adi bir işə tamaşa edirmişlər. Mail atasının meyidini öz xüsusi "Moskviç-412" T96-76AD nömrəli maşınına qoyur. Geri qayıdarkən "Jiquli" və "Niva" markalı maşınlarla Maili uzun müddət təqib edirlər. Vəziyyətin gərgin olduğunu görən Mail kəsə bir yol ilə aradan çıxır və Gəncə şəhərinə gəlib atasını dəfn edir.

# CALALOĞLU

## BAŞKƏSƏNLƏR - BAŞIKƏSİLƏNLƏR

Əzəli və əbədi yurd yerlərimizdən biri də Cəlaloğlu olmuşdur. Dərdimiz o gündən başlamışdır ki, torpaqlarımız Ermənistan adlananda susmuşuq, kənd və şəhərlərimizin adları dəyişəndə susmuşuq, köçürdüləndə susmuşuq və nəhayət, zorakıçılıqla öz dədə-baba yurdumuzdan qovulanda da heç nə eləyə bilmədik. Çünki susmağı öyrətmişlər bizə: Həm də öyrənməyə bilməzdik. Başımıza ”elə ustalıqla corab toxumuşlar” ki, onu asanlıqla açmaq mümkün deyildi. Vaxtilə mənəviyyatımıza endirdikləri saysız-hesabsız zərbələr bu gün bizi elə çaşbaş salmışdır ki, fiziki zərbələrə də cavab vermək imkanı əldə edə bilmirik. Əldə edə bilmirik ona görə ki, başbilənlərimiz “dinmə, danışma, dininə söyərəm” deyə əlimizi-qolumuzu bağlamışlar.

Calaloğlu camaatını da məhz bir biganəlik yandırıb-yaxır. Aqsaqqalların dediyinə görə, o çətin günlərdə pul toplayıb adamlar göndərdik ki, Gürcüstandan, Azərbaycandan Moskvaya, Bakıya çoxlu teleqramlar vurulsun. Yəqin ki, səsimizi eşidərlər. Bu daşnak quldurları nə yaman qudurub...

Şahid **SÜLEYMAN XƏLİLOVUN** yazılı məlumatından:

“Qəddarcasına basqınlar Stepanavan (Cəlaloğlu) rayonunu da bürümüşdü. Noyabrın sonlarında azərbaycanlıların çıxarılması barədə gedən kampaniya daha da güclənmişdi. Ayın 27-də azərbaycanlıları Kuybışev kənd Sovetinə çağırıb bildirdilər ki, pasport qeydiyyatından çıxın və kəndi tezliklə tərk edin. Sizi respublikanın hüdudundan çıxarmaq üçün nəqliyyat ayrılmışdır.

Camaat çıxılmaz vəziyyətdə qalmışdı. Nə etməli? Necə çıxmalı? Bəs ömrün boyu tikib-qurduğunu neyləməli? Cəmi bir-iki saata kəndi tərk etmək nə demək idi? Heç yerdən işıq ucu görməyən bu yazıq adamlar əli qoynunda qalmışdı.


**Gilas Xəlilova**

Noyabrın 28-də dəhşətli fəlakət başladı. Azğınlaşmış ermənilər azərbaycanlı evlərini dağıdır, daş-kəsəklə gözə görünən nə varsa hamısını vurub yıxırlar. Odlu silahlar sağa-sola şaqqıldayır. Əlibaltalılar o evə, bu evə soxulurlar. Ucları itilənmiş armatur şişlər haraya dəyirsə qılınc kimi keçir. İnsan fəryadı ərşə bülənd olub...

Ermənilərin heç bir tələbinə baş əyməyən Şərif Xəlilov qeyri-bərabər vuruşa atılır. Onu güllə ilə vururlar. Lakin əlindəki balta ilə yenə özünü düşmən qruplarının üstünə atır, iki ermənini ağır yaralayır.


**Şərif Xəlilov**

**Şərif yıxılandan sonra başkəsən ermənilər onun başını bədənindən üzürlər.**

**Özünü balasının üstünə atan Gilas Xəlilovanı da eyni dərdlə öldürürlər.** Bu cinayət hadisəsinə rəhbərliyi ferma müdiri Telemak Davtyan

eləyirdi.

Bütün bu zülmlər Şərifin IX sinifdə oxuyan qızı Zeynəbin gözləri qarşısında baş vermişdir.

Gənc qız özünü sovxozun direktoru Xocamiryana çatdırıb yalvarır ki, qoyma, atamı, nənəmi öldürdülər! Xocamiryan deyir: ”Sizə hələ bu da azdır!”

Başına dözülməz müsibət gəlmiş Zeynəbi və qardaş-bacılarını, digər həmkəndliləri ilə birlikdə əsgərlər kənd Sovetinin binasına yığıb keşik çəkməli olurlar.

Kuybışev kəndinin digər sakinlərindən biri İsgəndərov Təmrazın da taleyi bu cür faciəli olmuşdur.”

**Təmraz İsgəndərovun həyat yoldaşı TAMAŞA İSKƏNDƏROVA** yazır:

*-“Kuybışev kəndində yaranmış gərgin vəziyyətlə əlaqədar olaraq övladlarım öz ailə üzvləri ilə birlikdə bizə yığışmışdılar. Həmin axşam, yəni noyabrın 28-də axşam saat 22-də 100-150 nəfərdən ibarət bir dəstə həyətə toplaşdı. Əksəriyyətini tanımadığımız canilər arasında sovxozumuzun direktoru Vartan Xocamiryan, kənd Sovetinin sədri Surik Kirakosyan, milis sahə müvəkgili Qərib Petrosyan, zootexnik Samvel Nerkoranyan və başqaları da var idi.*

*İnsan seli həyətə soxularkən üstlərinə atılan itimizi sahə müvəkgili güllə ilə öldürdü. Sonra onlar ikinci mərtəbədəki qapı və pəncərələri sındıraraq içəri daxil oldular. Evdə olanları qəddarlıqla döyməyə başladılar. “Həmişə dili atan, ermənilərə qarşı yaxşı-yaman danışan” Təmraz kişidən daha böyük heyif çıxmaq məqsədilə içəri dolmuş quldurlar bu günahsız qocanı tüfəngin qundağı və təpiklə ölənəcən döyüb, sonar da ikinci mərtəbədən yerə atdılar.”*

Bu vaxt rayonda sovet əsgərləri də var idi. Bəs bu əsgərlər nədən və kimdən ötrü idilər? Sən demə bizi ata-baba yurdumuzdan çıxarmaq və sonumuza çıxmaq üçün ermənilərə yardımçı olmağa gəlibmişlər...

## YAXŞILIĞA YAMANLIQ...

Gərgər kəndində gözəl gün-güzəran keçirən ailələrdən biri də Bəsti xalagilin ailəsi idi. O, pendir zavodunda işləyirdi. Qonşuları ermənilər olsa da, mehriban yaşayırdılar. Həmişə də Bəsti xala onlara yaxşılıq edərdi.



**Bəsti Mustafayeva**

Qonşuların ehtiyacı olanda pendirlə, yağlaköməklik göstərərdi. Lakin elə bil hər şey bir fəndə bənd imiş. Zori Balayanların qurduğu fəndlərə "dostluq bəndləri" darmadağın oldu. Qonşular əfi ilana döndülər. Türklərə qarşı qırğın əməliyyatı başlananda Bəsti xala düşündü ki, qonşular onlara gələn bu xata-balanı dəf etməmiş olmazlar. Əslində hər şey Bəsti xalanın düşündüyünün əksinə oldu. Onun evinə ilk basqını "canbir qəlbdə olan", vaxtilə 1500 manat borc pul alıb geri qaytarmayan qonşusu Astğikin ailəsi elədi. Qəlblərində zərrə qədər mərhəmət hissi olmayan yağılar digər azərbaycanlı evləri kimi Bəsti xalanın evini də darmadağın etdilər. Bu gülərüz,

mehriban qadına vurulan güllələr biqeyrət qaniçənlərin ürəyini soyutmadı. Bakı benzini töküb onu odladılar. Yalnız sağ əli yanmamış qaldı. Bu hadisə noyabrın 30-da baş verdi.

Noyabrın 7-də Ermənistanda baş verən zəlzələ ilə əlaqədar olaraq SSRİ Nazirlər Sovetinin sədri Rıjkov zəlzələ rayonuna gəldi. Bəsti Mustafayevanın qardaşı Qiyas və digər qohumları hərbçilərin köməyi ilə Kirovakana getdilər. Rıjkovla görüşüb Bəsti Mustafayevanın yandırılmış meyidini istədilər. Ermənistanın yerli hakimiyyət orqanları kimi Rıjkov da yandırılmış meyidin qalıqlarını Azərbaycana aparmağı məsləhət görmədi. Dedi ki, bu, dəhşətli ölümdür. Bunu Azərbaycanda görəndə əhali təlatümə gələcəkdir.

Qiyas kişi Rıjkova dedi:

-Yoldaş Rıjkov, bu hadisələrin qarşısı niyə alınmır? Bu müsibəti siz görürsünüz, niyə qəti qərar çıxarmırsınız?

Rıjkov:

-Erməni xalqı və Azərbaycan xalqı özü bu məsələni həll etməlidir.

Görünür xalqımızın taleyi belədir: Bəsti xala da yaxşılıq etdiyi adamlar tərəfindən yamanlıq gördü. Ona görə də atalar demişdir: “Yaxşılığa yamanlıq, kor eşşəyə samanlıq”.

# MƏCNUN XƏYALLI KÖNLÜM

Azərbaycan Qaçqınlar Cəmiyyətinin binasındakı dəhlizdə 48-50 yaşlı adam tez-tez mənim diqqətimi cəlb edirdi. Üzünü tük basmış, dodaqlarının təbəssümü donmuş bu adamın baxışında, yerişində elə bil kimdənsə bir imdad diləmək istəyi duyulurdu. Bəzən nəzərlərinin hansı məchul nöqtəyə dikildiyinə diqqətlə baxanda onun məcnun xəyallı olduğu ehtimalı yaranırdı. Bəli, fikrimdə yanılmamışdım. O, Məcnun idi-Vaqifin məcnunu...



**Vaqif Əbdürrəhmanov**

1970-ci ildə anadan olmuş **Vaqif Həmid oğlu Əbdürrəhmanov** Stepanavanda (Cəlaloğlu) 10-cu sinifdə oxuyurdu. Ermənilər aranı qatandan sonra türklərə qarşı yönəldilən düşmənçilik hissi Vaqif oxuyan məktəbə də dərindən sirayət etdi. Onu dəfələrlə təhqir edən, dərsə gəlməməyini tələb edən şagird yoldaşları və müəllimlərinə çox da əhəmiyyət vermirdi. Onun etinasızlığını görən sinif yoldaşları onu bıçaqla ağır yaraladılar. Bu gün məcnun görkəmində gördüyümüz ata-Həmid Rüstəm oğlu Vaqifi tez Moskvaya çatdırdı. Aparılan cərrahiyyə əməliyyatı, həkimlərin ciddi-cəhdi heç bir nəticə vermədi. İki aylıq müalicə boşa keçdi. Vaqif erməni bıçağından aldığı yaradan sonra gözlərini əbədi yumdu… Vaqifi gətirib Bakıda dəfn etdilər.

İlahi, görəsən Həmidi kim bu günə salıb? Onu kim boynubu-

ruq qoyub? Hər gün gəlib dəhlizdə dayanıb, gəlib-gedən insanlara məzlum-məzlum baxmağa onu kim vadar edib? Vaqifin dərdi onu məcnun kimi havalandırıb. Ermənilərin bu qaniçənliyinə görəsən kim cavab verəcək?

# KALİNİNO

Elə şəhər, elə kənd yoxdur ki, cəlladların əli orada qana batmamış olsun. Çünki uzun illərin hazırlığı nəticəsində planlaşdırma elə aparılmışdı ki, Ermənistan (hər addımı oğuz nişanələri ilə dolu olan torpağa belə demək mümkündürsə) ərazisində bir nəfər də olsun azərbaycanlı qalmamalı idi.

**Kalinino rayon mərkəzinin sakini qırx yaşlı GÜLSƏNƏM HÜMBƏT QIZI YOLÇUYEVA yazır:**

-"Yarəb, insan da belə kəmfürsət və qaniçən olarmı? Bir adamın üstünə yüzlərlə əlisilahlı yeriyib onu deşik-deşik edəndə tanıdığımız rəhbər işçilər kənarda dayanıb seyrçi rolu oynayırdılar. Sifətlərinin ifadəsindən hiss olunurdu ki, bu qeyri-insani əməllərdən ləzzət alır və bir türk öldürən yüz erməniyə qəhrəman adı verməyə hazırdılar.

Noyabr hadisələrində Kalinino rayon mərkəzində olan azərbaycanlı demək olar tamamilə talana getdi. Digər qohum və qonşularımız kimi bizi də doğma evimizdən silah gücü ilə çıxartdılar. Heç nə götürə bilmədik. Bakı şəhərinə gəlib Naxçıvan mehmanxanasında qalmalı olduq. Bir neçə gündən sonra həyat yoldaşım Əli Nuru oğlu Yolçuyev Kalininoya qayıtdı ki, görsün ev əşyalarımız yerindədimi... Bu gediş Əlinin son gedişi oldu. O, bir daha qayıtmadı. Kalininoya çatan kimi onu öldürmüşdülər. Ermənilərin törətdiyi qətliamı müdafiə edən sovet əsgərləri də şikayətimizi eşitmək istəmirdi".

Haqqın və ədalətin tapdandığı bir respulikada kim buna cavab verə bilərdi? İlməzli kənd sakini 35 yaşlı Allahyar Mustafa oğlu Teymurovun faciəli həyatı da erməni quldurlarının nahaq qan axıtmağa həris olmalarına canlı sübutdur. O da Ermənistana

gedərkən sərhəd yaxınlığında öldürülmüşdü. İndi bu gənc atanın dörd uşağı yetim qalmışdır.

# DÖRD SAATLIQ ATIŞMA

Yaşının doxsanı haqlamasına baxmayaraq Məmməd kişi gümrah və sağlam idi. Hələ də cavanlıq şövqü ilə durub-oturur, işdə-gücdə heç kəsdən geri qalmırdı. Camaat onun mərd və qorxmaz olduğunu yaxşı bilirdi. Məmməd kişi eyni zamanda pəhləvan cüssəli bir adam idi. Ermənistanın Qukasyan rayonunda 25-30 nəfər erməni ilə vuruşdan qalib çıxmasını kim bilmirdi...

Amasiyadan gəlin gətirərkən toy maşınının qabağını kəsib güləşmək üçün təkidlə adam tələb edən və dörd ermənininin kürəyini yerə vurması bütün Kalinino camaatına bəlli deyildimi?!



**Məmməd Sadıqov**

Yerə atılmış dəmir pulları atın belində ola-ola yığması və pulu göydə güllə ilə vurması Məmməd kişinin qocalığında da cavanlığından xəbər verirdi.

Rayonda çox böyük hörmətə malik olan **Məmməd** kişi bütün xeyir və şərdə iştirak edər, xeyir-dua verərdi.

1988-ci ilin noyabrında Xanlar rayonuna nəvə-nəticələrini yoxlamağa gəlmiş Məmməd kişi televiziyada eşidəndə ki, Ermənistanda hadisələr olduqca gərginləşmişdir, dərhal Kalininoya qayıdaraq məhəllədə gözətçilik etməyə başlamışdı. Hər axşam qonşulara tapşırardı ki, siz arxayın yatın, mən burdayam.

Onun və qonşusu Sədrəddin İsayevin mərdanəliyi Kalinino rayon mərkəzində yaşayan 400-dən çox azərbaycanlı ailəsini ürəkli

olmağa və düşmənə əyilməməyə sövq edirdi.

**Məmməd Sadıqovu və Sədrəddin İsayevi yaxşı tanıyan və indiki hərəkətlərinə dözə bilməyən erməni quldurları onları məhv etmək üçün fürsət axtarırdılar.** Ermənilər Sədrəddin kişini də Azərbaycandan silah gətirib camaata paylamaqda ittiham edirdilər. Belə bir qətl törətmək üçün onlar yalnız Məmməd kişini təkləməkdə gördülər. Məhəllənin kişi və qadınları işə getdikdən sonra saat 11 radələrində xəbər gəlir ki, ermənilər beş yüzə qədər böyük dəstə ilə hücuma keçir. Məmməd kişi dərhal öz nəvələrini və qonşu uşaqlarını oğlunun maşınına doldurub aradan çıxarır. Maşın məhəllədən çıxarkən düşmən dəstələri ilə üzbəüz gəlir. Daşa-kəsəyə basılan maşın əzilsə də aradan çıxıb özünü Azərbaycana çatdırır.

Məmməd kişi darvazanı bağlamaq istərkən böyük bir dəstə onu dörd tərəfdən dövrəyə alır və daşa basır. Bu ərəfədə gəlin onun gözünə sataşır. Onun köməkliyi ilə gəlin tövlədəki yeşiklərin arasında gizlənməli olur.

Xoşbəxtlikdən gəlini görə bilmirlər. Ot tayasına od vurur, evin qapı-bacasını sındırırlar. Bədəninin neçə yerindən daşla aldığı zərbəyə baxmayaraq dörd saata qədər onun atdığı güllələrin səsi kəsilmir. Ermənilər arasında ölənlər və yaralananlar olsa da, bu iki türkü məhv etmək üçün aldıqları tapşırığı başa çatdırmağa çalışırlar. Nəhayət, güllə tükənir. Əlacı kəsilən Məmməd kişi hərbçiləri və milis işçilərini görüb çölə çıxır. Elə bu vaxt milis işçisinin özü ilk zərbə endirir və bundan sonra yüzlərlə "qəhrəman" dörd saat onları haldan salmış və iki nəfərini qanına bulamış

türk Məmmədi vəhşicəsinə daşqalaq edirlər.

**MƏMMƏD BAYRAM OĞLU SADIQOVUN Bakı şəhəri, Neapol küçəsi 41 nömrəli evin 23-cü mənzilində yaşayan oğlu Tahir Məmməd oğlu Sadıqov yazır:**

"Atamı ulularımızın ruhu dolaşan torpaqda dəfn etdik. Biz dəfn mərasimini Gürcüstanda, yaxud Azərbaycanda keçirmək istəsək də SSRİ Təhlükəsizlik Komitəsinin üzvü, Ermənistanın rəhbər işçiləri və hərbçilər buna imkan vermədilər. Dəfn mərasimi hərbçilərin BTR və tanklarının müşayiəti ilə həyata keçirildi. Dəfn mərasimindən sonra vəhşi erməni millətçiləri mərhuma ehsan verməyə imkan vermədilər. İsti qazanları maşınlara doldurub yaxınlıqda yerləşən Sadaxlı (Gürcüstan) kəndində qohumlarımızın evində ehsan verdik.

Atamın öldürülməsi ilə Kalininodakı azərbaycanlıların çıxarılması sürətləndirildi. Əhalinin çıxarılmasına milis rəhbərlik edir, əsgərlər isə tamaşa edirdilər..."

Belə bir anda Evli kəndinin sakinləri Sadıq Bayram oğlu Qurbanov, Məhəmməd Musa oğlu Vəliyev və rayon mərkəzinin sakini 45 yaşlı Qara Həmid oğlu pulunu əmanət kassasından alıb çıxarkən qəddarlıqla öldürülmüş və pulları aparılmışdır.

# ALLAHVERDİ YOXSA TUMANYAN...

Hələ 1969-cu ildə Allahverdi adlı oğuz yurdunun adını dəyişdirib Tumanyan eləyən erməni millətçiləri Azərbaycan xalqının mənəviyyatına öz düşmən münasibətini bildirməklə mənfur "türksüz Ermənistan" siyasətinə xidmət edirdilər. Çox təəssüf ki, Ermənistanda dəyişdirilən yüzlərlə türk mənşəli yer-yurd adlarına bir dəfə də olsun Azərbaycan hökuməti öz münasibətini bildirmirdi. Ermənilər isə ətalət yüklü başçılardan məharətlə istifadə edib, öz şovinist planlarını həyata keçirirdilər. Bu cür planlar çox vaxt azərbaycanlıların üzünə gülə-gülə tətbiq edilirdi.

Bu gülməcələr, bilməcələr isə bizi arxayın salır, mürgülü gözlərimizin qapağından qurğuşun asırdı.

Bəli, bu kimi addəyişmələr haçansa insan qırğınına, qan tökülməsinə doğru aparırdı. Haqverdi kişinin günahsız axan qanı kimi...

**İndi ki, söz Haqverdi kişidən düşdü, onda gəlin onun qızı, Böyük Ayrım kənd sakini NARGİLƏ HAQVERDİYEVANI dinləyək:**

*-"Ermənilər kəndi yandırmaqla, hamımızı qırmaqla hədələyir, yolda-izdə tutduqlarını döyür-söyür, sağalmaz yara vururdular. Verilən əzab və əziyyətlərə baxmayaraq camaat doğma yurdu qoyub çıxmaq*

*istəmirdi. Hamı belə bir qənaətə arxayın idi ki, bəlkə sovet hökuməti harayımıza çatdı...*

*Noyabrın 28-də Tumanyan(Əvvəllər Allahverdi) rayon Partiya Komitəsinin birinci katibi, rayonun digər məsul işçiləri, DİŞ-nin əməkdaşları kəndimizə gəldilər. Sahə müvəkgili Jorik Obayan kənd camaatına axırıncı dəfə xəbərdarlıq etdi. Bildirdi ki, birinci katibin şəxsən özünün gəlməkdə məqsədi odur ki, qırğın törədilməmiş kəndi tərk edəsiniz. Çünki törədilən hadisələr katibin imkanından xaricdir.*

*Biz-anam, mən və iki körpəm evdən heç nə götürmədən doğma divarları, həyət-bacanı, qoynunda boy atdığımız kəndi göz yaşları ilə tərk etdik.*

*Ev əşyalarımızı aradan çıxarmaq məqsədilə atam Haqverdi kənddə qaldı. Biz isə dağlardan aşıb Gürcüstan SSR-in ərazisində yerləşən Sadaxlı kəndinə gəldik.*

*Səhərisi gün, noyabrın 29-da saat 12 radələrində kəndimizin sahə müvəkgili "Jiquli" markalı maşınla Sadaxlıya gəlib sovet sədrinə xəbər verib ki, Haqverdiyev Haqverdi vəfat etmişdir.*

*Kərəm Alquluyev, Oruc Kazımov, Əhməd Alıyev, Şahvələd Haqverdiyev, Hətəm Haqverdiyev, anam, mən və başqaları sahə müvəkgili və milis işçilərinin köməyi ilə Böyük Ayrıma qayıtdıq. Atamı çarpayıya uzatmışdılar. Yataq, pal-paltar, evin döşəməsi qana bulaşmışdı. Bizi yaxına buraxmadılar. Atamı rayon xəstəxanasına aparıb yardılar və bundan sonra bizə təhvil verdilər. Biz dərhal başa düşdük ki, ermənilər ölümün izini itirmək, yanlış xəstəlik diaqnozu vermək üçün bunları edirlər.*

*Biz cənazəni gətirib Sadaxlı kəndinin qəbristanlığında dəfn etdik."*

# SƏKSƏNBİR YAŞLI QOCANIN ÖLDÜRÜLMƏSİ

Allah heç kəsin başına gətirməsin... Ermənistanda yaşayan azərbaycanlılar yaman bəlaya düçar olmuşdular. Təlaş və həyəcan içində olan insanlar dəniz kimi sağa-sola dalğalanır, gah özünü sahildəki şüm-şad qayalara çırpır, gah da öz dərinliyində parlayıb sönürdü.

Qəribə bir mənzərə yaranmışdı. Moskva açıq-aşkar erməni millətçilərinin tərəfində dururdusa, bəs Azərbaycan rəhbərliyi hansı mövqedə dayanmışdı?..


**Abbas Əli oğlu**

Bu mövqe qorxaqlığı, bacarıqsızlığı və erməni lobbisinin nələr etdiyini görə bilməmək də siyasi korluğu təsdiqləyirdi.

Təklənmək ən dəhşətli ölümə bərabərdir. Bu vaxt Ermənistanda yaşayan azərbaycanlılar tək-tənha qalmışdılar. Azərbaycanın biqeyrət rəhbərliyi isə "şayiəyə inanmayın"-deyə xalqı əsl həqiqətdən uzaqlaşdırmaqla vaxt keçirirdilər.

Ermənilərin qaladığı bu ocağın tüstüsü hələ kəsilməyəcək, başımıza çarə qılmalıyıq,-deyə Abbas kişi Sadaxlıya getmişdi. Orada ona demişdilər ki, arvad-uşağı, ev əşyalarını yubatmadan çıxarmaq lazımdır.

Həmin məqsədlə Sadaxlıdan Böyük Ayrım kəndinə qayıtmalı olur. Bu hadisə qanlı-qadalı noyabrın 27-də baş verir. Meşənin arası ilə gələrkən quduz erməni başkəsənlərinə rast gəlir. Türk öldürən hər bir erməni özünü bəlkə də erməni xalqının qəhrəmanı saymaqla yanaşı, həm də özündə daxili bir rahatlıq tapmış olurdu. Məhz Abbas kişinin də öldürülməsi belə bir əxlaq normasına əsaslanırdı. Əgər belə olmasaydı səksən bir yaşlı qocanı dörd-beş nəfər erməni dığası futbol topu kimi sağa-sola atmazdı. Əllərinə keçən küt alətlərlə necə gəldi vurub, öldüyünü yəqin etdikdən sonra çıxıb getmişdilər.

Camaat Abbas kişini tapanda hələ onun canı çıxmamışdı. Xüsusilə başına dəymiş küt zərbələrin ağrısına dözə bilmirdi. Dözə də bilməzdi, çünki haqsızlığın haqq üzərindəki təntənəsi namuslu adamların çəkilməz dərdinə çevrilmişdi.



**Namazov M**



**Namazov Elman**

Noyanberyan rayonu Ləmbəli
Baba və nəvəni hər ikisini də ermənilər qətlə yetirmişlər

## AĞBABANIN YOLU BAĞLI...

Qədim və ulu torpaqlarımızdan olan Ağbabanın da başı üstünü qara buludlar bürümüşdü. Qana həris olan erməni başkəsənləri xalqın amanını qırmışdı. Aylardan bəri ümidlə yaşayan adamlar artıq hər yerdən əllərini üzmüşdülər. Allahdan başqa kömək əli uzadacaq bir qüvvə yox idi. Moskva açıq-aşkar azərbaycanlıları müdafiə etmir, erməni millətçilərini isə qısqırdırdı. İnsan daş deyil ki...

Güclü hücumlar başladığı vaxt elə bil heç yana Ermənistandan informasiya yayılmırdı. Ermənistan hökuməti sərhəd qapılarını çəkib örtüb, daxildə azərbaycanlılara istədiyi divanı tutmaqda davam edirdi.

**Azərbaycan Qaçqınlar Cəmiyyətinin əməkdaşı FƏRMAN RƏSULOV yazır:**

-Bu dövrdə camaatı incidən o idi ki, Azərbaycan rəhbərliyi Moskvanın məkrli siyasətini ifşa etmək əvəzinə, qaçqınların başına gələn hadisələrə dair toplanmış sənədləri, videokasetləri məhv etdirirdi.

Kimsəsiz əhali iki güclü düşmən tərəfindən əzişdirilir və məhv edilirdi. Belə bir qəddarlıq nəticəsində Güllübulaq kəndindən Xatın Mürsəl qızı Şahmuradova, Xədicə İbrahim qızı Cəfərova, Leylan Məmməd qızı Abbasova, Amasiya kəndindən Məmməd Musa oğlu Musayev, Quzukənddən Əkbər İsmayıl oğlu Həşimov və

başqaları faciəli surətdə həlak oldular. Bu günahsız qurbanların ehsanını qohum-əqraba Azərbaycanda verməyə imkan tapdı.


**Bayraməli Məmmədov**

Göllü kəndinin 14 yaşlı sakini Bayraməli Piralı oğlu Məmmədov kor bağırsağın kəskin ağrıları altında Amasya rayon xəstəxanasına gətirilib. Lakin erməni həkimləri onu çölə atmışlar. Nəticədə bağırsaq partlamış və yeniyetmə Bayraməli keçinmişdir.

1954-cü ildə anadan olmuş Qarabulaq kənd sakini, dörd uşaq atası Salman Məhəmməd oğlu Dünyamalıyevi vəhşicəsinə döyərək öldürmüşlər. Hazırda Salmanın 70 yaşlı anası dörd körpə ilə Nəsimi rayonu ərazisinda yaşayır.

Yeniyol kəndinin sakini Bəkir Binnət oğlu Hüseynov isə erməni kəndində çoban işləyirdi. 1989-cu il sentyabrın 15-də onu su hovuzunda boğub öldürmüşlər.

Heç bilmirsən güllə ilə öldürüləndənmi söz açasan, yoxsa ürəyinin başına qılınc uclu armatur sancılandanmı? Həkim qəsdindən güdaza gedəndənmi danışasan, göydən asılandanmı, yaxud maşınla vurulandanmı?!

**Göllü kəndinin sabiq sakini YETƏR İSAYEVANIN Azərbaycan Qaçqınlar Cəmiyyətinə verdiyi yazılı izahatdan:**

*"Ermənilərin ardı-arası kəsilməyən hücumları, həyasız rəftarları, qeyri-insani hərəkətləri həyat yoldaşım Nəbi Hüseyn oğlu Rüstəmovu yormuşdu. Bir gün dedi ki, Azərbaycan yadıma düşüb. Daşkəsəndən ötrü ürəyim tökülür, gedib gəzmək istəyirəm...*



**Nəbi Rüstəmov**

*Xalqımızın tarixinə qara hərflərlə yazılmış 1988-ci ilin noyabr ayının əvvəllərində minik maşınına oturub Daşkəsənə yola düşdük. Kalinino rayon mərkəzindən keçəndə maşınımız xarab oldu. Ermənilər tez-tez bizə yaxınlaşıb maşına nə olduğunu soruşurdular.*

*Maşının nasazlığını düzəltməklə məşğul olan Nəbi təzəcə qəddini düzəldib yana çəkilmişdi ki, arxadan çıxan ildırımsürətli maşın onu vurub gözdən itdi. Nəbi yumaq kimi dığırlanıb 30-35 metr kənara düşdü.*

*İki nəfər azərbaycanlı bizə yaxınlaşıb, Nəbini maşına qoyub, bizi aradan çıxardılar. Nəhayət, Daşkəsənə gəlib Nəbini xəstəxanaya çatdırdıq. Nəbi burada 28 gün müalicə olunsa da xeyri olmadı. Biz onun meyidini kəndimizə gətirəndə ən dəhşətli günlər idi. Bütün erməni xalqı 211 min arxasız, silahsız azərbaycanlıların üstünə yerimişdi. Riyakar rus ordusunun iç üzü açılmışdı. Sovet əsgərlərinin gözü qabağında ermənilər Azərbaycan türklərinə qarşı əsl soyqırımı törədirdilər. Əməyimizi illərdən bəri istismar edən rus ordusu görəsən öz "çörək ağacını" niyə baltalayırdı? Biz Nəbini ulularımızın uyuduğu Göllü qəbristanlığında torpağa tapşırdıq."*

# BABƏKİ GÖYDƏN ASMIŞLAR

On yeddi yaşlı **Babək İbrahim oğlu Haqverdiyev** qədim Ağbabanın Əzizbəyov kəndində dünyaya göz açmışdı. Xəstəxanada təsərrüfat müdiri işləyən atası İbrahim son vaxtlar dərman preparatlarını evində saxlayırdı. Səbəb o idi ki, zəlzələ nəticəsində xəstəxana dağılmışdı. Bu günlərdə Yerevandan Əzizbəyov kəndinə tələbələr gətirilmişdi. Guya tələbələr zəlzələnin vurduğu ziyanı aradan qaldırmalı idilər. Əslində onlar türk kəndlərini zəbt etmək üçün göndərilmişdilər.



**Babək Haqverdiyev**

Tələbələr İbrahim kişinin evində dərman olduğunu biləndən sonra Babəki ölümlə hədələyib, dərmanın yerini öyrənməyə müvəffəq olurlar. Onlar hər gün birdəfəlik şpristlərdən və keyidici dərmanlardan götürüb aradan çıxırlar.

İbrahim səhərisi gün evə gələndə görür ki, dərmana yenə əl gəzdiriblər. Evlərdən birinə girəndə dəhşət onu bürüyür. Babəki göydən asmışlar... Görən ata gözü, doğranan ata qəlbi... Bir də ki, el köçüb, yurd ağlayan vaxt...

Hüquq-mühafizə işçiləri quzğun kimi tökülüb gəlməyə başladılar. Özü də necə?

"İbrahim, sən dava-dərmanı tələbələrə satıb narkoma-

niyaya şərait yaratmısan, bu cinayətdir, sən cavab verməli olacaqsan. Bəs oğlunu niyə öldürmüsən? Öldürmüsən ki, erməniləri təqsirləndirəsən?!"

Bəli, tapşırığa əməl olunmuşdu! Amasiyadakı "Qarabağ" təşkilatının açıq fəaliyyət aparan nümayəndələri, texniki-peşə məktəbinin direktor müavini 3. Markosyan, aqrosənayenin hüquqşünası C.Melikyan, drujina qərargahının rəisi S.Xaçatryan, rayon istehlak kooperasiyasının sədri H.Xaçatryan və başqaları bu faciənin baş icraçıları idilər.

Dünya cəfasına dözməyən, yox, yox, erməni zülmünə, vəhşiliyinə dözməyən Leyla ananın ömrünün son anında dilindən çıxan bir bənd şeirlə Amasiya olaylarına nöqtə (əlbəttə son nöqtə deyildir) qoyuruq.

**Getmə igid, getmə bala,**
**İgidlərin qolu bağlı!**
**Yağı durub gədiklərdə,**
**Ağbabanın yolu bağlı!**

# QƏMƏRLİ (ARTAŞAT)

## BİR QAÇQININ MƏKTUBUNDAN

**Əlli-altmış min manatlıq böyük və yaraşıqlı evini, minik maşınını, ev əşyasını qoyub çıxmış qaçqın ADİL HƏSƏH OĞLU BAĞIROV bizə yazdığı bir məktubunu belə başlayır:**

-"Mən Ermənistan SSR Artaşat rayonunun Dexsut kəndindənəm. Bağışla qardaş, bu adlar mənim doğma kəndimə çox-çox sonralar verilmişdir. Atam da, babam da, babamın babası da nə Artaşat eşidiblər, nə də Dexsut. 850 illik yazılı tarixi olan kənd qəbristanlığımız, oradakı abidələr və ərəb əlifbası ilə yazılmış başdaşları, öz təkrarsız gözəlliyi ilə seçilən yaraşıqlı doqquz kəndinin "Qızılqurşaq" məscidi də bizim məscid kimi "mədəni" ermənilərin humanist əməlləri ilə dağıdıldı; Qəmərli oldu Artaşat, Yamancalı isə Dexsut!

Bizim kəndə ilk erməni 1915-ci ildə gəlmiş və ilk qəbir daşını da elə o vaxt, yəni 73 il bundan əvvəl qoymuşlar. Buna baxmayaraq qəzetlər, jurnallar ermənilərin qədimliyindən danışanda öz-özünə yanıb-yaxılmaya bilmirsən. Düşünürsən, ey İlahi, bu ermənilərin dediyi hər söz gözgörəsi yalan olduğu halda, dünya ictimaiyyəti bunlara necə inanır?!

Qəmərli rayonunun camaatını əslində 1950-ci ildə köçürmə adı altında sürgün elədilər. Mənim doğulduğum Yamancalı kəndi də digər kəndlər kimi 1918-ci ildə Andronikin qoşunu tərəfindən dağıdılmışdı. O zamandan bəri kənd camaatının yarısı Türkiyədə yaşayır.

1988-ci ildə olub-qalan camaatımızın başına olmazın oyun açdılar. Xüsusilə bizdə azərbaycanlıların sayı azaldığına görə bizi heç cür saymırdılar. Tez-tez camaatı yığır, “Böyük Ermənistan” haqqında iclaslar keçirir, türkləri asıb-kəsirdilər.

İclaslardan sonra azərbaycanlı evlərinə basqınlar təşkil olunur, benzin doldurulmuş butulkalar atılıb evlərə od vurulur, adamlar vəhşicəsinə döyülürdü.

Belə basqınlardan birində İsfəndiyarın, Hüseynin və Əlinin bütün ailə üzvlərini ölümcül hala salana kimi döydülər. Əsgərlər həmin ailələri tələsik kənddən çıxartdılar. Altı-yeddi ay keçəndən sonra Artaşatın hüquq-mühafizə orqanlarının işçiləri İsfəndiyarın oğlunu Bakıdan Artaşata apartdırıb 4 il həbs cəzası kəsdilər. Sual olunur Azərbaycan tərəfi öz millətinin övladlarını düşmən ermənilərə niyə verirdi? Sualın cavabı ancaq budur: millətin başında duranın namus və qeyrəti çatmayanda hər şey ola bilir. Həmin dövrdə Azərbaycana rəhbərlik edənlər erməni barmağında oynayan vəzifə düşkünləri idi. İşə bax, döyülən də sən, cəza alan da! Səbəbi odur ki, ermənilərin basqın etdiyi vaxt həmin adam ermənilərə müqavimət göstərib. Bəs Bakıdan həmin oğlanı erməni sözü ilə erməniyə qaytarıb verən hüquq-mühafizə işçiləri görəsən azərbaycanlıdırlarmı?

Onu da qeyd edim ki, Artaşat (Qəmərli) rayonunda erməni millətçilərinin fəaliyyəti olduqca güclü idi. Ermənistanda ələ keçirilmiş azərbaycanlılar gətirilib faciəli surətdə burada öldürülürdü və bu gün də ələ keçən hər hansı bir azərbaycanlının qanı həmin “cəlladxana”da axıdılır. Bura Andronikin qisası alınan müqəddəs yer sayılır.

# DƏRƏLƏYƏZ

## BƏS MƏNİM BALAM HANI?

Oğul həsrətli, bala dağlı bir ana. Naləsi yeri-yurdu yandıran, ahından dağlar alışan **MƏRCAN ana:**

-"Ay oğul, yaza bilmirəm. Mənim dərdimi sən yaz. Mən danışım, sən qələmə al. Yazmaq bacarsam da, əlim qələm tutmaz. Dilimlə deyirəm dilim yanır, dodağım alışır. Ona görə də dilimlə dediyimi sən kağıza köçürt.

Halalca çörək yediyimiz yerdə, öz zəhmətimizlə, öz əməyimizlə məşğul ikən başımıza oyun açdılar. Ermənistan hökuməti öz içində olan azərbaycanlıların üstünə müharibəyə qalxdı. Biz köməksiz, biz arxasız, onlar isə silahlı, arxalı. Çox gözlədikdən sonra gördük ki, uşaqları ermənilər qıracaqlar. 1988-ci ilin may ayının sonlarında oğlum Vaqif arvadı Nazilıni və üç uşağını götürüb Naxçıvana qayınatasıgilə apardı. Uşaqları Naxçıvana qoyub qayıdarkən Ararat rayonunun ərazisində 36 yaşlı əziz balamı öldürürlər. Bizə onun meyidini də vermədilər.

İndi dönmüşəm balasını itirmiş ahuya. Dağlara, daşlara səs salıb gəzirəm. Naləmə hay verən yoxdur. Vaqifimin balaları məndən atalarını istəyirlər. Mən onlara nə cavab verim? Nə deyim? Mən isə balamı tanrıdan istəyirəm! Vaqifin qatilləri neçə ki cəza almayıb, mənim fəryadımı dünya eşidəcək. Qəbrimdə belə, rahat ola bilməyəcəyəm. Neçə ki haqq, ədalət qalib gəlməyib... Neçə ki ermənilərə öz yerini tanıtmayıblar... Neçə ki..."

O, danışa bilmir, gözlərindən axan yaş sifəti boyunca cığır açır. Udqunub əlavə edir:

"Bir bayatı deyim, onu da yaz. Bu bayatını deyən dərdli ana öz dərdini bu bayatı ilə söyləyəndə bilib ki, o, özü tək deyil. Bilib ki, onun kimi analar yenə olacaq. O analardan biri də mən olmalıymışam, mən başıdaşlı.

Əzizim balabanı,
Asta çal balabanı.
Hamının balası gəldi,
Bəs mənim balam hanı?"

Yeğeqnadzor rayonu, Sallı kəndinin sabiq sakini **HÜSEYNOVA MƏRCAN KƏRİM QIZI.**

# ZƏNGƏZURUN DƏRDİ BÖYÜK...

...Başı minbir müsibət çəkmiş, gözü min cür od-alov görmüş Zəngəzur mahalı. Nəfəsi qan qoxulu cəllad androniklərin, droların at oynatdığı bu torpağın hər qarışı insan qanı ilə suvarılmışdı.

Özülü hələ əsrin əvvəllərində qoyulmuş bu qanlı qırğınlar 1905-1918-ci il hadisələri ilə bitmədi. Sovet hakimiyyəti illərində "qırğının" başqa formalarında təşəkkül taparaq bu mahaldan azərbaycanlıların getdikcə azalmasına aparıb çıxardı. 1950-ci illər sürgünü yerli əhalinin bir tərəfdən kütləvi azalmasına və gəlmə ermənilərin birucdan artmasına səbəb oldu.

Ermənilər fitnəkar əməlini dərinləşdirdikcə Qafanda azərbaycanlılar ara vermədən təqib olunurdular. Bu "qatil tədbiri" az vaxtda Sisyan, Gorus və Mehri rayonlarını da bürümüşdü. Silahsız, dinc əhaliyə qarşı amansız təzyiq ardıcıl olaraq həyata keçirilirdi.



**Əleyman Əliyev**

Erməni daşnaklarının törətdikləri onlarca faciəli hadisələrdən bir neçəsini ŞAHİDLƏRİN dili ilə vermək yerinə düşərdi.

Qafan rayonundakı Kaçaran şəhərinin sakini, qaçqın **ƏLİRZA ƏLİYEV:**

-"Fevralın 20-dən sonra ermənilər günümüzü göy əsgiyə düydülər. Azərbaycanlı evlərinə basqınlar artdı, döyülüb yaralananlar günbəgün artmağa başladı. Belə ağır günlərdə üç yaş-

lı uşağımız **Əleyman** qəflətən xəstələndi. Xəstəxanaya düşmək isə olduqca qorxulu idi. Gözümüz görə-görə Əleymanın ağrısına dözmədik. Yenə həkimlərin Hippokrat andının "ətəyindən" tutub, uşağı Qafan xəstəxanasına apardıq.

Başımızdan yüz söz yağdıra-yağdıra uşağı palataya götürdülər. Və iki saata qədər uşaq palatada (anası Sarıtel yanında olub) ağlaya-ağlaya qaldı. Bundan bir qədər sonra tibb bacıları istilikölçən və digər tibbi avadanlıq gətirib gəlirlər. Sarıteli palatadan çıxmağa məcbur edirlər ki, analiz üçün qan almalıyıq. Təxminən bir saatdan sonra ananı palataya çağırırlar. Bu vaxt Sarıtel tibb işçilərinin birinin əlinda qan doldurulmuş böyük bir butulka görür. Lakin o heç nə anlaya bilmir. Tibb işçiləri ona əmr edirlər ki, uşağı çıxart, apar! Onu öldürüb gətiribsən... Biz türkü müalicə eləmirik...

Uşağı evə qaytardıq, onun canında qan qalmamışdı. Qanı içilmiş Əleymana yaşamaq mümkün olmadı.

Uşağı dəfn etməyə macal tapmamış tələb etdilər ki, tezliklə evi tərk edin, burada sizə yer yoxdur. Ayın 25-də evdən çıxıb Azərbaycana üz tutmalı olduq."

**İSMAYILOV MƏMMƏD QARDAŞ oğlu:**
**Qafan şəhərinin sabiq sakini**

"Həyat yoldaşım Məhruzə Qafan şəhərindəki 7 nömrəli uşaq bağçasında müdir işləyirdi. Fevral ayının 25-də erməni quldurları uşaq bağçasına basqın ediblər. Törədilən cinayət vaxtı Məhruzə qorxur və özündən gedir. Üstündən bir neçə saat keçəndən sonra rayon maarif şöbəsinin müdiri Arutyunyan Məhruzəni çağıtdırıb tapşırır ki, Moskvadan yoldaşlar gəlib, onlar səni söhbətə dəvət edəcəklər. Bu vaxt yaxşı danışmağa çalış.

Məhruzə Moskvadan gələnə əsl həqiqəti açıb göstərmiş və de-

mişdir ki, gedin erməni bağçalarına da baxın, azərbaycanlı bağçasına da. Özünüz görəcəksiniz ki, ayrı-seçkilik çox güclüdür. Bağçaya edilən basqını da özünüz görmüsünüz...


**Məhruzə İsmayılova**

Bağçadakı hadisədən sonra Məhruzənin səhhəti təmamilə pozuldu. Onu rayon xəstəxanasına qəbul etmədilər. Bu vaxt elə bir şarait yaranmışdı ki, yola çıxmaq da təhlükəli idi, evi tək-tənha qoymaq da.

Bir qədər evdə xəstə yatandan sonra əlacsız qalıb onu Zəngilana xəstəxanaya aparmalı olduq. Və bir qədərdən sonra səhhətində dəyişiklik baş verdi. Biz onu evə qaytardıq. Ancaq, sən demə, günü uşaqlarla keçən Məhruzənin uşaq ürəyi qədər zərif olan ürəyi erməni millətçilərinin hücumu vaxtı parçalanıbmış...”


**Gülnar Novruzova**

Dözülməz dərddən qəddi-qaməti əyilmiş 67 yaşlı GİLƏ NOVRUZOVANIN göz yaşlarını görən hər kəs onun balasını itirmiş ana olduğunu yəqin etməmiş deyil.

Onun yazdığı məktubda aşağıdakı sətirləri oxuyuruq:

“Qafanın Gığı kəndinə ermənilər hücum edərkən 34 yaşlı Gülnarımı da vəhşicəsinə döydülər. Tez onu Zəngilan xəstəxanasına, oradan

isə Ağdam xəstəxanasına çatdırdıq. Ancaq əlləri qurumuş yağı düşmənlər gül balamı yaman vurmuşdular...

Xeyirxah həkimlər əlindən gələni əsirgəməsələr də Gülnarı sağaltmaq mümkün olmadı. İndi nakam balam Ağdam qəbristanlığında uyuyur. Bir ağbirçək ana kimi millətimin övladlarına deyirəm: "Baxın Gülnarımın məzarına, onun yaralarını yadınıza salın və ayıq olun. Dostu və düşməni tanıyın!"

Bu cür qanlı hadisələr təkcə Qafandamı baş verirdi? Xeyr! Bütün Zəngəzuru bürümüşdü.

Gorus rayonunun Ağbulaq kənd sakini, zootexnik işləyən Bərxudar Əsgərov toyundan cəmi on gün sonra erməni millətçiləri tərəfindən qətlə yetirildi. On bir güllə yarası almış ali təhsilli bu gəncin murazı gözündə qaldı. Bərxudar kimi günahsız yerə qanı axıdılan "təzətoylular"ın qanının axıdıldığı ilk dəfə deyildi... Hələ bunlar harasıdı. Ürəkləri soyumayan ermənilər Bərxudarın meyidini Gorusun küçələrində böyük bir şadyanalıqla nümayiş etdirdilər. Minbir əzab-əziyyətdən sonra onun meyidini əsgərlərin köməkliyi ilə alıb Qubadlıda dəfn edə bildilər.

# ALTI AYDAN SONRA TAPILAN MEYİD

**NAMAZ QƏDİRLİ yazır:**

Artıq kəndin girəcəyində bir neçə azərbaycanlı evi darmadağın edilmiş və yandırılmışdı. ”Türklərə ölüm! Türklər rədd olsun!” səsləri adamı vahiməyə salırdı. Camaat, oğul-uşaq, ağbirçək-qarabirçək zorla, silah gücünə yurd-yuvalarından qovulurdular. Onlara aman vermədilər ki, gözlərini açsınlar, əyinlərinə paltar geyinsinlər, yola bir parça çörək götürsünlər.



**Bərxudar**

Camaat kənddən bir qədər aralı, ”Güllü” bulağının başına toplaşdılar. Bir qurtum su içib dədə-baba Azərbaycan torpaqlarından didərgin olub, dağların o tayındakı Azərbaycan torpaqlarına tərəf üz qoydular. Didərginlərin arasında Şahnisə nənə də vardı. Şahnisə nənə heybəsinə ərindən yadigar qalan məktubları qoyub evdən çıxanda doğma evə, kəndə, qəbristanlığa baxıb köksünü ötürdü. Gözündən axan yaşı silib səs-küy qopan tərəfə ağır-ağır irəlilədi.

Bərk çovğun idi. Göz-gözü görmürdü. Qocalar, cavanlar bir-birinin əlindən tutmuş, ürəklərində minbir dərdlə çovğundan, borandan əsə-əsə gedirdilər. Xalisə nənə addım-addım irəliləyirdi. Axır ki, taqətdən düşdü, qarın içinə yıxıldı. Hamının başı Xalisə qarıya qarışdı, Şahnisə nənənin hara getdiyi bilinmədi. Xalisə qarını

Laçının Minkəndinə çatdırdılar. Qarının vəziyyəti ağırlaşsa da qanı qaçmış dodaqlarını aralayıb dedi: "Şahnisə hanı bəs?" Bu, onun son sözləri oldu...

Camaat dağa-daşa düşüb Şahnisə nənəni axtarsa da tapa bilmədi. 1989-cu ilin iyun ayında Allahyar və qohumları Minkəndin Kilsəli adlanan yerində qayanın altında dəhşətli bir mənzərənin şahidi oldular. Oradan Şahnisə nənənin ağappaq saçlarını, paltarından bir dəst və bir də heybəsində illərlə saxladığı və təsəlli tapdığı, ömürgün yoldaşı Şamilin qədirbilməz sovet hökuməti uğrunda canını qurban verərək müharibədən göndərdiyi yadigar məktub və şəkilləri tapdılar. Allahyar başı çox müsibətlər çəkmiş bacısından qalan bu nam-nişanı bağrına basıb hönkür-hönkür ağladı.

Kaçaran şəhərinin sakini Şirin Məmmədov da Xüstub dağında borana düşüb həlak oldu.



**İzzət**

# DAĞLARINDA BİR YARALI QUŞ QOYDUM

Azərbaycanlıların gur yaşadığı Göyçə və Qaraqoyunludan buranın əbədi sakinlərini çıxarmağın vaxtı çatmışdı. Marıqda duran ovçu məqamı əldən vermədiyi kimi, ermənilər də bu məqamı çoxdan gözləyirdilər. Həm belə bir şərait üçün zəmin hazırlayır, bütün erməniləri ”düşmən türklərə” qarşı nifrətlə silahlayır, həm də xristianlara quyruq bulamaqla torpaq qoparmaq iştahı ilə iş görürdülər.

Yenidənqurma, demokratiya və aşkarlıq pərdəsi altında tarixdə görünməmiş bir haqsızlıq azərbaycanlıları yaxaladı. Bu haqsızlığın şaxələnmiş budağı Azərbaycanı Yerevandan budasa da, kökü Kremldən su içirdi.

Ermənistanda azərbaycanlıların bu gün bütövlükdə yaşadığı ən böyük ərazi Basarkeçərin Yuxarı Şorca kəndindən tutmuş “Darlığın körpüsü”nə qədər olan (İcevan rayonunun Haqqıxlı kəndi) 150 kilometrlik məsafədə mövcud idi. Bu qədər torpağın azərbaycanlılardan alınması onları iki minillik tarixindən məhrum etmək demək idi.

Rayon və respublika rəhbərləri kənd-kənd gəzib camaata xəbərdarlıq etdilər ki, onların sizi qorumağa gücü qalmayıb. Neçə rayon birlikdə Göyçə-Qaraqoyunlu əhalisinin üstünə yeriməyə hazırdır.

İqtisadi blokada bir tərəfdən, silahsızlıq da bir tərəfdən... Bunlarla da yola getmək olardı, əgər Bakıdan bircə nəfər (əlbəttə, millətin başında duranlar) desəydi ki, qorxmayın, biz arxanızda dayanmışıq! Kim deyəcəkdi? Çünki bədbəxtlik elə orasında idi ki, xalqın başı üstündə dayanan Ə. Vəzirov rəhbər kimi daşıdığı vəzifənin

öhdəsindən gələ bilmirdi. Ermənilər də çoxdan bəri idi ki, belə rəhbər axtarır və fürsət gözləyirdilər.

Ermənistan rəhbərliyinin xəbərdarlığından sonra kəndlərə basqınlar geniş şəkil aldı. Əsgərlər elə bil ki, hadisəni izləyən müxbirlər idi. Evlər yandırılır, qarətlər, qətllər ara vermirdi. Müqavimət göstərən azərbaycanlılar üçün dərhal cinayət işi qaldırılır və yaxalanırdı.

Köç karvanının əvvəli Qazaxda, sonu Basarkeçərdə idi. Qazağa gedən köç maşınlarını talamaq vəzifəsi İcevan rayonu ərazisindəki yolkəsənlərə, Gədəbəyə gedən köçlərin talanması isə Orçonikidzedəki quldurlara həvalə olunmuşdu. Əhalinin yönü isə Şahdağ silsiləsinə yönəldilmişdi.

Qarlı-boranlı gədiklər, qar basmış uçurumlar, buzlamış dərələr... Bu maneələri dəf edənlər isə qucağı uşaqlı analar, hamilə qadınlar, qocalar, uşaqlar, əlillər və onları ölümdən qurtarmağa çalışan cavanlar, ortayaşlılar... Bir sözlə, azərbaycanlılar...

**Ağbulaq kənd orta məktəbinin dil- ədəbiyyat müəllimi,**
**Şahid İSA ƏHMƏDOVUN dediklərindən:**

-"Topaşan deyilən yerdən keçirdik. Soyuqdan əllər-ayaqlar tutulmuşdu. Ağlaşma, ah-nalə göyə bülənd olmuşdu. Üzüqoylu dərələrə tərəf sürüşən kim, yamacdan ayağı qaçıb xəndəklərə yuvarlanan kim, yorğunluq və taqətsizlikdən qar sovğunu altda qalan kim, nəhayət, ömrünün son dəqiqələrini yaşayan kim?..

Camaat isə dağların beli ilə aşıb gedirdi. Bu vaxt Qara adlı bir nəfər ağsaqqalın üzünü Göyçəyə tərəf tutub qışqıra-qışqıra danışdığı bizi heyrətə saldı. Sanki dəli olmuşdu yurd-yuvasından perikmiş qartalmisallı bu qoca:

***"Haraya gedirsiniz, deyin görüm harya? Harya gedirsiniz, ay sahibsiz, köməksiz yazıqlar? Hərəniz qoltuğunuza bir şəltə vu-***

***rub getməklə nə demək istəyirsiniz?! Gücünüz çatmadımı evinizi-eşiyinizi arxanıza vurasınız? Qayıdın, qayıdın, ay evi yıxılmışlar, nəyiniz varsa çyininizə yükləyin! Qoymayın bir çöpünüz də oğraş düşmənə qalsın! Qayıdın, məni də qaytarın, Göyçəni qaldırın arxama! Dəngizli, çaylı, bulaqlı, dağlı-daşlı, qəbristanlı Göyçənin hamısını özümlə aparacağam, öz çiyinlərimdə! Qaytarın məni, Göyçəni qaldırın çiynimə! Göyçəni kimə qoyub gedirik?! O müqəddəs torpaq murdarlanacaq, qaytarın məni, Göyçəni qoymaram qala!"***

Qoca bu sözləri dedikcə elə bil dağ-daş lərzəyə gəlirdi. Onun ağlaya-ağlaya dediyi bu sözlər altında hamı hönkürürdü. Ömründə ağlamayan kişilər də ağlayırdı... Onlar düşmənə cavab verə bilmədiklərinə görə, arxasız olduqlarına görə ağlayırdılar!

Hər kəs bir tərəflə axıb gedirdi. Qoca ata-analarını çiyinlərində aparan oğullar, kimsəsiz, əlsiz-ayaqsız adamlara kömək edən neçə cəsurlar gördük.

Bir həftə sonra eşitdik ki, "Göyçəni çiynimə qaldırın" deyən Nərimanlı kəndindən olan Qara Elləzov boranda həlak olub, meyidi dörd gündən sonra tapılıb və onu gədəbəylilər ədəb-ərkanla dəfn ediblər.

Təkcə Şişqaya kəndindən olan dörd nəfər adam dağlarda borana düşüb həlak oldu. 16 yaşlı Şahin, bu günahsız yeniyetmənin meyidi beş aydan sonra qar altından çıxdı. Onu Şamxor rayonunun Cəyir kəndində dəfn etdilər."

**Basarkeçər rayonunun Zərzibil kənd sakini ŞƏFİQƏ MƏMMƏD QIZI ZEYNALOVANIN bizə ünvanladığı məktubdan sətirlər:**

"1988-ci ilin 28 noyabr günü həyat yoldaşım Mehvalı İsmayılov

sovxozumuzun direktoru Mehmandar Əliyev ilə birlikdə mövcud vəziyyət barədə rayon partiya komitəsinə

məlumat vermək üçün rayon mərkəzinə getdilər. Rayon mərkəzinə çatan kimi ermənilər "Villis" maşınını mühasirəyə alırlar. Nə üçün gəlibsiniz?-deyə soruşurlar.

Direktor deyir:

-Camaat edilən hücumdan qorxub kəndi tərk edir, mal-qara sahibsiz qalır.

-Demək, siz hələ qalmaq fikrindəsiniz?-deyə quduzlaşmış ermənilər onları əzişdirməyə başlayırlar. Öldürmək istərkən rayon Partiya Komitəsinin birinci katibi Yenqoyan hadisə yerinə gəlib çıxır və onları xilas edir. Özlərinə də tapşırır: "Bilin və agah olun, bu iş mənlik deyil, başınıza çarə qılın!"

Bu hadisədən sonra mən 8 uşağımla birlikdə dağlarla Kəlbəcərə tərəf üz tutmalı oldum. Qardan-borandan göz-gözü görmürdü. Tez-tez cığırı itirir, uçuruma yuvarlanırdıq. Beş yaşlı kiçik uşağımı arxamda apardığımdan və qoca qaynanama tez-tez kömək əli uzatdığımdan on yaşlı Fəxrəndə elə bil unudulmuşdu. O, addımbaşı yıxılıb-qalxır, getdikcə gücdən düşürdü. Ondan böyük uşaqlarım isə özlərini birtəhər apara bilirdilər. Nəhayət, belə bir çətin şəraitdə, gözlərim görə-görə körpə Fəxrəndəmi itirdim."

**Bala Məzrə kəndinin sakini, 1952-ci ildə anadan olmuş VAQİF YAQUB OĞLU RÜSTƏMOVUN dediklərindən:**

-"Digər kəndlərdə olduğu kimi, bizim Bala Məzrə kəndinə də güclü basqın edildi. Qaniçən erməni quldurları məni ölümcül vəziyyətə saldılar. Qarın nahiyəmdən iki bıçaq yarası və çoxlu zədə aldım. Həmçinin qıçımı üç yerdən sındırdılar. Həmin basqında kəndçilərimizdən Qurban Sadıqov, Musa Mustafayev, Şamo Mu-

sayev və Cibi Nigar qızı da ölümcül döyülmüşdülər. Onlar aldıqları ağır yaralardan sonra vəfat etdilər.

Ermənilərin vəhşiliyinə dair faktlar bir deyil, beş deyil. Elə bir kənd, elə bir oba yoxdur ki, erməni təcavüzü ondan yan ötmüş olsun. Basarkeçərin Qayabaşlı kəndindən olan Koroğlunun və Çaxırlıdan olan Sayadın maşınlarını vurub qəzaya uğradan ermənilər Krasnoselodan (Gölkənd) Cahan Qocayevi öz evində, İcevan rayonundan (Polad) Yaqub Rüstəmovu işgəncə ilə öldürdülər.

Krasnoselo rayonunun Gölkənd, Çaykənd, Əmirxeyir, Bəryabad, Yanıqpəyə və Qaraqaya kəndlərinin əhalisinə böyük işgəncə verən qatillər mal-qaranı Azərbaycanlılardan zorla alır, dağ yolu ilə Azərbaycana keçirilən qoyun və malın qabağını kəsib aparırdılar.

Dağlarda uşağa yatan və həlak olan ananı da eşitmişik, ananın qolları arasında boranda donub can verən körpəni də. Qardaşının bir qıçını, oğlunun başını qoltuğuna vurub dəli-divanə olmuş ana və bacını da görmüşük. Amma heç kimin yadına düşməyən bir ölümdən istifadə edən ermənilər bir daha öz "qədim mədəniyyətlərini" nümayiş etdirmişlər.

Qoşabulaq kəndinin sakini Tapdıq vaxtında maşın tapa bilmədiyinə görə əşyalarını çıxarmaqda gecikibdi. "Lələ köçüb, yurd ağlayandan" sonra maşın tapıb əşyalarını yükləməli olarkən saqqallılar gəlib oraya çıxırlar. Tələsdirirlər ki, tezləşdir, çıx aradan, yoxsa ölümünü gözünün altına almalı olacaqsan. Maşın yüklənib qurtarmağa az qalmış onlar da Tapdığın ardınca evə daxil olurlar. Bir qədərdən sonra çıxıb getmişlər. Sürücü içəri girib ki, görsün Tapdıq harda qaldı. Nə görsə yaxşıdı... Elektrik cərəyanı onu vurmuşdur... Məsələ aydın idi. Ermənilər müxtəlif işgəncələrlə türk öldürmək planlarına bir ölüm növü də əlavə etdilər: "Gözü baxa-baxa elektrik xəttinə birləşdirib öldürmək!"

Vahram isə 1919-cu ildə həmin kəndlərdə ölümün bu növündən istifadə edə bilməmişdi. Çünki o dövrdə elektrik cərəyanı yox idi. Ancaq "gülləyə qıymadığı üçün" Tapdığın babalarını quyuya töküb, üstündən daş tökdürmüşdü. Sayseçmə igidləri gəmiyə dolduraraq boyunlarına daş bağlatdırıb, Göyçə gölünün dərinliyində təpəsi üstə suya atdırmışdır...

**AĞƏLİ İSMAYILOV (Bakı şəhəri "Qasid" Mətbuat yayımı firmasının sədri):**

Erməni xəyanəti yenə öz quduz həddinə çatmışdı. Arxasını Rusiya kimi bir dağa söykəmiş yırtıcı təbiətli daşnak cəlladları türk qanı içməyə fürsət gəzirdi. Bu fürsət isə artıq ələ düşmüşdü. M.Qorbaçov kimi insanlıqdan uzaq ölkə rəhbərinin icazəsi ilə Azərbaycan türklərinə qarşı böyük bir soyqırımı hazırlanmışdı.

Erməni psixologiyasına bələd olan bir adam kimi bilirdim ki, camaatı öz dədə-baba yurdundan çıxaracaqlar. Və bu haqda dəfələrlə yuxarı təşkilatlara sözümü demişdim. Ancaq nə fayda, hərə öz işində idi...

Nəhayət dəhşətli noyabr günləri başladı. Ermənistandakı soydaşlarımıza qarşı kütləvi qaydada hücumlar genişləndi. Əliyalın, kimsəsiz adamlar silahlı erməni qaniçənləri ilə üz-üzə qalmışdılar. Hər gün, hər saat acı və kədərli xəbərlər bir-birini əvəz eləməkdə idi. Mən durub dincələ bilmirdim. İçimdən qovrulur, sağa-sola çırpınırdım. Erməni tapdağında qalmış qohum-əqrabamın, el-obamın qanı axıdılırdı... Onlara kömək əli uzatmaq istəyirdim. Ürəyim göyüm-göyüm göynəyirdi...

Axır ki, Bakı şəhər komendantı Tyuqunovla görüşüb ondan 4 ədəd "İkarus" markalı avtobus aldım. Bir nəfər mayorun rəhbərliyi

ilə hər avtobusa iki nəfər əsgər təyin etdilər. Bakıdan gedən avtobuslar Qazaxdan İcevana keçə bilmədi. Ermənilər tərəfindən güclü atəşə tutuldu və üç gündən sonra onlar geri qayıtmalı oldular.

Vəziyyət getdikcə ağırlaşırdı. Mən tələsik bir vertolyot götürüb doğma obama-Krasnoselo rayonundakı Toxluca kəndinə uçdum. Çatanda gördüm ki, "lələ köçüb, yurd ağlayır" - camaatın 90 faizi kəndi tərk edib. Mən qırx nəfər əlsiz-ayaqsız adamı vertolyota mindirib aradan çıxardım. Bu mənim öz həmyerlilərim qarşısında az da olsa borcum idi...

Ancaq doğma kəndimlə olan bu son görüşüm ömrüm boyu məni yandırıb-yaxacaq.

Tarixən erməni cəlladlarına qarşı qəhrəmanlıq göstərmiş bu kəndin adamları bu gün necə miskin bir vəziyyətə düşmüşdülər. Elə bil ulu Toxluca yas içində ağlayır, öz əzəli sakinlərinin arxasınca əliuzanıqlı qalmışdı. Zəncirdə qalmış itlərin ulaşması pişiklərin miyoltusuna qarışıb adamı vahiməyə salırdı. Mənə indi elə gəlirdi ki, itlər də, pişiklər də, yolların kənarında, pəyələrdə böyrüşən heyvanlar da bu zülmü, haqsızlığı görüb ona yas tutub, şivən qoparır.

Son dəfə həsrətlə odlana-odlana baxdığım solğun bənizli Toxlucamın və onun şimalındakı müqəddəs qəbristanlığın məhzun şəkli indi də gözlərimin içindədir. Kim mənim yurd həsrətimi duymaq istəsə gözlərimin içinə baxsın!..

# BƏDBƏXT TALELİ İNSANLAR

Ruqiyyənin atası bacarıqlı mexanizator idi. Çox gənc də olsa Krasnoselo rayonundakı Əmirxeyir kolxozunda traktor tarlaçılıq briqadasına başçılıq edirdi. Sultanəli Zərnişanla Əmirxeyirdə ailə həyatı qurmuşdu. Bu səadət uzun sürmədi. 1954-cü ilin qarlı-çovğunlu bir qış günündə Sultanəlinin idarə etdiyi traktor qar uçğunu nəticəsində qəzaya uğradı. 26 yaşlı bu gənc həlak oldu. Elə o vaxtdan gənc ana Zərnişan bütün varlığı ilə mehrini yeganə balası Ruqiyyəyə saldı. Onun hər cür nazını çəkməyə, üzünü gülər görməyə çalışdı. Gəncliyini əziz balasının yolunda əritdi. Nəhayət, sevimli qızına toy edib, ər evinə köçürdü.



**Zərnişan Əliyeva**

Ruqiyyə üçün Ağbulaq da Əmirxeyir qədər doğma idi. Çünki atası bu kənddə doğulmuşdu. O, bu kənddə xoşbəxtliyini tapdı. Həyat yoldaşı Əzizlə birlikdə gözəl bir ailə başçısına çevrildi. Dörd uşaq anası olan Ruqiyyə qoçaq, işgüzar, ləyaqətli bir gəlin kimi qohum-qonşunun hörmətini qazandı.

Hadisələrin qızğın dövründə həyat yoldaşı Əzizlə bu qənaətə gəldilər ki, hər ehtimala qarşı uşaqları aparıb Azərbaycana qoymaq lazımdır. Elə də etdilər. Uşaqları QAZ-221 markalı şəxsi “Volqa” maşınlarına mindirib Ağbulaqdan çıxdılar. Krasnoselonun və Orconikidzenin içindən rahat ötdülər. Sən demə, tülkü qiyafəli

erməni quldurları yollarda daşların arxasına dolub türk marığında durublarmış. Qəfildən atəş atəş ardınca açıldı. Gözləmək olmazdı, Əziz qoçaqlıq edib maşının sürətini artırdı. Yol boyu elə bil maşının üstünə daş yağışı yağırdı. Şınığın qənşərindəki dolama yollar boyunca maşının qabağına hellən qoyulmuş qaya parçaları düşürdü. Maşın əzik-əzik olmuşdu.

Nəhayət, "Volqa" böyük bir qayaya dəyib aşdı. Xoşbəxtlikdən ölüm hadisəsi baş vermədi. Yəqin ki, Şınığın yaxınlığı olduğuna görə qəzaya düşmüş maşının üstünü ermənilər almadılar. Görünür, uşaqların yaşamaq müddəti qurtarmayıbmış...


**Ruqiyyə Zeynalova**

Ruqiyyə bu qovhaqovda balalarını erməni cəlladlarından qurtara bilsə də, özünü xilas edə bilmədi. Bir neçə müddətdən sonra anası Zərnişanla birlikdə onlar olan maşın erməni məkrinin qurbanı oldu. Maşın partladıldı...

Camaat dedi ki, mehrini tək balası Ruqiyyəyə salmış Zərnişan gəlin balasından ayrı yaşaya bilməzdi. Sultanəlidən sonra onsuz da onun deyib-gülmək sevinci kəsilmişdi. Bu dəfə isə Zərnişan Ruqiyyənin belə faciəli ölümünü gözləri ilə görsəydi dünya od tutub yanardı. Ana fəryadına qayalar əriyər, torpaq odlanardı. Mayası halallıqla tutulmuş dağlar Zərnişanın ahına dözməzdi. Bəli, bu zülmə təbiət də, Allah da dözməzdi! Amma cövhəri hiylə və biclikdən qurulmuş erməni qəlbini ana qarğışı, ana fəryadı ağrıda bilməzdi...

Kimsə deyə bilər ki, ermənilər türklərə qarşı həmişə qəddarlıq göstərmişdir. Doğrudur, türkü düşmən kimi qəbul etdiyinə görə ermənilər amansızlıqdan heç vaxt usanmamışlar. Lakin qəribədir ki, ermənilərdə heç bir millətə qarşı məhəbbət hissi də yoxdur. Mən bu qənaətə uzunillik birgə işdə və ermənilərlə etdiyim yoldaşlıqda gəlmişəm. Əgər imkanları olsa rusu da, ingilisi də, almanı da, yəhudini də bir gecədə məhv edərlər. Bu imkan olmadığına görə, ermənilər güclü dövlətlərə, yaxud millətlərə yaltaqlıq edirlər. Amma ürəklərindəki ürəklərindədir...

# ZİYARƏTGAHLAR DAĞIDILIR...

Hamı bilir ki, Sovet hakimiyyətinin ilk illərinə kimi İrəvan şəhəri əhalisinin yetmiş faizdən çoxunu Azərbaycan türkləri təşkil etmişdir.

Burada böyük şəhər qəbristanlığı olmuşdur. Bəs o qəbristanlıq bu gün dururmu? ”Dünyanın mədəni xalqı” hay-küy salır ki, türklər İrəvanda heç bir tarixi abidə qoymamışlar. Belə bir sual ortaya çıxır: məgər türklər qəbristanlıq da qoymamışlar? Bəs onda bu qəbristanlıq hanı? Toxmağangöl qəbristanlığı adında bəlkə bir məzarlıq olmamışdır? Yox, ”Göy məscid” kimi onu da danmaq, gizləmək ehtiyacı yaranmışdır. Axı, yurdsuz ermənilər beləcə yurd sahibi oldular...



**Mirəli ağa və Miryaqub ağa türbələri**

1988-ci il hadisələrindən sonra Ermənistanda olan Azərbaycan maddi mədəniyyət abidələri dağıdılır, qəbirlər buldozerlərin ağzına verilir, qranit başdaşları aparılırdı.

Krasnoselo rayonundakı Ardanış kəndinin qəbristanlığındakı qranit qəbir üstləri aparılmış, Ağbulaq kəndinin qərbindəki qədim qəbristanlıq buldozerlə düzəldilib, stadiona çevrilmişdi. Kəndin şərqindəki qəbristanlıq da dağıdılmışdı. Buradakı **məşhur Mirəli ağa və Miryaqub ağa** türbələri yerlə- yeksan edilmişdir. Bu türbələr nadir mədəniyyət

abidəsi kimi bütün Göyçə, Qazax, Tovuz, Gədəbəy, Şəmkir və Gəncə ətrafında da məşhur idi. Həmin türbələrin önündə hər gün neçə-neçə qurbanlar kəsilir, nəzir-niyaz paylanırdı. Hətta ermənilər özləri də çox vaxt bu ziyarətgahlara dilək eləyib gəlirdilər. Demək olar ki, yerli ermənilərin əksəriyyəti Mirəli ağa və Miryaqub ağa ziyarətgahlarına müqəddəs ocaq kimi baxırdılar. Bəs nə oldu? Bu inam vardısa, xain qəlblərə bir təsir göstərə bilmədimi?

## CAHAN QOCAYEV

Krasnoselo rayonunda qocayevlər ailəsini tanımayan yox idi. Sovet hakimiyyətinin ilk illərindən Kommunist Partiyasının üzvü olan Alı Qoçayev müxtəlif vəzifələrdə çalışmış, işgüzar və dönməz işçi kimi tanınmışdı.



**Cahan Qocayev**

Alı kişinin oğlu Cahan Qocayev də rayonda adlı-sanlı adamlardan biri idi. Müxtəlif vaxtlarda o, Gölkənd sovxozunda zootexnik, təsərrüfat rəhbəri, rayon istehsalat idarəsində zootexnik və rayon ət tədarükü idarəsinin müdiri vəzifələrində işləmişdi.

Rayonda ermənilər arasında da Cahanın çoxlu dostu və tanışı var idi. Noyabr hadisələrində Cahan ev əşyalarını Azərbaycana tamam apara bilməmişdi. Buna görə də dekabr ayında yenidən qayıdıb əşyalarını Gölkənddən çıxarmaq qərarına gəlir. Eşidib-bilən ona etiraz eləyir ki, getmə,

erməni yaraqlıları quduzlaşıblar.

-Nə danışırsız,-deyə Cahan heyrətini gizlədə bilmir. Məni rayonda tanımayan yoxdur. Hamısına hörmətim keçib, rəhbər işçilərlə yüz yol oturub-durmuşam. Həm də gedim Murğuzla (Murğuz dağ adıdır. E. İ.) görüşüm, Gölkəndlə vidalaşım, bəlkə bir də yolum düşmədi.

Bir ədəd yük maşını kirələyən Cahan viran olmuş kəndinə yola düşür. Həyətə çatanda görür ki, bir dəstə erməni onun ev əşyalarını, kartofunu, meyvəsini daşıyır. Cahan onlardan birini-martunili Aşotu tanıyır və salam verib deyir:

-Aşot kişi, yəqin qorxursan ki, mənim əşyalarımı özgəsi apara, ona görə də bir tanış kimi özün işə başlayıbsan...

-Ara, nəyə görə gəlibsən, ba qorxmursan sani öldurarlar?-deyə Aşot soruşur.

-Aşot, mənim burda dostlarım azdımı məni öldürələr, elə biri də sən. Gəlmişəm köçümü aparam.

-Nə köç ara, sana heç burdan bir çop da vermarıx!

-Aşot, olmaya məni tanımırsan?

-Ara, Cahan, uzaxlaş burdan, qoy işimizi görax!

Mən sizlə davaya gəlməmişəm. İndi ki, belədir qayıdıb gedərəm.

Bu sözdən dərhal sonra onlar Cahanın üstünə tökülürlər. Əllərinə keçən daş, ağac, nə var onun təpəsinə, belinə çırpırlar. Cahan özünü sürüyüb birtəhər kənarda dayanmış maşının kabinəsinə salır və aradan çıxırlar.

Yol boyu aldığı zədə onu incidirdi. Yaralar soyuduqca kəskin ağrılar artır, tez-tez huşunu itirirdi. Qazağa çatan kimi sürücü onu xəstəxanaya aparır. Həkimlər Cahana ilk yardım göstərib, təcili müayinədən keçirib müalicəyə başlayırlar. Hadisədən xəbər tutan qohum-qardaş onu Bakıya götürüb adlı-sanlı həkimlərə göstərirlər.

Həkimlərin bir neçə gün çəkdiyi gərgin zəhmət səmərəsiz qalır.

Cahanın vaxtilə at oynatdığı torpaqda indi yadlar ona qənim kəsildi. Qonaqlı-qaralı dədə-baba ocağında son qisməti aldığı ağır bədən xəsarətləri oldu. Həm də həmişə hörmət etdiyi, bir vaxt Türkiyədən köçüb gəlmiş, uzun müddət Alı kişinin səxavəti ilə bir tikə çörək tapanda on dəfə dil çıxaran qaxdağan (qaçqın) ermənilər tərəfindən qətlə yetirildi.

# ATAMIN BAŞLADIĞI NAĞIL

**ƏLİ ZEYNALABDI OĞLU - Basarkeçər rayonu Qoşabulaq kənd orta məktəbinin müəllimi:**

- Göyçənin nağıllı-dastanlı dünyası bizi başqa kökdə kökləmiş, başqa ruhda cilalamışdı. Hər şeydə şeir-sənət ölçüsü axtarır, nağıllı bir aləmlə qovuşurduq. Elə bilirdik simurq quşu da Göyçənin bu dağlarındadır, Məlikməmməd də, Ağ atlı oğlan da... Gecəmiz-gündüzümüz nağıl içində keçdiyindən həyatımız da nağıla bənzəyirdi. Bəzən adi həyat həqiqətləri də bizə xəyal kimi körünür, nağıl sevgisi ilə canımıza yayılırdı.

Yaxşı yadımdadır. Atam əvvəlki qaçqında başlarına gələni nəql edirdi. Ermənilərin törətdikləri qırğından elə ürəkağrısı ilə danışırdı ki, mənə bu səhnələr həqiqi mənada nağıl kimi gəlirdi. Deyirdim, yəqin atam özü də nağıllarda olan qəhrəmanlardan biridir.

1988-ci ildə mən öz nağıl dünyamdan ayrıldım. Daha doğrusu, "atılan topların səsinə diksindim". Gördüm ki, məni bürüyən hadisələr nağıl yox, həqiqətmiş. İnsanın insana zülmü və haqsızlığı imiş. Deməli, başına minbir müsibət gəlmiş atam olan haqq-hesabları danışırmış.

Öz dünyamıza qapılıb rahat yaşadığımız bir zamanda "erməni barmağı" dünyanı bir-birinə çalxadı. Elə bir oğraşlıq əməliyyatı həyata keçirdi ki, bu haqq-hesab dünyada heç bir insanlıq qanunu ilə ölçülə bilməz. Hər gün kəndlərə silahlı basqınların təşkili daha camaatı canından da usandırmışdı. Nə qədər bu vəziyyətə dözmək olardı... Artıq on ay olardı ki, həyasız erməni təcavüzünə məruz qalan azərbaycanlılar əldən-ayaqdan düşmüşdülər.

Əliyalın, silahlı düşmənlə üz-üzə durmaq, eyni zamanda

müqavimət göstərildiyi təqdirdə cinayət məsuliyyəti daşımaq camaatı mənəvi cəhətdən sarsıtmışdı. Getdikcə ürək xəstəliyindən ölənlərin sayı artırdı. Bir mənəvi genosid azərbaycanlıları bütövlükdə bürümüşdü.

Növbəti hücumlardan birində on yaşlı Ruxsarə özünü evə güclə çatdırdı. "Ay ana, ermənilər gəldi"-deyib hönkürtü ilə ağlamağa başladı. Bağrı yarılmaq dərəcəsinə çatırdı. Onu heç cürə ovundura bilmirdik. Su da içirə bilmədik, dişləri kilidlənmişli. Getdikcə körpə qız çiçək kimi solurdu. Heç yana əlimiz çatmadı. Bu məsum körpə gözümüzün qabağındaca çıraq sönən kimi söndü.

Məni sarsıdan təkcə Rüxsarə balamın ölümümü oldu?! Bala dərdi dözülməz dərd olsa da, aman Allah, daha dəhşətli, daha zülümlü ölümlər gördüm. Bu səhnənin şahidi olduğum üçün elə bil indi də kino lentinə baxıram. Gözümün önündə Azərbaycana dağlarla aşan adamların faciəsi canlanır. Yəqin ki, mən bu dərdi ömrüm boyu unuda bilməyəcəyəm!

Bir qədər öndə, Kəlbəcər dağlarına çathaçatda on-on beş adamın toplaşdığını gördük. Oraya tərəf yaxınlaşanda dedilər ki, cavan bir gəlin uşağa yata bilməyib, indicə canını tapşırdı. Sağ olsun igid oğlanlarımız belə bir vəziyyətdə həmin gəlinin meyidini Kəlbəcərə çatdırdılar.

Əlini-ayağını soyuq alanlar saysız-hesabsız idilər. Onlardan bir qismi az bir vaxtda həmin dərdlə dünyasını dəyişdi.

Gördüyüm bir səhnə daha maraqlı idi. Sarıyaqubdan olan bir oğlan arxasına vurduğu bağlamanı göz bəbəyi kimi qoruya-qoruya gedirdi. Daha çox ehtiyatlı hərəkət etdiyindən ürəyimdə onu "qorxaqlıqda" qınadım. Sonra da düşündüm ki, yəqin pulları-paraları var, ona görə ehtiyatlanır.

Oğlan, deyəsən, mənim ona qarşı ürəyimdən keçənləri sezmişdi.

Üzümə baxmadan, yoluna davam edə-edə dedi:

-Əli müəllim, mən Sarıyaqubdanam. Nəsibin oğluyam. Mənim arxamdakı əmanətin beş yüz il yaşı var. Miskin Abdalın sənədləri və əşyalarıdır. Şah İsmayıl Xətainin ona verdiyi möhürlü sənəd də bu bağlamadadır. Çalışıram ki, babamın nişanələrini Azərbaycana çatdırım. Axı, o xalqımızın tarixidir.

Mən nə deyim belə igidə! Elə bil hücum artdı, gözlərimə işıq gəldi. Canından qorxmayan, ancaq tariximizin bir parçasının itməsindən qorxan bu oğlana çox sağ ol!- dedim.

Kəlbəcərə çatdıq. Qardaşlarımız bizi çox böyük hörmətlə qarşıladılar. Bir neçə gün keçəndən sonra eşitdim ki, həmkəndlim Əli Əliyev vəfat edib. Kəndimizə basqın vaxtı ermənilər onu bərk döymüşdülər.

Minbir əzab-əziyyətlə dağların qarından-boranından keçib Kəlbəcərə çatanda xəyalım yenə nağıllar aləminə qayıtdı. Demək, Göyçənin nağıl dünyasında onun zaman-zaman başına gələn həqiqətlər yaşayırmış. "Ağ dağ" ilə "Qara dağ"ın üz-üzə dayanması, ağ qoçla qara qoçun vuruşu və nəhayət qaranlıq dünya ilə işıqlı dünya əhvalatı...

Bəzirgan adlanan yerdə divlərin bir mağaraya doldurulması, təpəgözlərin Qalaçaya hücumu va s. və i.a.

Bu nağıllar bax, belə yaranırmış. Sən demə, iki min il əvvəl də həmin qara qüvvələr babalarımıza xəyanət edirmişlər. Babalarımız isə qara qüvvələrlə öz aralarında gedən mübarizələri bizə nağıl dili ilə çatdırırmışlar. Biz isə...

Bəli, atamın başladığı nağılı indi mən davam etdirirəm...

Aylardan bəri davam edən haqsızlıq son həddə çatmışdı.

Gündəlik Ararat vadisinin havası haqqında məlumat verən mərkəzi televiziya 200 mindən artıq adamım müsibətindən bir

kəlmə də olsun söz açmaq istəmirdi.

Azərbaycanlıların gur yaşadığı Basarkeçər və Krasnoselo rayonlarının əhalisini doğma evindən çıxarmaq üçün bütün Ermənistan səfərbərliyə alınmışdı. Ətraf aləmlə əlaqə tamam kəsilmiş, hər cürə silahlı dəstələr evləri yandırmaq, maşınları çevirmək, dinəni həbsə almaq kimi mürtəce siyasət həyata keçirirdilər. Həmin vaxt baş vermiş yüzlərlə hadisədən biri:

# SAQQALLILAR DİŞLƏRİ ÇIXARIRLAR

**Adı: Əli**
**Atasının adı: Alı**
**Soyadı: Əliyev**
**Təvəllüdu: 1940-cı il**
**Anadan olduğu yer: Basarkeçər rayonu, Qoşabulaq kəndi**
**Təhsili: avtonəqliyyatın istismarı (orta ixtisas təhsilli)**
**İş yeri: Zod geoloji-kəşfiyyat idarəsində sürücü**
**İxtisası üzrə iş istəyərkən aldığı cavab: ermənicə bilmirsən.**

Kiçik arayışdan öyrəndik ki, Əli Zod geoloji-kəşfiyyat idarəsində sürücü işləyirdi. Yoldaşları arasında işgüzarlığı ilə seçilirdi. 1988-ci ilin noyabrında azərbaycanlılar güclə işdən qovulurdular. Əli isə ermənilərin bu haqsız tələbinə riayət etməkdən boyun qaçırırdı. Nəhayət ayın 29-da saat 16 radələrində Əlini zorla işdən azad edir və 595 manat da haqq-hesab verirlər. Əlacı kəsilmiş Əli idarəni tərk edir, mağazadan iki baş pendir alıb işlədiyi qarajın sürücüsü Abo adlı erməninin idarə etdiyi maşınla Qoşabulağın altına kimi gəlməli olur. Azərbaycanlıları rayon mərkəzinə buraxmamaq üçün Qoşabulaq yolundan 500-600 metr Basarkeçərə tərəf olan yolun üstündə saqqallılar post qurmuşdular. Saqqallılar Abonun maşınını saxladıb, posta çatmamış düşürdüyü adamın kim olduğunu soruşdular.

Abo bildirdi ki, sürücüdür, işdən çıxarıb haqq-hesabını veriblər. Saqqallılar dərhal ”UAZ” markalı villis maşınına oturub kəndin iki kilometrliyində Əliyə çatır və onu tutub aparırlar. Postda olan 6

nəfər erməni Əlini ölümcül hala salır. Dəmirlə vurub ağzındakı qızıl dişlərini çıxarıb kağıza bükürlər. Cibində olan pulu və pendiri də götürürlər. Bundan sonra Əlini ölmüş bilən quduz vəhşilər onu gətirib Qoşabulağın yaxınlığında atıb gedirlər. Döyüləndən dörd saat sonra Əliyə azərbaycanlılar rast gəlir və onu kəndə gətirirlər.

Artıq bu zaman hər yerlə əlaqə kəsilmişdi. Telefonlar işləmir, işıq verilmirdi. Onsuz da şikayət ediləcək nə idarə var idi, nə də bir nəfər rəhbər işçi.



**Namazov M**

Nəhayət Əlini ağır vəziyyətdə Kəlbəcərdən keçirərək Xanlar rayonuna gətirib xəstəxanaya qoydular. Qohumları Moskvaya və Yerevana çoxlu şikayət teleqramları göndərdilər. 1989-cu ilin fevralında SSRİ Daxili İşlər orqanının işçiləri Əlini xəstə-xəstə Basarkeçərə apardılar.

Oradakı üzləşdirmə zamanı Əli saqqallılardan birini - Aşot Xaçatryanı tanıyır. Aşotun atası Basarkeçər aeroportunun rəisi, anası mərkəzi xəstəxananın həkimi, əmisi isə rayon istehlak idarəsinin sədri işləyirdi.

Bədənində salamat yeri olmayan Əlini sürüyə-sürüyə Xanlardan Basarkeçərə aparan Daxili İşlər orqanlarının işçiləri bəs nə etdilər? Dedilər ki, cinayətkar tutulacaq, cibindən çıxardıqları 570 manat pulunu və qızıl dişlərini də alacaqsan.

Əli soruşdu ki, bəs nə vaxt alacağam?

Arxayın ol, istintaqdan sonra biz göndərəcəyik, - dedilər.

Əli hiss etdi ki, onu buraya gözdən pərdə asmaq üçün gətiriblər.

Onu Xanlara qaytardılar. Bu mənəvi haqsızlıq Əlinin ölümünü daha da sürətləndirdi. Erməni qatillərinin əli ilə aldığı on yeddi bədən xəsarəti Əlini belə tez öldürməyə bəlkə də qadir deyildi, haqsızlıq üstündə köklənmiş qanunsuzluqlar olmasaydı...

Ermənilər Əlinimi öldürdülər təkcə? Yox, bu cinayət şaxələnib bir ailəni başsız qoydu. Səkinə xala oğlu Əlinin qırxı çıxmamış bu dərdə dözə bilməyib dünyasını dəyişdi.

Bu günahsız insanları qırğına verən, nahaq axan qanların baisi 3. Balayana isə "gözün üstə qaşın var" demədi Moskva.

# ZOD KOMBİNATININ İŞÇİLƏRİ DÖYÜLÜB ÇIXARILIR...

Göyçənin ən böyük və qədim kəndlərindən biri olmuşdur. Vaxtilə on minə yaxın əhalisi olan bu kəndin özünəməxsus qəhrəmanlıq salnaməsi vardır. Səxavətdə Hatəm ürəkli olan, qırx dəyirmanı xalqın dənini şahadsız üyüdən Səməd ağa, "Molla Nəsrəddin" jurnalının Göyçədə geniş yayıcılarından biri olan Şair Hacı, dörd xarici dil bilən Mirzə Bəylər, Aşıq Ağayar və digər nəhəng şəxsiyyətlər bu kəndin övladlarıdır.

Kəlbəcərlə örüş-örüşə olan Zod kəndinin mədənlərindən çıxarılan qızıl uzun illərdən bəridir ki, Ermənistanın cibinə axır. Əsl Azərbaycan torpağı olan Göyçənin özünə və qızıl mədənlərinə sahib olan ermənilər burada rəhbərlik edir, azərbaycanlıları isə fəhlə işlədirdilər.

Bir çoxları kimi Zərkənd sakini Nəriman Babayev də Zod qızıl kombinatında avtomobil sürücüsü işləyirdi.

1988-ci ilin fevral hadisələrindən sonra kombinatda işləyən digər azərbaycanlılar kimi Nəriman da amansızlıqla sıxışdırılır, ciddi təqiblərə məruz qalırdı.

Ancaq hara çıxsın, niyə çıxsın? Yer-yurd onun, Vətən onun, Suriyadan gəlmiş ermənilər isə külli-ixtiyar sahibi...

Aylarla didişmə getsə də nəhayət, Nərimana da işdən çıxmaq haqqında zorən ərizə yazdırdılar. Bu, noyabrın sonları idi... Bu zaman azərbaycanlıları Ermənistandan məcburi qaydada çıxarırdılar. Nəriman kombinatda olan üzülüşmə pulunu və əmək kitabçasını almaq üçün idarəyə gedir. İllərlə bir yerdə işlədiyi adamlar və saqqallılar Nərimanı möhkəm əzişdirirlər. Özünü quduzlaşmış erməni

dığalarının əlindən birtəhər qurtaran Nəriman Zərkəndə gəlib belə bir vəziyyətdə köçünü yükləyir. Ev əşyalarının çox az hissəsini aradan çıxara bilir.

Naftalana gələndən sonra onun vəziyyəti daha da ağırlaşır. Səhhətinin son dərəcə kəskin olduğu bir vaxtda Moskvaya və Yerevana çoxlu şikayət məktubları göndərir.

Aldığı ağır zərbələrin təsirindən daxili orqanları zədələnir və qansızması kəsmir. Bir qədər keçəndən sonra dəhşətli ağrı içində ürəyi dayanır. Beləliklə, Naftalan qəbristanlığında bir didərgin qəbri də artır. Bu qəbir daşının üstündə Nəriman Babayevin adı yazılır.

**Eləmi kənar daşı,**
**Bu dərdi kənar daşı.**
**Burda yatan qəribsə,**
**Bu qəbrin yanar daşı.**

# NƏ YAXŞI Kİ, YAXŞILAR VAR

Oktyabrın sonları, noyabrın əvvəllərində azərbaycanlıların Ermənistandan kütləvi çıxarılmasına bütün respublikada hazırlıq gedirdi. Bu hazırlıq ilk növbədə qətllərdən və talanlardan ibarət idi. Bununla da camaatı yorub əldən salmaq, qorxutmaq məqsədi güdülürdü.

Basarkeçər rayonunda da son vaxtlar azərbaycanlılar öldürülür, evlər dağıdılır, xüsusilə tanınmış adamlar hörmətdən salınırdı. Doğrudur, quldurlar kəndlərə soxula bilmirdilər, lakin yolda-izdə rast gəldikləri azərbaycanlıları ya öldürür, ya da ağır xəsarət yetirirdilər.

Şişqaya kəndinin sabiq sakini TƏRLAN ƏLİ QIZI İBRAHİMOVANIN yazdığı izahatdan sətirlər:

"Həyat yoldaşım uzun illər idi ki, müəllim işləyirdi: Bir sıra azərbaycanlılar kimi o da Böyük Vətən müharibəsində can qoymuş, qan axıtmışdı. Müharibə əlili idi. Hələ uğrunda vuruşduğu quruluşun və dövlətin qanunlarına elə inanırdı ki, onu inamından döndərmək mümkün deyildi.

Tariximizdə qara ləkələrlə gözə çarpan 1988-ci ilin noyabr günlərində vəziyyətimiz daha da ağırlaşmışdı. Ayın 10-da sovet milisi günü Əziz iş dalınca rayon mərkəzinə gedəcəyini söylədikdə biz etirazımızı bildirdik. Lakin Əziz inadından dönmədi.

Əziz Basarkeçərə çatanda böyük nümayişlə üz-üzə gəlir. Təsəvvür edin, bir nəfər türk, nümayiş keçirən minlərlə erməniyə rast gələ...

Aldığımız məlumata görə, nümayiş iştirakçıları döyülüb yerə sərilmiş Əzizin üstündən tapdalayıb keçmişdir. Ağır bədən xəsarəti almış bu günahsız türkü xəstəxanaya götürürlər. Bu dövrdə azərbaycanlıları xəstəxanaya götürməkdə məqsəd saxta diaqnoz-

la həqiqəti ört-basdır etməkdən ibarət idi.

Vəziyyət elə gərginləşmişdi ki, biz vaxtlı-vaxtında Əzizin yanına gedib-gələ bilmirdik. Ermənilərin təzyiqi gündən-günə artırdı. Bir neçə gün bundan sonra bütün azərbaycanlılar kimi, bizi də Göyçədən çıxardılar və imkan vermədilər ki, Əzizi xəstəxanadan götürək. Qarlı Göyçə dağları ilə ağzımızı Azərbaycana çevirdik. Dağlarda nə qədər qoca, qız-gəlin və uşaq tələf oldu.

Dərdimiz böyük idi. Qohum-qardaş hərə bir yana düşmüşdü. 1988-ci il dekabrın 26-da Kəlbəcər RDİŞ-in rəis müavini Zakir Abdullayev Bakıda bizi tapıb bildirdi ki, Əziz İbrahimovu dekabrın 2-də Kəlbəcər rayonundakı qəbristanlıqda dəfn etdik."

# BİR GÜN GƏLƏR...

Əvvəllər hər həyət-bacadan saz səsi, balaban, tütək avazı yüksələn Nərimanlı kəndi indi Göyçənin bütün kəndləri kimi qəmə qərq olmuşdu. Elə bil dünya dəyişib, dövran ötmüşdü. Yer-göy qan ağlayırdı. Bulaqlar da adamın gözündə bir qədər sönükləşmiş, dağlar-dərələr kiçilmişdi. Əsrlər boyu şirin ləhcəli göyçəlilərin səsinə, ününə qulaq asmış Çalmalı dağının qaş-qabağından qəm yağırdı. Sürülər mələşib, ilxılar kişnəməyən yerdə qartal zirvəyə qonmazmış demə.

Haqq tapdanır, qışqırır, haray salırdı. Lakin bu səsə, bu haraya baxan kim idi. Ermənistanda yaşayan bütün azərbaycanlılar kimi, Nərimanlı camaatı da təlatümə gəlmiş dəryadakı tənha qayığı andırırdı.

Nə isə, dünyanın ən bədbəxt məxluquna çevrilmiş bu adamlar sonralar da çox şey eşidib, çox şey götürdülər.

Artıq noyabrın sonu çatmışdı. Vəhşiləşmiş düşmən silahsız, dişi-dırnağı ilə didişən azərbaycanlılar öz qədim yurdlarını tərk etməliydilər. Qərar belə idi.

Ermənistanda türk qalmamalı idi. Azərbaycanda isə erməniləri son ana kimi qorumaq planlaşdırılmışdı.

Nərimanlı camaatı da tələm-tələsik köçünü çıxarmağa çalışırdı. O cümlədən 32 yaşlı Teymur da...

Teymur Yusif oğlu Cabbarov Azərbaycan Kənd Təsərrüfatı İnstitutunu bitirmişdi. Öz doğma kəndində zootexnik və kolxoz həmkarlar təşkilatının sədri işləyirdi. İstər kənd camaatı arasında, istərsə də kollektivdə yaxşı hörmətə və nüfuza malik idi.

Teymurun ev əşyalarını aparan yük maşını da ucu-bucağı

görünməyən köç karvanına (əgər belə demək mümkünsə) qoşuldu.

Karvan getdikcə Göyçə kiçilir, Göyçə dağları uzaqda qalırdı. Karvan gedir, ürək getmirdi, gözlərdən yaş axırdı. Hamının ürəyində bir tüstülü sual dolanırdı: "İlahi, bir də bu yerləri görəcəyikmi?!"

Teymuru da düşündürən, daha doğrusu içindən yandıran bu ağrı idi. Göyçənin uzununa 80 kilometr yol gələndən sonra, Hörükdaş deyilən yerdə artıq Göyçə ilə vidalaşmağa məcbur olan Teymurun gözündən qeyri-ixtiyari iki damla yaş axdı. Teymur bu göz yaşlarını körpə uşaqlarından gizləməyə çalışdı. Nə edəsən. Bu da dövrün, zəmanənin bir amansızlığı idi...

Teymurgilin maşını Köhnə Başkəndə çatanda ermənilər maşının qabağını kəsdilər. Teymuru çəkib maşından yerə salaraq ona işgəncə verməyə başladılar. Quldurların biri onu vurur, biri tapançanın lüləsini ağzına soxur, digəri tufangin lüləsini onun çənəsinin altına dirəyir. Teymurun körpə uşaqları qışqırıb-bağırır, fəryadları dağa-daşa səs salırdı. Qatillər isə öz amansız oyunlarında davam edirlər.

Bu vaxt təxminən 70 yaşlı, topal bir kişi gəlir və quldurlara hücum çəkir:

**-Nə istəyirsiniz, bu yazıqlardan?- deyir. Dədə-baba yurdlarından çıxartdınız-bu sizin işinizdir. Bəs niyə öldürürsünüz? Elə bilirsiniz bu haqq-hesab beləcə ötəcək. Balam, gəlib dolduq bunların içinə, bizə, nə pislik etdilər? İndi ilan olub boyunlarına dolaşmışıq. Buraxın, getsin... Bir gün biz bu azğınlığımıza cavab verəndə görərsiniz...**

Qoca erməni Teymuru quduzlaşmış başkəndlilərin əlindən alıb buraxdı. Amma aldığı bədən xəsarətləri öz işini görmüşdü.

Erməni quldurları bir ailənin də çırağını söndürdülər... Əslində

söndürə bilmədilər. Onun çırağını yandıracaq üç körpəsi - Zaur, Şəhriyar və Cəlalın yumruğu havada düyünlənmişdi.

Ömrün ayağında Teymur balalarının sifətindəki qəzəbi görüb içində bir ümid işığı tapdı. Son nəfəsdə yaradıcılığını ürəkdən sevdiyi şair Xəstə Bayraməlinin "Ağlama" başlıqlı şeirini deyib gözlərini əbədi yumdu.

*Sən mənim vəfalı könül həmdəmim,*
*Ürəyim od alıb yanar, ağlama.*
*Üzmə ümidini vüsal dəmindən,*
*Yenə adımızı anar, ağlama.*

*Vətənin başında nələr var, nələr,*
*Alıb üstümüzü qara kölgələr*
*Əzizim, darıxma, yenə yaz gələr,*
*Bülbül gül bağına qonar, ağlama.*

*Əl-aman olsam da ömrün iliynən,*
*Mən vidalaşmıram Göyçə eliynən,*
*Düşməni məhv edib haqqın əliynən,*
*Bayraməli geri dönər, ağlama.*

Bəli, bir gün gələr, ərən oğullar Vətən torpağına dönərlər.

# İRƏVANDA NƏ QALDI Kİ...

Belə bir mahnını kim eşitməyib? Bu mahnı hər bir Azərbaycan türkünün qəlbində həsrətlə qovuşub, intizara çevrilir, xalqın ulu tarixinə yön tutur.

Bu həsrətin səbəbi kimə aydın deyil... Vaxtilə bütöv bir müsəlman şəhəri kimi tanınmış İrəvan birdən-birə 2750 yaşlı Erebuniyə çevrildi. Dilsiz daşlar naxışlandı, yamaqlandı, erməni "qədimliyinə şahidlik" etdi. Amma bu şəhərin canlı yadigarları olan azərbaycanlılar elə danıldı, elə bil İrəvanda belə bir millət heç yaşamamışdır.

Azərbaycan memarlığının incilərindən sayılan, 1602-ci ildə I Şah Abbas (Səfəvi hökmdarı) tərəfindən tikilən Göy məscidin "yenidən bərpası" üçün ermənilərin İran hökuməti ilə müqavilə bağlaması və məscidi fars abidəsi kimi təqdim etməsi tariximizə yönəldilən erməni xəyanətinin daha bir iyrənc nümunəsidir.

1988-ci il hadisələri ilə bağlı İrəvanda dörd azərbaycanlı öldürülmüşdür:

**Kərimov Vaqif Kamil oğlu**
**Misgərova Elza Cəfər qızı**
**Misgərov Vidadi Cəfər oqlu**
**Muxtarova Solmaz Rəcəb qızı**

Başında bir çanaq qan gəzdirən erməni millətçiləri bu günahsız adamları da məhv etdilər.

Bir neçə kəlmə öldürülən irəvanlıların kimliyi haqqında:

Qardaş-bacı Elza və Vidadi Misgərovlar İrəvanda tanınmış misgərovlar ailəsində böyüyüb boya-başa çatmışdılar. Elza **"So-**

**vet Ermənistanı”** respublika qəzetində işləyirdi.

Ailə 1989-cu ilin sonlarına kimi doğma şəhərdən çıxmamışdı. Səbəb o idi ki, hələ dünyanın düzələcəyinə ümidlə baxır, quduz erməni millətçilərini düzgün bir yola çəkən qüvvə gözləyirdi Elza ilə Vidadi. 1990-cı ilin əvvəllərində misgərovlar ailəsi də digər bir neçə azərbaycanlı ailəsi ilə birlikdə (bunlar son azərbaycanlı ailələri idilər) İrəvandan çıxarıldılar. Bununla da bu qədim türk şəhərində bir nəfər də türk qalmadı.

Ev-eşik, var-dövlət hamısı yağı əlində qalmışdı. Vidadi ilə Elza köhnə qonşularla telefon əlaqəsi saxlayıb evi dəyişdirmək məqsədilə İrəvana yola düşdülər. Onlar bir daha geri qayıtmadılar.

Alınan məlumata görə, Elza ilə Vidadini aprel ayında Artaşat (Qəmərli) yaxınlığında qətlə yetirmişlər.

# SOLMAZIN AĞIR DƏRDİ

Solmazı yaman hala salmışdılar. Qadın da belə döyülərmi, İlahi?! Bəs insafsız qonşular bu namərdliyə necə dözürdülər? Demirdilərmi günahsız bir qadını şil-küt eləməklə nifrətdən başqa nə qazanırsınız? Bu hadisəni görən hər bir azərbaycanlı ona bənzər hadisə törətməyəcəkmi? Kişisənsə, ay erməni dığası, onda ağlaya-ağlaya dünyaya yayma ki, türklər görün nə edir!

Solmaz Muxtarovanın həyatına, hər gün rastlaşıb, üzəvari salam verib, hal-əhval tutduqları namərd qonşular xəyanət etmişdilər. Bu evə quldurlar onların əli ilə gətirilmiş və Solmazın döyülməsi təşkil edilmişdi.

Solmazı ağır vəziyyətdə Bakıya çatdırmışlar. Lakin xəstəxanaya yetirməyə macal tapmamış bu zavallı qadın gözlərini əbədi yummuşdur.

Şəcərə hesabı ilə Solmazın on altıncı babası İrəvanda dəfn olunub. Amma indi İrəvana sahiblik edənlərin hərəsi bir tərəfdən axışıb gəliblər.

Bizim üçün bundan sonra İrəvanda nə qaldı ki? İrəvanın xan dövrü dığalıq dövrü ilə əvəz oldu. Deyirlər məşhur **"İrəvanda xal qalmadı"** mahnısı əvvəllər belə oxunarmış:

***"İrəvanda xan qalmadı",***
***"Qırıldı, sultan qalmadı!"***

# YÜZLƏRLƏ MƏKTUBDAN BİR NEÇƏ SÖZ

*Son sözə keçməzdən əvvəl qarşımızda olan yüzlərlə məktubdan bir neçəsi diqqətimizi xüsusilə cəlb etdi. Bu məktubları da didərginlərimiz göndərib. Onlar xeyirxah insanlara minnətdarlıqlarını ifadə edirlər. Daha doğrusu, Azərbaycanda yaşayan qardaş-bacılarının onları o ağır günlərdə, ermənilərin kütləvi qırğına məruz qoyduğu vaxtda necə istiqanlıqla qarşıladıqlarını yazırlar. Dönə-dönə minnətdarlıq edirlər. Bu minnətdarlıq məktubları xüsusilə Qazax, Tovuz, Gədəbəy, Şəmkir, Naxçıvan və habelə Marneuli camaatına razılıq hissi ilə doludur.*

*Məktubların əksəriyyəti bu sözlərlə bitir:* **"Allah elimizi var eləsin!"**

# BU, DÜNYANIN SONU DEYİL

Haqqında ötəri söhbət açdığımız bu adamların qanı niyə axıdılırdı? Onlar kimə nə eləmişdilər? Kimin toyuğuna "kiş" eləyib, inəyinə daş atmışdılar? "Üçdə alacağı, beşdə verəcəyi" olmayan bu günahsızlar yandırılarkən, güllə ilə vurularkən, qarnı balıq qarnı kimi yarılarkən haqq harada idi? Harada yuxuya getmişdi? "Haqq, ədalət carçısı olan sovet hökumətinin humanist qanunları harada idi? Yoxsa bu qanunlar müsəlman azərbaycanlıların qanuni hüququnu müdafiə etməyə şamil edilmirdi? Biz yetmiş ildə, elə bilmişik ki, millətlər arasında fərq yoxdur. Sən demə, fərq varmış, özü də ölçüyəgəlməz dərəcədə.

Bu duyğu altında "özünü xoşbəxt" sayan azərbaycanlılar gözünü açanda nələr görmədi... Mərkəzin havadarlığı sayəsində erməni tufanı başladı. Bu tufanın dayaq nöqtəsi şər-şamata, böhtan və hiylə olmaqla fəaliyyət dairəsi "qan çanağına" çevrildi. Bu "qan çanağı" Azərbaycan qanı ilə dolmalı oldu.

***Bir çoxları bilmədi ki, Ermənistanda 172 bütöv azərbaycanlı kəndi, 89 qarışıq yaşayış məntəqəsi (cəmi 261 yaşayış məntəqəsi) qalmışdır. 211 min Azərbycan türkü min illərlə yaşadığı torpağı tərk etmiş, 450 mindən artıq qoyun, 50 minə qədər qaramal (bir o qədər də şəxsi heyvan olmuşdur) qoyub gəlmişdir.***

***200-dən artıq adam öldürülmüş, yaxud dağlarda həlak olmuşdur. 5 minə qədər didərgin erməni zülmünə dözə bilməyib vəfat etmişdir. 957 adam Ermənistanda və ya yollarda yara almış, bir çoxları ömürlük şikəst olmuşlar.***

***Lakin ürəyi həmişə ermənilərin yanında olan mərkəz bunların heç birini görmədi. Azərbaycanlılar silah altında öldürülüb, yaralanıb Ermənistandan qovulanda (boranlı dağlarda)***

***”həqiqət” ünvanlı “Pravda”, üstündə on beş respublika xalqının dili ilə ”Bütün ölkələrin proletarları, birləşin!” - çağırışını şüar eləyən “İzvestiya” qəzetləri və televiziyanın “Zaman” məlumat proqramı “cəfakeş ermənilərə” məhəbbət aşılayırdı.*** Arxalı və ərköyün ermənilər isə “dayılarının” bu himayədarlığından daha da quduzlaşaraq Azərbaycanın daxilində qarışıqlıq yaratmağa cidd-cəhd göstərməyə çalışırdı. Məgər ermənilər bilmirdimi Ermənistandakı azərbaycanlılar öz ata-baba yurdundan qovulublarsa Azərbaycanda ermənilər niyə yaşamalıdırlar?! Yuxarıların köməyi ilə erməniləri Azərbaycan torpağında saxlamaq, birincisi, təxribat məqsədi güdür, ikincisi də, qədim ermənilərin ”sağa-sola xaç daşını soxuşdurub” “Böyük Ermənistan” üçün zəmin hazırlayır. Yanvarın 13-14-də baş verən hadisələr məhz erməni hiyləsinin güclü bir variantı deyildimi?! Məgər yanvarın 20-də qanına qəltan olan azərbaycanlıların qabaqcadan başına gətiriləcək ssenari üçün məqsədyönlü hazırlıq deyildimi?

Qəribədir, Ermənistanda zəlzələdən zərərçəkənlərə kömək məqsədilə göndərilmiş ”İL-76” hava gəmisinin ”qəzaya uğraması” nə demək idi? Nə idi o igid oğlanların günahı? Kimə köməyə gedirdilər? Əsl söhbət burasındadır ki, kimə köməyə gedirdilər? Və onlar bu köməyə razılıq vermişdilərmi? Türk qanını su yerinə içən bir faşist millətə kömək göndərmək,yardım etmək rəzillik, yazıqlıq deyildimi? Bunu kim edirdi? Azərbaycana rəhbərlik edənlər etmirdimi? Yazıq bu millət tarixlər boyu biqeyrət rəhbərlik ucbatından başsız qalmamışmı?! Həmin təyyarədə 71 nəfər azərbaycanlı məhv oldu! Onlar kimin yolunda? Və kimin əli ilə məhv oldular? Suallar çoxdur. Cavab isə budur: ermənilər bir düşmən kimi təyyarəni vurub saldılar!

Son dövrlərin hadisələri göstərdi ki, “beynəlmiləlçilik

kəndirində" oynayan təkcə biz olmuşuq. Qalan millətlər öz dünyasında, öz işində olmuş və bu gün öz güclərini nümayiş etdirirlər.

"Ermənistan SSR-da millətçilik qana işlədiyi günlərdə biz onları qınayırdıq ki, onlar xalqı uçuruma aparırlar. Amma tarix bu gün sübut edir ki, dostu və düşməni tanımaq xalqın taleyində başlıca amillərdən biridir.

Ermənistan boyda torpağı azərbaycanlılardan almış, dəfələrlə qırğın törədib, qan axıtmış ermənilərə qarşı azərbaycanlılar nəyə görə hazır olmamalıdırlar?

Bizim sadəlövhlüyümüzü hiss edən ermənilər Sumqayıtda erməniləri qıran Qriqoryanı müdafiə edir, Əhməd Əhmədovun güllələnməsinə nail olmağa can atırdılar. Manucarovu və onun kimi digər "başında qan çanağı" gəzdirən erməni millətçilərini deputat seçir və Xəlil Rza kimi öz Vətənini müdafiəyə qalxmış Azərbaycan oğullarının həbsə alınmasını tələb edir və buna nail olurlar.

Bunları düşünərkən adam dəli olmaq dərəcəsinə gəlir. Haqq-ədalət varmı görəsən? Varsa əgər, belə də zülm olar? Sən demə, olarmış... Dünyanın heç bir yerində yox, yalnız Sovetlər İttifaqında, onun Azərbaycan adlı bir respublikasında... Sən demə, azərbaycanlıların əlini-qolunu tutub erməniyə döydürər, özünü də günahkar eləyərmişlər.

Dağlıq Qarabağ Muxtar Vilayətinin ərazisindən Kəlbəcərin Ağdaban kəndinə silahlı basqın etmiş ermənilər yaxalanıb, Kəlbəcər rayon DİŞ-də saxlanırdı. Bu vaxt hərbi vertolyot gəlib caniləri şöbədən çıxarmağa səy göstərir. Şöbənin əməkdaşları bu işə qol qoymadıqda vertolyot havaya qalxır. Və böyük fəlakət baş verir; 12 nəfər uşaq bir an içində biçilib qana boyanır. Bir gündən sonra isə canilər zirehli maşında Stepanakertə aparılırlar.

Deyək ki, bu məsələni hamımız bilirik. Bilirik ki, Tovuz rayo-

nunda tutulan Məclumyan və onun digər yoldaşları da bu yolla geri qaytarıldılar. Bəs niyə 1988-ci ildə Ermənistanda azərbaycanlıların başına od ələnərkən erməni basqınçılarına müqavimət göstərən azərbaycanlılar yerindəcə yaxalanır və akt tərtib edilib məhkəməyə verilirdi?

Həmin dövrdə Masis rayonunun Sarvanlar kəndinə erməni quldurları basqın edərkən kəndin sakinləri 4 nəfər canini tutub hərbi hissəyə təhvil vermişlər. General Puqanov silahlı ermənilər tutub təhvil verənlərdən dörd nəfərinə tərifnamə və döş nişanı verərək mükafatlandırmışdır. Sarvanlıların belə hərəkətinə ürəyində sonsuz nifrət bəsləyən milis işçilərini qəzəb boğurdu.

Təxminən bu hadisələrdən bir ilə yaxın vaxt keçdikdən sonra Masis rayonunun hüquq-mühafizə orqanının əməkdaşları ölçüb-biçiblər ki, Sarvanlar kəndindən olan bir neçə gəncin üstünə cinayət işi qaldırıb, Bakı şəhərindəki rayonların milis şöbələrindən onları tələb etsinlər.

İşdir, həmin gənclər Masisə qayıdarsa... Onu da deyək ki, Bakı şəhərinin rayonlarından birinin milis idarəsi ermənilərin tələbi ilə Əliyev Böyükağa Əli oğlunu tutub həbsə almışlar. Ermənistanda özünümüdafiə edənlərdən daha on nəfəri hələlik ələ keçməyib...

Ermənistandan azərbaycanlılar çıxarılanda, adamlar öldürüləndə bir-birimizi aldadırdıq ki, çoxu da şayiədir, inanmayın. Gələnlərə deyirdik ki, sizə heç kim heç nə eləməyib, yalan yerə qaçıb gəlibsiniz.

Ermənilər isə bizim bu sözümüzü əlində bayraq edərək, ”biz kimə neyləmişik”,-deyə dünyaya səs salıb, digər tərəfdən də qan axıtmaqdan usanmırdılar.

Vətən dərdi, yurd həsrəti heç bir ölçü vahidinə əsaslanmır. Vətən sevgisinin həddi-hüdudu yoxdur. Onu heç nə ilə müqayisə etmək olmaz. Bir çox qaçqınlarla söhbətdə yəqin etmişik ki, onlar itirdikləri

ev-eşik, əşya haqqında nə qədər düşünsələr də, iqtisadi çətinliklərlə üzləşsələr də əsas məsələ itən Vətən torpağının sağalmaz yarasıdır. İtən başdaşıları, dağıdılan qəbirlər, ruhların həsrət qaldığı ocaqlar dərdə çevrilib hər bir qaçqının sinəsində qövr etməkdədir. Başı yığnaqlı, saz-söz lisanlı bulaqlar, fil gövdəli dərələr, zirvəsi ağ örpəkli, qoyunlu-quzulu dağlar, nəhayət qanqallı, çınqıllı yollar, qarlı-boranlı qışlaqlar qaçqın həsrətinə dönüb, gecələr yuxusuna girər, göz yaşına çevrilər, yanağı ilə axıb yastığı isladar.

Bizə elə gəlir ki, xalqı öz ideallarından ayırmaq, təfəkkür tərzinin istiqamətini başqa səmtə yönəltmək, həqiqətdən yayındırmaq və ona yalan aşılamaqdan böyük cinayət yoxdur. Hər hansı ziyalı və ya vəzifə sahibi televiziya ekranı qarşısında əyləşib gözgörəsi yalan danışır və xalqı bu yalana inandırmağa çalışırsa onu dinləyənlərin əksəriyyəti həmin adama nifrət edir, yaltaq adlandırır.

Beləliklə, xalqın inamı alt-üst olur, xeyirxah çıxışlara da şübhə ilə yanaşır.

Ermənistandakı azərbaycanlılar on ay mərkəzdən və Bakıdan ümid işığı gözlədilər. Aldadıldılar, haqları tapdandı, heç kəs dediyi sözün üstündə durmadı. Qəzetdə, jurnalda, radio və televiziyada ”zəka qalib gələcək”-deyə döşünə döyənlər göstərdilər ki, zərrə qədər uzaqgörənliyi olmayan bu adamlar vəzifə xatirinə hər şeyi güdaza verməyə hazırdırlar.

Yuxarıda qeyd etdik ki, ermənilər həmişə Azərbaycan xalqına qarşı nifrətlə aşılanmış informasiyalar yaysa da azərbaycanlılar belə bir psixologiyaya malik deyillər. Buna görə də Ermənistandakı azərbaycanlılar Azərbaycana gələndən sonra müxtəlif söz-söhbətlər ortaya atılmağa başladı. Zəngin dünyagörüşə malik ziyalılarımız və xalqın müəyyən hissəsi dərhal hiss etdi ki, yenə ”erməni barmağı” fəaliyyətdədir. Bütün varlığı ilə qanımızı və iliyimizi zəhərləməyə

can atan ermənilər, eləcə də onların ittihamını dost sözü kimi qəbul edən bəzi üzdəniraqlarımız hər bir neqativ hadisəni qaçqınlarla bağlamağa cəhd göstərdilər.

Nəhayət, xalqın qeyrəti naminə qədim yurd yerlərimizdən güclə çıxarılmış və öz doğma xalqına pənah gətirmiş adamlara neçə-neçə adlar qoyuldu. Bu adların əksəriyyəti yuxarıdan gəlirdisə, ”Yeraz” (yəni Yerevan azərbaycanlıları) kimi təhqiredici ləqəb ermənilərin aramıza ustalıqla atdığı oyun idi və onu da yerlərdə, erməni dəyirmanına su tökən adı bizdən olan yayıcılar kütləviləşdirirdilər.

Zaman hər şeyi saf-çürük edib, süzgəcdən keçirir. Aylar ötdü, xalqımız gördü ki, Ermənistandan gələnlər öz qardaş-bacılarına pənah gətirmişlər. Və onların sevincinə ortaq, qəminə şərik olmağa hazırdırlar. Yanvar hadisələrində onlardan 33 nəfərin qanı öz qan qardaşlarının qanına qarışıb Bakının səki daşlarına çiləndi.

Gözümüzün önündə ağzını açmış böyük əjdaha bizi kamına çəkməyə hazırdır. Nə qədər ki, əl-ələ tutub əjdahaya tərəf gedirik, o geri çəkilməyə məcbur olur, nəfəsi ilə bizi sorub uda bilmir. Elə ki, əlimiz əldən üzüldü, təkləndik əjdaha hamımızı kamına çəkib məhv edəcəkdir. Biz bu həqiqəti duyuruqsa, bizə zaval yoxdur. Çünki biz həqiqətlərimizlə güclüyük. Ermənilər isə şərləri və böhtanları ilə, bir də arxaları hesabına güclüdürlər. Gec də olsa həqiqət qalib gələcəkdir. Ona görə də biz qan yaddaşımız olan torpaqlarımızın yüz il, beş yüz il və min il əvvəlki sərhədlərinin xəritəsini gözlərimizin giləsinə köçürməliyik. Özümüz o torpaqların sakini olduğumuz təqdirdə tarixə yamaq salan erməni tarixçilərini ifşa etməkdən çəkinməməliyik. Qonşuluq elədiyimiz yetər...

Tarixin özünəməxsus qanunları var. Hər kəs öz əməllərinə cavab verməli olacaq. Bu sözləri deməkdə məqsəd özümüzə toxtaqlıq, soyuqluq vermək, erməniləri yanımaq deyil. Əsl mətləb, əsl həqiqət

odur ki, ermənilər uzun illərdir ki, xalqımızın başına müsibətlər gətirir. Bəs bunlar bizim zəifliyimizdə, ermənilərin qoçaqlığındadırmı?

Əlbəttə, burada böyük həqiqət var. Ermənilərin ”qoçaqlığını” ideallaşdırmadan demək istərdik ki, tək özlərinə, öz hünərlərinə qalmış olsa onlar azərbaycanlılarla ”çox mehriban” yaşayardılar. Heç kim himayədarlıq eləməsə ermənilər belə örüş-örkən aça bilməzlər.

Azərbaycanlıların isə ermənilər tərəfindən bu dərəcədə sıxışdırılması heç də onların fağır və yazıqlığına dəlalət eləmir. Bu milləti həmişə onun “başbilənləri” susmağa vadar etmiş və bu da ermənilərin əl-qol açmasına geniş imkan vermişdir.

Azərbaycanla Ermənistan sərhəddində adamlarımız yandırılır, evlərimiz dağıdılır, güllə səsi ara vermir. Bir sözlə, cinayət davam edir...

Ey azərbaycanlı gənc, bəs sən nə etməlisən? Bu kitabda oxuduqların erməni qəddarlıqının mində biridir. Ona görə də bilməlisən ki, bu gün İrəvanda, bütün Azərbaycan torpaqlarında öldürülən azərbaycanlıların taleyinə biganə qalmaq, sənin sabahkı bədbəxtliyindir. Əgər millətinin dar günündə bu hissi keçirə bilmirsənsə, bu dərdi şəxsi dərd kimi yaşamağa qadir deyilsənsə, demək, sənin həmin xalqın adından danışmağa haqqın yoxdur.

Sən Vətənimiz Azərbaycanın hər qarış torpağını namusla qorumağa hazır olmalısan. San ayıq və sayıq olmaqla özünü həmişə müsəlləh əsgər hesab etməlisən. Əlin həmvətənlərinin əlindən üzülməməli və hər işdə xeyirxah olmalısan.

Hansı sənətin, hansı peşənin sahibi olursan ol, unutmamalısan ki, Azərbaycana xidmət edirsən. Əkdiyin əkin, buraxdığın məhsul, çəkdiyin yol, tikdiyin bina sənə verdiyi xeyirdən çox Vətənə verdiyi

xeyirlə ölçülməlidir.

Hər şeydən əvvəl, qan yaddaşımıza sadiq olmağı unutma. Unutqanlıq sonu görünməyən böyük bəladır. Həmişə yaddaşına üz tut, yaddaşına sirdaş ol. Yaddaşın dünənin deməkdir. Dünənini unutsan, bu gündən sabaha da heç nə apara bilməyəcəksən.

Şəxsi umu-küsülər millət arasına çıxmamalıdır. Ən böyük bəlamız olan yerliçiliyi unutmaq, quyulamaq və onu yaddaşlardan silmək lazımdır.

Unutma ki, biz çoxlu torpaqlar itirmişik. Erməni millətçiləri arxalarının köməyi ilə bizdən Ermənistan boyda bir torpaq qoparmışlar. İndi isə "Naxçıvan"- deyə ayağını yerə döyüb ərkəsöyünlük edir. Bizə heç kəsdən kömək yoxdur. Yalnız millətimizin sıx birliyi sayəsində bütün maneələri dəf etmək qabiliyyətinə malik ola bilərik. Ona görə də indiyə kimi verdiyimiz torpaqların bizim olduğunu unutmamalı və onu tələb etməlisən!

Yadında saxla ki, hələ digər yurdlarımızı demirik, yalnız Göyçə və Qaraqoyunlu başdan-başa azərbaycanlıların yaşayış məskəni kimi 1988-ci ilin dekabrınadək mövcud olmuşdur. Və bu ərazi Basarkeçərin Yuxarı Şorca kəndindən başlamış İcevan rayonunun Haqqıxlı kəndinə qədər olan 150 kilometrdən artıq ərazini birləşdirir. Ümumiyyətlə, Göyçə-Qaraqoyunlu adlı yurd yerimizdə təzəliklə 300 kvadrat kilometr torpaq qoyub çıxmışıq. ***Nə üçün ermənilər heç bir əsası olmadan Qarabağı istəyə bilərlər, biz isə minillər boyu yaşadığımız Dərəçiçəyimizi, Dağ Borçalımızı, Ağbabamızı, Qaraqoyunlumuzu, Dərələyəzimizi, Vedibasarımızı, Zəngibasarımızı, Zəngəzurumuzu, bütövlüklə Ermənistanı istəyə bilmərik?!***

Dön bu yazılara bir də bax! Bu kitabdan xoşbəxtlər kimi boylanan və bu gündən xəbəri olmayan körpələrin şəklinə, sinəsinə dağ

